**Azərbaycan Milli Elmlər Akademiyası**
**Nəsimi adına Dilçilik İnstitutu**

**İLHAM TAHİROV**

# AZƏRBAYCAN VƏ İNGİLİS DİLLƏRİNDƏ ZAMAN KATEQORİYASI

Bakı
«Nurlan»
2007

*Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu Elmi Şurasının qərarı ilə nəşr olunur.*

**Elmi məsləhətçi və redaktor:** **akad. Ağamusa AXUNDOV**

**Rəyçilər:**

**Məsud Mahmudov**
filologiya elmləri doktoru, professor

**Aydın Ələkbərov**
filologiya elmləri doktoru, professor

**Azər Mustafayev**
fəlsəfə elmləri doktoru, professor

**İlham Tahirov. Azərbaycan və ingilis dillərində zaman kateqoriyasi. Bakı, «Nurlan», - 324 səh.**

Monoqrafiyada dünyanın elmi mənzərəsinin əsas konseptlərindən biri olan zaman problemi işıqlandırılır, real, perseptual və konseptual zamanların nisbəti əsasında dil zamanı təhlil edilir, zaman funksional-semantik sahə kimi araşdırılır.

$\frac{4602000000}{N-098-2007}$ ***Qrifli nəşr***

## ÖN SÖZ

Azərbaycan dilçiliyində dilin hərtərəfli tədqiqi ilə bağlı bir çox problemlərin öyrənilməsində mühüm uğurlar əldə edilmişdir. Bununla belə, Azərbaycan dilinin ayrı-ayrı səviyyələrinə aid müxtəlif kateqoriyaları ilə əlaqədar olan bəzi problemlər hələ də tam öyrənilməmiş qalmaqdadır. Bunlardan biri də spesifikliyi ilə diqqəti cəlb edən zaman problemidir. Azərbaycan dilçiliyində zaman kateqoriyası gərəkli dərəcədə araşdırılmış, onun tədqiqinə ayrıca monoqrafiyalar[1], dissertasiyalar[2], dəyərli məqalələr[3] həsr edilmiş, dərsliklərdə[4] ondan bəhs edilmişdir. İndiyə qədər Azərbaycan dilçiliyində zamanla bağlı aparılmış həmin tədqiqat və araşdırmalarda zaman problemi-

---

[1] Axundov A.A. Felin zamanları, Bakı, 1961; Cahangirov F.F. Perfekt zamanlar, Bakı, 2000; Əsgərov M.B. Zaman formaları, adverbial fel formaları və onlar arasında funksional semantik əlaqələr.Bakı, Nurlan, 2002; Mirzəyev H. Azərbaycan dilində fel, Bakı, 1986; Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980.

[2] Cahangirov F.F. İngilis dilində perfekt zaman formaları və onların Azərbaycan dilində ifadə yolları, NDA, Bakı, 2000; Ахундов А.А. Категория времени глагола (на материале азерб. языка) АКД, Баку, 1958; Гаджиева Т.А. Система форм прошедшего времени глагола в современном азербайджанском языке . АКД, Баку, 1958; Мамедалиев В.М. Сравнительно- типологический анализ временных форм глагола в современном арабском и азербайджанском литературных языках, АКД, Тбилиси, 1968.

[3] Axundov A.A. Felin indiki zamanı // S.M.Kirov adına ADU-nun Elmi əsərləri. Bakı, 1958, № 2, s. 119-130; Axundov A.A. Felin keçmiş zamanı. Şühudi keçmiş // S.M.Kirov adına ADU-nun Elmi əsərləri. Bakı, 1958, № 4, s. 43-52; Рагимов М.Ш. К вопросу о формировании категории наклонения и ее отношение к категории времени в азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках, Баку, 1968, s. 117-130; Будагова З.И. К вопросу о категории времени глагола в современном азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках, Баку, 1968, с. 16-26.

[4] Qurbanov A. Müasir Azərbaycan ədəbi dili, Bakı, 1985; Hüseynzadə M. . Müasir Azərbaycan dili. Morfologiya. 3-cü hissə. Bakı, Maarif, 1983; Seyidov Y. Azərbaycan dili. Ali məktəblərin rus bölmələri üçün dərslik. Bakı, 1998.

nin ayrı-ayrı yönləri tədqiq edilib öyrənilmişdir. Müəyyən istisnaları[1] nəzərə almasaq, bu tədqiqatlarda zaman problemi əsasən felin zaman kateqoriyası ilə hüdudlanmışdır. Bəllidir ki, zaman kateqoriyası kəmiyyət, keyfiyyət, modallıq, inkarlıq və s. kateqoriyalar kimi daha genişdir və həm də ekstralinqvistik təbiətə malik kateqoriyalardandır. Bu baxımdan digər dilxarici kateqoriyalar kimi zaman da dildə inikas edir, müxtəlif vasitələr ilə ifadə edilir. Zaman dildə xüsusi bir semantik kateqoriya əmələ gətirir. Semantik kateqoriya olaraq zaman, haqqında bəhs olunan situasiya, hal, vəziyyət və onların elementlərinin danışanın nitq momentinə və ya hər hansı başqa hesablanma nöqtəsinə görə zamanının, vaxtının insan tərəfindən qavranılmasını və dərk edilməsini, anlanmasını əks etdirir. Bununla yanaşı, zaman həm də eyni «semantik kateqoriyaya əsaslanan funksional-semantik sahə olub, bu və ya digər dildə, həmin semantik kateqoriyanın çeşidli variantlarını ifadə etmək üçün istifadə edilən qrammatik (morfoloji və sintaktik), leksik, eləcə də ... leksik-qrammatik, qrammatik-kontekstual vasitələr qrupunu əhatə edir»[2].

Dilçilikdə zamanın və zaman münasibətlərinin ifadə edilməsi üçün dilin müxtəlif səviyyələrində semantik kateqoriya şəklində formalaşaraq, bir-birini müşayiət edən ifadə vasitələrinin mövcudluğu haqqında müxtəlif mülahizələr irəli sürülmüşdür. Həmin mülahizələrə əsasən, leksik səviyyədə zaman münasibətlərinin ifadəsi üçün leksik-semantik kateqoriya, morfoloji səviyyədə morfoloji-semantik kateqoriya, sintaktik

---

[1] Мамедова А.Ш. Понятие времени и его выражение в азербайджанском языке синтаксическими единицами, АКД, Баку, 1990; Мусаев М.М. Придаточные предложения времени и причастные и деепричастные обороты с временным значением в тюркских языках юго-западной группы, АКД, Баку, 1980.

[2] Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990, с. 5.

səviyyədə isə sintaktik-semantik kateqoriya mövcuddur. Bu kateqoriyalar zaman semantikasının daşıyıcısı olub, funksional-semantik fərqlərə də malikdir. Məsələn, dilin morfoloji səviyyəsində morfoloji-semantik kateqoriya təşkil edən felin zaman formalarının funksiyası gerçəklikdə cərəyan edən hadisələrin zamanı ilə nitq momentinin nisbətidirsə, leksik səviyyədə leksik-semantik kateqoriya əmələ gətirən temporal leksikanın daşıdığı funksiya kommunikasiya aktında təsvir olunan hadisələri zaman ardıcıllığına uyğun olaraq lokallaşdırmaqdır. Kommunikasiyada zaman münasibətlərinin qurulması prosesində kateqoriyalararası qarşılıqlı əlaqə baş verir. Zaman münasibətlərinin dilin müxtəlif səviyyələrində təzahürü başqa dillərin materialları əsasında gərəkli dərəcədə öyrənilmişdir və bu sahədə araşdırmalar davam etdirilir.

Azərbaycan dilçiliyində zaman kateqoriyası məhz bu baxımdan araşdırılıb öyrənilməmişdir. Dilçiliyimizdə nəzəri tədqiqatların istiqamətləri genişlənməkdə və inkişaf etməkdədir. Bu inkişaf tempi isə artıq zaman kateqoriyasının daha geniş planda araşdırılmasını zəruri edir.

Zamanın həm morfoloji, həm də morfologiya hüdudlarından kənara çıxaraq sintaktik, leksik və hətta mətn kateqoriyası kimi öyrənilməsi ilə bağlı olan məsələlər istər xarici, istərsə də ölkə tədqiqatçılarının diqqətini cəlb etmişdir. Zaman kimi fundamental fəlsəfi-məntiqi kateqoriyanın linqvistik yönümü onu təkcə dilin morfoloji səviyyəsi ilə məhdudlaşdırmır, eləcə də həmin hadisənin səviyyələrarası təqdimatı məsələlərini işıqlandırmaq zərurətini meydana çıxarır. Bununla əlaqədar olaraq, tədqiqat obyekti kimi götürdüyümüz mövzuya maraq ünsiyyət vasitəsi olan dilin ümumi inkişaf qanunauyğunluqları, təfəkkür və dil arasındakı dərin münasibətlər baxımından tamamilə təbiidir. Dil və təfəkkürün dialektik şəkildə bir-biri ilə bağlılığı şərtilə fikir bilavasitə gerçəkliyi əks etdirir. Bunu nəzərə alaraq dünya dilçiliyində dil və nitqi vəhdətdə

tədqiq etmək, onların bir-birinə qarşılıqlı surətdə təsir göstərməklə fəaliyyətdə olmasını dərk etmək, onların birgə fəaliyyətinin hansı ümumi müstəvidə mümkün olmasını arayıb-axtarmaq istiqamətində araşdırmalar həyata keçirilir. Artıq dil və nitqin birgə fəaliyyətini təkcə etiraf etməklə iş bitmir. Əsl məsələ həmin birgə fəaliyyətin modelini yaratmaqdadır. Düzdür, bu cür modelin yaradılması istiqamətində müəyyən işlər görülmüşdür. Bu işlərin nəzərdən keçirilməsi göstərir ki, funksional-qrammatik istiqamətdə aparılmaqla onlar dil sahələri nəzəriyyəsi mövqeyindədir. Dil sahələri nəzəriyyəsi dil və nitq faktlarını «məqsəd – vasitə» prinsipi üzrə təhlil etməyə, yəni müəyyən kommunikativ məqsədlərə yetişmək üçün hər hansı bir dilin hansı vasitələrə malik olduğunu, eləcə də həmin vasitələrin bir-birinə hansı münasibətdə olduğunu aydınlaşdırmağa imkan verir.

Yaxın və uzaq xaricdə sahə tədqiqatları üzrə əldə edilmiş geniş təcrübənin təhlili belə bir nəticəyə gəlməyə əsas verir ki, bu metodika müasir dilçilik elminin ən aparıcı istiqamətlərindən birinə çevrilmişdir. Sahə tədqiqatlarının müasir dilçilikdə geniş vüsət aldığı bir şəraitdə diqqətdən kənarda qalan müəyyən məsələlər də vardır. Məsələn, sahə modelinin funksional əsasda, xüsusilə kontensiv tipologiya istiqamətində həyata keçirilən dillərarası müqayisəli tədqiqatlara tətbiq edilməsi məsələləri az işlənmişdir.

Bütün bunlar Azərbaycan dilçiliyində universal zaman kateqoriyasının (ingilis və Azərbaycan dillərinin materialları üzrə) kontrastiv-tipoloji aspektdə öyrənilməsinin nə qədər aktual olduğunu nümayiş etdirir. Bu tədqiqatın aktuallığı bir də ondadır ki, o, müxtəlif dillərdə həm məzmun planında, həm də formal ifadə vasitələri aspektində dilçilikdə ən çox diskussiyalara səbəb olan temporallıq kimi mürəkkəb və ziddiyyətli kateqoriyanın təhlilinə yönəlmişdir. Zaman probleminə müxtəlif dillərdə çoxsaylı araşdırmalar həsr olunsa da, müxtə-

lif dillərdə geniş faktik materiallar toplansa da, ayrı-ayrı dillərdə bir çox xüsusi məsələlər aydınlaşdırılsa da, bu sahədə çox şey hələ də mübahisə predmeti olaraq qalmaqdadır.

Müasir tədqiqatlarda zaman kateqoriyasının ümumi və xüsusi məsələlərinin təhlilində yeni metod və formaların axtarışına da cəhdlər edilir. Zaman kateqoriyasının məntiqi, fiziki, fəlsəfi və xüsusilə linqvistik yönləri ilə əlaqəli olan həmhüdud məsələlərin öyrənilməsi və həmin məsələlərin həlli üçün edilən cəhdlər Azərbaycan dilçiliyində temporallığın bir sıra xüsusi məsələlərinin lazımi dərəcədə anlaşılmasını və bu zaman digər dillərin materialları üzrə aparılan müasir araşdırmaların nəticələrinin nəzərə alınmasını tələb edir. Ümumi dilçilik sahəsində aparılmış müqayisə-qarşılaşdırma səpkili tədqiqatların təcrübəsi göstərir ki, müxtəlif struktur-tipoloji xüsusiyyətlərə malik dillərin materialları üzrə aparılan kontrastiv tədqiqatlar qarşılaşdırılan dillərin hər biri üçün əhəmiyyət kəsb edən faydalı nəticələrə gətirib çıxarır. Dillərin müqayisə-qarşılaşdırma üsulu ilə tədqiqi bu və ya digər hadisənin daha təfərrüatlı öyrənilməsinə imkan verir, vahid müqayisə metodları əsasında təhlildə yeni nəticələrin əldə edilməsinə yol açır.

Müqayisə-qarşılaşdırma əsasında aparılan tədqiqat işlərində əsas diqqət həmin dillərdə nəzərdən keçirilən obyektlərin dəqiq müəyyənləşdirilməsinə yönəldilir. Belə obyektlər makro- və mikrosistemlər, səviyyə və yarımsəviyyələr ola bilər. Bu baxımdan tədqiqatımızın predmetini müxtəlifsistemli dillər olan Azərbaycan və ingilis dillərində dil zamanının, yəni temporallığın strukturu və semantikası, eləcə də söz, söz birləşməsi və cümlə səviyyəsində zaman münasibətlərinin ifadəsi təşkil edir. Belə bir tədqiqatın zəruriliyi aşağıdakı amillərlə şərtlənir:

- Azərbaycan dilçiliyində fiziki, məntiqi-fəlsəfi və dil zamanları arasında münasibət məsələsi kifayət qədər öyrənilməmişdir;

- Azərbaycan dilində temporallığın vahid məzmun planı sistemi işlənib hazırlanmamışdır;

- Azərbaycan dilində temporal münasibətlərin ifadə vasitələri sistemi üzə çıxarılmamışdır;

- Azərbaycan dilinin materialı üzrə, morfoloji temporallıq istisna olmaqla, leksik və sintaktik temporallığın bir çox məsələləri işıqlandırılmamışdır.

Tədqiqatın məqsədi Azərbaycan və ingilis dillərində temporallığın struktur, semantik və funksional xüsusiyyətlərinin kontrastiv planda kompleks şəkildə öyrənilməsindən ibarətdir. Bu məqsəd çərçivəsində aşağıdakı vəzifələrin yerinə yetirilməsi qarşıya qoyulmuşdur:

- Zamanın çoxaspektli təbiətini, dil zamanının fiziki, məntiqi və fəlsəfi əsaslarını təbiətşünaslıq və dilçilik elmlərinin son nailiyyətləri işığında nəzərdən keçirmək;

- Türk dillərinin hər birində tətbiq edilə bilən universal zaman münasibətləri sistemini qurmağa cəhd etmək;

- Temporal mənaların müxtəlif dil səviyyələrində ifadə vasitələrini kompleksli şəkildə üzə çıxarmaq;

- Qarşılaşdırılan dillərdə temporallıq sahəsinin üfüqi və şaquli strukturlarını modelləşdirmək;

- Temporal mənaların ifadəsi üçün istifadə olunan formaların hər iki dildə dominant və periferik səciyyələrini ayırd etmək;

- Temporallığın ifadə vasitələrinin işlənmə tezliyinin statistikasını vermək;

- Temporal mənaların müqayisəli-tipoloji və funksional uyğunluq dərəcələrini göstərmək.

Qarşıya qoyulan məsələlərin həllində gerçəklik, təfəkkür və dilin nisbəti, ətraf aləmin dərkində bu həlqələrin üçlüyünün vəhdəti barədə fəlsəfi müddəa əsas götürülür. Eyni zamanda burada ümumi, xüsusi və təkcənin ayrılmaz vəhdəti barədə ümumfəlsəfi prinsip əldə rəhbər tutulur.

Temporal münasibətlər iki müxtəlifsistemli dilin materialları üzrə müxtəlif dil səviyyələrində kompleksli şəkildə və sistemli yanaşma əsasında işıqlandırılmışdır. İlk dəfə olaraq Azərbaycan dilçiliyində temporallığın ifadə vasitələri funksional-semantik sahə müstəvisində tədqiq edilir. Tədqiqatda Azərbaycan dilinin müxtəlif səviyyələrində təzahür edən temporal anlayışların kompleks təsviri sahə metodikasına uyğun olaraq təqdim olunur. Temporal vasitələrin aşkarlanması, qrammatik mənaların formalaşmasında onların rolunun müəyyənləşdirilməsi, temporal münasibətlərin ifadə vasitələri ilə aspektual-temporal münasibətlərin ifadə vasitələrinin qarşılıqlı əlaqəsi kimi məsələlər istər Azərbaycan dilçiliyində, istərsə də bütövlükdə türkologiyada kifayət qədər araşdırılmamışdır. Bu monoqrafiyada Azərbaycan dilinin müxtəlif səviyyələrinə aid temporal ifadə vasitələrinə tətbiq olunan yanaşma üsulu müxtəlifsəviyyəli dil vahidlərinin qarşılıqlı əlaqələrinin qanunauyğunluqlarını araşdırmaq üçün geniş imkanlar açır.

Monoqrafiyada sahə nəzəriyyəsi işığında ikiplanlı obyektiv-subyektiv dil kateqoriyası kimi temporallığın şərhi inkişaf etdirilir ki, bu da fiziki, obyektiv zaman və perseptual zaman, qrammatik zaman, dil zamanı və linqvistik zaman kimi anlayışlara, onların qarşılıqlı əlaqəsi və bir-birinə uyğunluq dərəcələri məsələlərinə müraciət edilməsinə zəmin yaradır.

Monoqrafiyada temporallıq kateqoriyası semantik planda öyrənilir. Bununla yanaşı, o, hər iki dildə temporal münasibətlərin müxtəlif, yəni leksik, morfoloji və sintaktik ifadə vasitələrinin funksional qarşılıqlı əlaqəsinin semantik əsası olaraq xüsusi bir bütöv – funksional-semantik sahə kimi nəzərdən keçirilir.

Leksik səviyyədə qarşılaşdırılan dillərdə işlənmə tezliyi kifayət qədər yüksək olan və həmin dillərin leksikoqrafik mənbələrində qeydə alınan leksik vahidlər, yəni temporallığın leksik ifadə vasitələri olan temporal leksika araşdırılır. Morfo-

loji səviyyədə temporallığın ifadə vasitələrinin təhlili xəbər şəklinin formaları ilə məhdudlaşır. Sintaktik səviyyədə təhlil olunan vahidlər temporallığı reallaşdıran strukturlar kimi söz birləşmələri, tərkiblər və cümlələrdən ibarətdir. Tədqiqatda təhlilə cəlb edilən vahidlərin seçilmə dairəsi müstəqil şəkildə və ya digər vahidlərlə birləşərək temporal münasibətlər ifadə edə bilən vahidlərlə məhdudlaşır. Tədqiqat Azərbaycan və ingilis dillərinin materialları əsasında yerinə yetirilmişdir. Faktik dil materialı kimi təhlilə müasir Azərbaycan və ingilis bədii ədəbiyyatından və qəzetlərdən toplanan nümunələr cəlb olunmuşdur.

Qarşılaşdırılan dillərdə temporallıq sahəsinin strukturunu aşkarlamaq üçün təsviri, müqayisə-qarşılaşdırma, modelləşdirmə, funksional və komponentli təhlil, statistik metodlardan istifadə olunmuşdur.

Monoqrafiyada dünyanın elmi mənzərəsinin əsas konseptlərindən biri olan zaman problemi işıqlandırılır, real, perseptual və konseptual zamanların nisbəti əsasında dil zamanı təhlil edilir, bu təhlilin nəticələri iki müxtəlifsistemli dilin materiallarının müqayisəsi  əsasında əldə edilir. İşdə əsas diqqət perseptual zamanın dildə ifadə vasitələrinin strukturlaşdırılmasına yönəlmişdir. Tədqiqat Azərbaycan dilçiliyində temporal münasibətlərin ifadə vasitələrinin qarşılıqlı əlaqəsi problematikasının inkişafına müəyyən dərəcədə kömək edə bilər. Tədqiqat Azərbaycan dilinin funksional qrammatikasının hazırlanmasında, qrammatik və funksional-semantik kateqoriyaların təsvirində əhəmiyyətlidir və türk dillərində eyni səpkidə aparılacaq tədqiqatlar üçün də istiqamətverici ola bilər. Tədqiqatın nəticələrindən müasir Azərbaycan və ingilis dillərinin bu sahə ilə bağlı bir sıra digər məsələlərinin işlənməsində, türk dillərinin funksional qrammatikalarının hazırlanmasında, ali təhsil müəssisələrində müqayisəli və funksional qrammatika və leksikologiya kurslarının tədrisində istifadə oluna bilər.

Monoqrafiyada istifadə edilmiş faktik dil materialları Azərbaycan və ingilis dillərinin semantik lüğətlərinin hazırlanması işində də yararlı olar.

Monoqrafiya ön söz, beş fəsil, nəticə, istifadə edilmiş ədəbiyyat siyahısından və əlavələrdən ibarətdir.

Birinci fəsildə universal zaman kateqoriyasının çoxaspektli təbiəti, fiziki, məntiqi-fəlsəfi və dil zamanları arasında münasibət, xronoloji zaman parametri, zaman momenti, nitq momenti və ya danışıq vaxtı (anı) kimi ümumi nəzəri məsələlər işıqlandırılır.

İkinci fəsildə dil zamanının və ya temporallığın sahə strukturu şaquli və üfüqi istiqamətlər üzrə müəyyənləşdirilir, sahə konstituentlərinin daşıdığı semantik funksiyalar araşdırılır.

Üçüncü fəsildə hər iki dilin materialları üzrə leksik temporallıq sahəsinin struktur-semantik modeli qurulur, sahənin semantik strukturunda əsas sözlərin seçilmə meyarları müəyyənləşdirilir və temporal leksikanın felin zaman formaları ilə əlaqəsi baxımından semantik təsnifatı verilir.

Dördüncü fəsildə temporallıq sahəsinin nüvəsi sayılan morfoloji temporallıq sahəsi əsas və ikinci dərəcəli komponentlər üzrə qarşılaşdırılır, həmin komponentlərin işlənmə tezliyinin statistik göstəriciləri verilir.

Beşinci fəsildə sintaktik temporallıq sahəsi araşdırılır, temporallığı reallaşdıran sintaktik strukturlar üzə çıxarılır.

Monoqrafiyanın əlyazmasını oxuyub iradlarını və dəyərli tövsiyələrini vermiş prof. Əbülfəz Rəcəbliyə, prof. Aydın Ələkbərova və xüsusilə prof. Həbib Zərbəliyevə dərin minnətdarlığımı və təşəkkürümü bildirirəm.

# I FƏSİL

# ZAMAN KATEQORİYASININ ÜMUMİ NƏZƏRİ MƏSƏLƏLƏRİ

## 1.0. Zamanın çoxaspektli təbiəti

Zaman kateqoriyasının müxtəlif yönlərdən təhlili və araşdırılması elmdə daim diqqət mərkəzində olan əsas istiqamətlərdən biridir. Zaman problemi özünün çoxcəhətliliyi ilə daim tədqiqatçıların nəzərini cəlb etmişdir. Elmdə artıq ənənəyə çevrilmiş bu problem öz aktuallığını heç vaxt itirməmişdir. Bu, bir tərəfdən, zamanın məkan və hərəkət anlayışları ilə bərabər, idrak nəzəriyyəsinin də ən mühüm kateqoriyalarından biri olmasından, digər tərəfdən, zamanın öyrənilməsinin insanın gerçəklik haqqındakı ən əsas təsəvvürləri ilə, varlığın, həyatın mənasının, bütün insan fəaliyyətinin həm idraki, həm də praktiki cəhətdən araşdırılması ilə birbaşa bağlı olmasından irəli gəlir. Bu fakt zamanın özünün də müxtəlif aspektlərdən öyrənilməsinə marağı artırır.

Zamanın öyrənilməsində mühüm rol fizika elminə məxsusdur. Maddə və cisimlərin hərəkətinin ən ümumi xassə və qanunlarını öyrənən fizika elmi maddi aləmin zaman (eləcə də məkan) münasibətlərini geniş şəkildə açır, bu münasibətlərin qanunauyğunluqlarının ümumi xassələrini üzə çıxarır. Məhz fizikada vaxtilə əvvəlcə İsaak Nyutonun substansial, onun ardınca isə Albert Eynşteynin nisbilik nəzəriyyəsi ilə zaman anlayışları dürüst ifadə edilmişdir. Bu sonralar digər elmlərə, eləcə də zaman haqqındakı fəlsəfi təsəvvürlərə böyük təsir göstərmişdir.

Təbiət və cəmiyyət elmləri sahəsindəki tədqiqatlar zamanın və onun xassələrinin dərk edilməsində mühüm rol oynamışdır. Zaman kateqoriyasının öyrənilməsində fəlsəfəyə xüsu-

si pay düşür. Zaman kateqoriyasının tədqiqində fəlsəfənin mühüm əhəmiyyəti onunla şərtlənir ki, zaman ümumi xarakter daşıyır. Zaman problemi filosofların diqqətini daim cəlb etmiş və indi də cəlb etməkdədir. Nisbilik nəzəriyyəsinə qədər fəlsəfədə əsası Aristotel tərəfindən qoyulmuş, sonralar xüsusilə Leybnis tərəfindən inkişaf etdirilmiş nisbi zaman haqqında təlim mövcud idi[1]. Zaman problemi əvvəllər fəlsəfi mühakimələrin tədqiqat obyekti olmuş, lakin sonralar xüsusi elm sahələrinin meydana gəlməsi ilə təbiətşünasların diqqət mərkəzinə çevrilmişdir. Bununla belə, zaman indi də fəlsəfənin ən başlıca problemlərindən biri olaraq qalmaqdadır. Bu mənada zaman problemini universal xarakterli problem kimi qəbul etmək olar.

İnsan özünün praktik fəaliyyətinin bütün sahələrində zaman amili ilə üzləşir. Zaman kompleks, çoxaspektli təbiətə malikdir və materiyanın müxtəlif struktur səviyyələrində, idrakın və insan fəaliyyətinin müxtəlif sahələrində xüsusi məzmun və spesifika ilə təzahür edir. Canlılar arasında yalnız insana məxsus olan idrak fəaliyyəti imkan verir ki, o, ətraf aləmi, eləcə də özünü dərk etsin. Məhz idrak fəaliyyəti nəticəsində insan canlı və cansız aləmdəki cisim və obyektləri, onlar arasındakı əlaqə və münasibətləri araşdırır, onları qavrayır, dərk edir. Araşdırma üçün götürdükləri obyektin spesifikasından asılı olaraq, müxtəlif elm sahələrinin mütəxəssisləri xüsusi «zaman»ların mövcud olması ideyası üzərində israr edirlər. Məsələn, kimyaçılar  kimyəvi elementlərin əmələ gəlməsi və mənşəyi ilə bağlı «kimyəvi zaman»dan, bioloqlar canlının təkamülü, heyvan və bitki növlərinin mövcudluq müddəti, onların bir-birini ardıcıl əvəzləməsi, eləcə də yaş dəyişmələri ilə əlaqədar

---

[1] Аугустынек З. Лейбницево определение времени // ВФ, 1973, № 5, с. 109-121

«bioloji zaman»dan[1], fizioloqlar şərti reflekslərin öyrənilməsinə diqqət yetirməklə «fizioloji zaman»dan, geoloqlar müxtəlif süxur növlərinin və onların tərkib hissələrinin əmələ gəlməsi, geoloji proseslərin dəyişməsi qanunauyğunluqları ilə bağlı «geoloji zaman»dan[2] bəhs edirlər. Bədii yaradıcılıqla məşğul olanlar, estetiklər, incəsənət mütəxəssisləri «bədii zaman»ın, iqtisadçılar «iqtisadi zaman»ın, tarixçilər «tarixi zaman»ın mövcudluğunu iddia edirlər. Dilçilər isə dilə məxsus olan zamanın və ya «linqvistik zaman»ın mövcudluğunu şübhə doğurmayan fakt hesab edirlər. Hər bir konkret elm sahəsi öz obyektinin spesifik zamanını müəyyənləşdirməyə cəhd edir. Bununla yanaşı, ayrı-ayrı elm sahələrinin zaman problemi ilə bağlı əldə etdiyi nəticələrin ümumiləşdirilməsi məsələləri diqqət mərkəzinə keçirilir. Məhz bunun nəticəsi olaraq 50 il öncə, 1966-cı ildə Zamanın öyrənilməsi üzrə beynəlxalq cəmiyyət yaradılmışdır. Bu cəmiyyət fiziki, üzvi, intellektual və sosial aləmdə zaman ideyası və zamanın oynadığı rol ilə maraqlanan, müxtəlif sahələr üzrə alim və tədqiqatçıların peşəkar cəmiyyəti olaraq yaradılmışdır. 2000-ci ilə qədər dünyanın 33 ölkəsini təmsil edən 300-dən çox alim və tədqiqatçı bu cəmiyyətdə bir araya gələrək çoxaspektli zaman problemini araşdırmaqla məşğul olmuşlar. Cəmiyyətin üzvləri antropologiya, astronomiya, biologiya, geologiya, tarix, dilçilik, ədəbiyyat, incəsənət, riyaziyyat, tibb, musiqi, politologiya, hüquq, psixologiya, psixiatriya, ilahiyyat, fəlsəfə və iqtisadiyyat sahələri üzrə

---

[1] Ершов Ю. А. Биологическое время и его моделирование в квазихимическом пространстве // http://www.chronos.msu.ru/RREPORTS/ ; Михайловский Г.Е. Биологическое время, его организация, иерархия и представление с помощью комплексных величин // http://www.chronos.msu.ru/RREPORTS/

[2] Симаков К.В. Методологический аспект проблемы геологического времени // http://www.chronos.msu.ru/RREPORTS/; Лазарев С.С. Понятие "время" и геологическая летопись земной коры // http://www.chronos.msu.ru/RREPORTS/

görkəmli mütəxəssislər olmuşlar. Cəmiyyət zamanın bütün elm sahələri üzrə öyrənilməsində, araşdırılmasında və tədqiqatların nəticələrinin ümumiləşdirilməsində səylər göstərir. Bu təşkilat 1969-cu ildən etibarən ardıcıl şəkildə zaman probleminə həsr olunmuş beynəlxalq konfranslar keçirir, onların materiallarını nəşr edir. Bu cəmiyyət meydana gəldiyi dövrdən indiyə qədər zaman probleminin araşdırılmasına həsr etdiyi 10 cilddən ibarət seçilmiş əsərlərini nəşr etdirmişdir[1].

«Zamanın ayrı-ayrı formalarının və ya «modallıq»larının hər biri zamanın nisbi dərk edilməsinə, eləcə də hər bir xüsusi elm sahəsində təsbit edilmiş və dünyanın ayrı-ayrı elmi mənzərəsinin tərkib hissəsi olan xüsusi zaman konsepsiyasına əsaslanır»[2]. Məlumdur ki, gerçəkliyin ümumi zaman strukturu zamanın konkret-elmi təzahür formalarının dərin təhlili olmadan dərk edilə bilməz. Bütün bunlar onu göstərir ki, zaman fiziki reallığın təməl cəhətlərindən biridir. O, həyat prosesi ilə birbaşa bağlıdır. Gerçəkliyin digər heç elə bir mövcudatını tapmaq mümkün deyil ki, zaman qədər insanın ehtiyac və tələbləri ilə həm tarixən, həm də səbəbiyyətlə şərtlənən əlaqəsi olsun.

### 1.1. Obyektiv-real zaman, perseptual zaman, konseptual zaman

Zaman probleminə maraq hər şeydən öncə bu kateqoriyanın insanın dünyabaxışındakı mühüm rolu ilə bağlıdır. Tədqiqatçılar qeyd edirlər ki, məhz «zaman anlayışı vasitəsilə insanın şüurunda təbii və ictimai proseslərin istiqamətinin dərk edilməsi şəkillənir, indiyə, keçmişə və gələcəyə münasibət in-

---

1 The Study of Time I B 1972; II. Heidelberg, 1975; III. N.Y., 1978, etc.

2 Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, АДД, Краснодар, 1993, с. 20.

san varlığının mənasını müəyyənləşdirir»[1]. Məhz buna görə də uzun əsrlər boyu zaman insan varlığının subyektiv-obyektiv faktı olaraq, insan şüurunun fundamental kateqoriyası olaraq filosof, təbiətşünas, sənətşünas, kulturoloq, ədəbiyyatşünas və digər elm sahələri mütəxəssislərinin diqqət mərkəzində olmuşdur[2].

Zaman problemi ilə məşğul olan tədqiqatçıların əsərlərində nəzəri cəlb edən cəhət ondan ibarətdir ki, onlar ilk növbədə zaman kateqoriyasının fiziki-fəlsəfi aspektlərinə müraciət etməyi, həmin kateqoriyanın ekstralinqvistik və linqvistik reallığını müəyyənləşdirməyi gərəkli hesab edirlər. Zaman problemi nə qədər mürəkkəb, çoxaspektli olsa da, bu kateqoriyanın tədqiqində diqqəti üç cəhət daha çox cəlb edir. Həmin üç cəhət zamanın bütün subyektiv-obyektiv formalarının rəngarəngliyini əks etdirən ümumi modelində, insanın şüurunda zaman haqqındakı əsas anlayış və təsəvvürləri əks etdirən konseptual modeldə və zamanın dil modelində özünü göstərir. Ümumi model obyektiv real zamanı əks etdirir. Konseptual model obyektiv zamanın insan şüurunda inikasını, dil modeli isə obyektiv zamanın insanlar arasında ən mühüm ünsiyyət

---

[1] Тарасова Е.В. Языковое поле как единица дидактической типологии, Учебн. пособие. Киев, 1991, с. 42.

[2] Bu barədə daha ətraflı bax: Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969; Reichenbach H. The Direction of Time. Berkeley and Los Angeles,1956; Whitrow C.J. The Natural Philosophy of Time. London and Edinburgh, 1961; Тураева З.Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М., «Высшая школа», 1979; Ахундов М.Д. Пространство и время в физическом познании. М.: Мысль, 1982; Головаха Е.И., Кроник А.А. Понятие психологического времени // Категории материалистической диалектики в психологии. - М.: Наука, 1988, стр. 199-215; Урманцев Ю.А., Трусов Ю.П. О свойствах времени // Вопросы философии, 1961, 5, 58-70; Яковлев В.П. Социальное время. Ростов-на-Дону: Изд РГУ, 1980.; Хасанов И. А. Феномен времени. Часть 1. Объективное время - М.: 1998

vasitəsi olan dildə ifadə vasitələrinin toplusunu əks etdirir. Başqa cür ifadə etsək, bu üç model zamanın fiziki-fəlsəfi və linqvistik mahiyyətini təşkil edir. Onları ayrı-ayrılıqda nəzərdən keçirək.

Fəlsəfəyə dair ədəbiyyatda zamana belə tərif verilir: «zaman materiyanın varlıq forması və ya atributudur ki, bu da obyektlərin mövcudluğunun sürəkliliyini və vəziyyətlərinin dəyişməsi ardıcıllığını səciyyələndirir»[1]. Fəlsəfə Ensiklopedik Lüğətində zamana verilən tərif belədir: «Zaman materiyanın atributu və ya varlıq forması olub, ətraf aləmdə varlığın mövcudluğunun sürəkliliyini və bütün maddi sistem və proseslərin vəziyyətinin dəyişməsi ardıcıllığını ifadə edir»[2]. Hər iki tərifdə «obyeklər» və «maddi sistem və proseslər» ifadələri istisna olmaqla, eynilik göz qabağındadır. Qeyd edilən «obyeklər» və «maddi sistem və proseslər» ifadələri isə daha çox fiziki anlayışları səciyyələndirir. Bəs bunların fəlsəfəyə nə dəxli vardır? Məgər fəlsəfə zamana tərif verərkən öz anlayışlarından istifadə edə bilməzdimi? Bəlkə fəlsəfənin arsenalında belə anlayışlar yoxdur? Buna səbəb nədir? Fikrimizcə, bu, bir daha göstərir ki, zaman kateqoriyasının fiziki, fəlsəfi və linqvistik aspektlərinin olduğunu qeyd edən tədqiqatçılar[3] doğru mövqedədirlər. Zamanın fiziki və fəlsəfi aspektlərinin eyni «medalın iki tərəfi» kimi təqdim edən fikirlər elmi ədəbiyyatda özünə yer tutmaqdadır.

Beləliklə, fəlsəfə zamana onun fiziki parametrləri müstəvisində yanaşır.

Zamanın yuxarıda göstərilən hər iki tərifi üzərində təhlil apararkən aşkar edirik ki, zaman insan şüurundan asılı ol-

---

1 Marksizm-Leninizm Fəlsəfəsinin Əsasları. 1980, c.60

2 Философский Энциклопедический Словарь, 1983,c.94

3 Дешериева Т. И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам // ВЯ, 1975, №2, c.111.

mayaraq obyektiv şəkildə mövcuddur və maddi aləmin mühüm parametrlərindən birini təşkil edir. Zaman obyektiv şəkildə mövcud olmuş, mövcuddur və mövcud olacaqdır. Maddi aləmin özü də obyektiv şəkildə mövcuddur. Hələ düşünən insanın dünyada olmadığı dövrdə belə maddi aləm mövcud olmuş, məkan və zaman daxilində inkişaf etmişdir. Ona görə də zaman məkanla bərabər materiyanın mövcudluğunun obyektiv real formasıdır, hərəkət isə zamanın mahiyyətini təşkil edir. Ətraf aləmin bütün proses, hadisə və halları meydana gəlir, mövcud olur və yox olur, bu zaman momentləri ilə səciyyələnir. Bu isə o deməkdir ki, onlar hərəkətdədir. «Hər hansı hadisənin zaman daxilində olması maddi aləmin hərəkət prosesində olması deməkdir, varlığın müəyyən vəziyyətinə aid olması deməkdir ki, həmin vəziyyət də moment adlanır» [1].

İnsan ətraf aləmlə onun tərkib hissəsi kimi əlaqəlidir. İnsan da üzvi və qeyri-üzvi aləmin başqa obyektləri kimi bir obyektdir. Bununla belə, insan həm də subyekt kimi çıxış edir. İnsanın idrak fəaliyyəti dünyanın obyektiv qanunauyğunluqları ilə korrelyasiya təşkil edir, insanın şüurunda obyektiv aləm inikas edir, özü də bütün rəngarəngliyi ilə inikas edir və beləliklə, insanın şüurunda anlayış dünyası yaranır. İnsan maddi aləmin həm obyekti, həm də subyekti kimi çıxış edir. Bu səbəbdən zamana həm bütün maddi aləmin, o cümlədən insanın, həm də təfəkkürün mövcudluq forması kimi yanaşmaq olar. Təfəkkür gerçəkliyin inikası prosesində formalaşır və real dünyanın zaman münasibətləri ilə əlaqəli səciyyə qazanır, lakin təfəkkürdəki zaman səciyyələri real dünyanın zaman səciyyələri ilə eynilik təşkil etmir. Təfəkkürdəki zaman səciyyələri insanın dünyanı qavrama forması kimi qəbul edilir. «Heyvanlardan fərqli olaraq insanda xüsusi qazanılmış istedad var-

---

[1] Злотников Л.М. Хронометрия и ее место в системе наук // Солнечные часы и календарные системы народов СССР. Тематич. сб. науч.трудов. Л., АН СССР, 1985, с. 10-11.

dır ki, bu da zamanı, onun axınını, zaman münasibətlərini və əlaqələrini dərk etməkdən ibarətdir. ... Şüurun insan üçün yalnız indiki zamanda mövcud olmasına baxmayaraq, o (yəni insan), yer üzündə yeganə varlıqdır ki, keçmişi yaddaşında saxlayır və gələcək haqqında düşünür. Başqa cür olsaydı, heç bir şüurlu fəaliyyət onun üçün mümkün olmazdı»[1].

Obyektiv zaman haqqında danışarkən insanın özü də maddi aləmin başqa əşya və cisimləri kimi bir obyekt olaraq götürülür. Obyektiv zaman üçün taxta, daş, ev, dağ, ağac və s. əşya və maddələr nə deməkdirsə, insan da o anlama gəlir. Başqa obyektlər zaman daxilində meydana gəldiyi, mövcud olduğu və yox olduğu kimi, insan da onlar tək doğulur, yaşayır və yox olur. Həmin obyektlər kimi insan da hərəkətdə olur və inkişaf edir.

Obyektiv zamanı səciyyələndirən əlamət və xüsusiyyətləri aydınlaşdırmağa çalışaq. Obyektiv zamanı səciyyələndirən ilk və ən sadə xüsusiyyət onun nizamlayıcı funksiayasıdır. Zamansız dünya xaos halında olardı və burada nəyin «əvvəl», nəyin «sonra» olmasını müəyyənləşdirmək mümkün olmazdı. Nizamlayıcılıq onu göstərir ki, gerçəklikdəki hadisələrin hamısı «əvvəl» və ya «sonra» olmaqla bir-biri ilə bağlıdır.

Burada obyektiv zamanın digər bir təməl xüsusiyyəti də meydana çıxır. Zamanın dərk edilməsində dəyişməz yön onun *keçmiş, indiki* və *gələcək* kimi *hadisələrə* bölünməsi ilə bağlıdır. Bu bölgü hadisələrin ən ümumi bağlılığını əks etdirir. Hadisələrin bir-birinə keçidini obyektiv zamanın axını kimi dəyərləndirmək olar, yəni «zaman yalnız hadisə və proseslərin sürəkliliyini deyil, həm də inkişaf prosesində izlənən ardıcıl

---

[1] Шепин А.Г. Лексико-грамматическое поле времени в современном русском языке (Время в поэтической речи). Иркутск, 1974, с.8.

nizamını ifadə edir. Obyektiv zamanın sürəkliliyi və axıcılığı biri-birini şərtləndirir»[1].

Obyektiv zamanla məşğul olan nəzəriyyələrin heç birinin əsərlərində gerçəklikdəki hadisələrin keçmiş, indiki və gələcək kimi növlərə bölgüsünə rast gəlmək olmur. Ənənəvi olaraq belə hesab edilmişdir ki, nə keçmiş, nə də gələcək vardır. Keçmiş hadisələr artıq mövcud deyildir, gələcək hadisələr isə hələ mövcud deyildir. Təbiətdə yalnız indiki hadisələrin mövcudluğu vardır[2] .

Belə fikirlə qəti razılaşmaq olmaz. Fikrimizcə, keçmiş və gələcək hadisələrin mövcudluğu barədə danışarkən, onları indiki hadisələrlə eyniləşdirmək doğru olmazdı. Keçmiş və gələcək hadisələr də obyektiv gerçəklikdə mövcuddur, amma indiki hadisələri dərk etdiyimiz kimi mövcud deyildir. Məsələn, deyək ki, obyektiv zamanın 1000-ci ilində yazıya alınmış hansısa hadisə həmin tarix üçün «indiki», hal-hazırda isə «keçmiş»dir. Yaxud bu günümüzdə yazıya alınan hadisə 1000-ci il tarixindən nəzərdən keçirildikdə «gələcək», 2007-ci il tarixindən sonra hansısa gələcək zaman üçün «keçmiş» olacaqdır. Amma həmin tarixlərin hər birində o hadisəyə «indiki zaman» kimi yanaşılacaqdır.

Obyektiv zamanı səciyyələndirən xüsusiyyətlərdən biri də onun ümumiliyi, universallığıdır. Bu ümumilik zamanın axını ilə bağlıdır. Zamanın axını hadisələrin uzaq gələcəkdən yaxın gələcəyə, yaxın gələcəkdən indikiyə, indikidən yaxın keçmişə, yaxın keçmişdən uzaq keçmişə keçməsi kimi başa düşülməlidir. Bu keçid prosesində maksimal vəziyyət indiki hala uyğun gəlir. Keçmişə keçən obyekt indiki halında müəyyən izlər qoyur, amma bu izlər həmin obyektin özü deyil,

---

[1] Авелиани С.Ш. Очерки философии естествознания. Тбилиси, 1968, с. 24.

[2] Анисов А.М. Свойства времени // http://www.i-u.ru/biblio/archive/anisov %5 svoistva/

onun qalığıdır. Məhz bu qalıq izlər vasitəsilə obyektin keçmişi bərpa olunur. Lakin keçmişdən qalan həmin izlərlə bərpa edilmə obyektin tam özü olmur. Hadisə nə qədər uzaq keçmişə aiddirsə, onun izlərini bərpa etmək də o qədər çətin olur. İzlərin bərpası obyektin zamanın axınında tam şəkildə əridiyi halda mümkün olmur. Belə görünür ki, zamanın axını dönməzdir. Bu, obyektiv zamanın başqa bir xüsusiyyəti olan dönməzliyini nəzərə çatdırır. Dönməzlik obyektiv zamanın mühüm əlamətlərindən biri olub, təbiət və cəmiyyətin təcrübəsi ilə təsdiqlənir. Obyektiv zamanın dönməzliyini obyektiv gerçəklikdə səbəb-nəticə əlaqələrinin dönməzliyi şərtləndirir.

Obyektiv zamanın sadalanan bu əlamət və xüsusiyyətləri birmənalı olaraq zaman fenomenini digər hadisələrdən fərqləndirir. Bütün bu əlamətlər zamanı səciyyələndirmək üçün zəruri olsa da, kifayət deyildir. Məhz bu səbəbdən zaman problemi daim diqqət mərkəzində olmuşdur və indi də diqqət mərkəzində qalmaqda davam edir.

Dil insanların ən mühüm ünsiyyət vasitəsi olmaqla bərabər, həm də mücərrəd, ümumi təfəkkürün gerçəkləşməsinin zəruri şərtidir. Materiyanın mövcudluq forması kimi zaman insanın idrak prosesində anlayışlar şəklində inikas edir.

İnsanın obyektiv gerçəkliyə istiqamətlənmiş idrak prosesi təfəkkür kateqoriyaları şəklində gerçəkləşir. Təfəkkür kateqoriyalarına keyfiyyət, kəmiyyət və ölçü, məkan və zaman, mahiyyət və hadisə, məzmun və forma, səbəb və nəticə, zərurət və təsadüf, təkcə, xüsusi və ümumi, sistemlər və strukturlar və s. aiddir[1].

Nəzəri dilçilik ədəbiyyatında təfəkkür kateqoriyası olan zamanı «perseptual zaman» da adlandırırlar[2]. Bu termin X1X

---

[1] Панфилов В.З. Философские проблемы языкознания. М., 1977, с. 130.
[2] Жалейко Р.А. Перцептуальное время и его выражение в функционально-семантическом поле темпоральности (на материале англ. языка), Автореф. дисс. ... канд. филол. наук. М., 1980, стр. 2.

yüzilliyin sonlarında ingilis dilindəki *perception* sözündən götürülmüş, *hissi*, *qavrayış* mənasında işlənmişdir.

Perseptual zamanın xassələrinin öyrənilməsi yollarından biri dilin verdiyi məlumatların araşdırılması ola bilər, çünki insanların dərketmə və əməli fəaliyyətlərinin nəticələri dil vahidlərində və kateqoriyalarında əksini tapır. Obyektiv gerçəkliyin bu və ya başqa hadisəsi dildə özünün bu və ya digər şəkildə ifadəsini tapmalıdır. Obyektiv gerçəkliyin inikası olan obrazlar, ideyalar, anlayışlar, bir sözlə, hər şey dildə əksini tapır. «Bəşəri dildə elə bir xüsusi anlayış, elə bir şey yoxdur ki, təfəkkürdə olmasın, konkret dillərə bu anlayışların manifestasiya vasitələrinin özünəməxsus ifadə və fərqləndirmə formaları xasdır»[1].

Zaman indiyə qədər müxtəlif fəlsəfi təlim və doktrinalarda müxtəlif baxış bucağından nəzərdən keçirilmişdir. Ona münasibət də birmənalı olmamışdır. Məsələn, bir fəlsəfi təlimdə o, materiyanın mövcudluq forması kimi müəyyən edilir, digərində isə bəşəri kamillik forması kimi başa düşülür.

Real zaman obyektiv şəkildə mövcud olan xarici aləm sferasına aiddir. Perseptual zaman isə ideal sferaya aid olmaqla real mövcud olan gerçəkliyin insan şüurundakı inikasıdır. Perseptual zaman digər təfəkkür kateqoriyaları kimi tarixi kateqoriyadır.

Hər bir insanda, fərddə zaman «hissiyyatı» vardır. Bu hissiyyat duyğu, hiss, həyəcan, fikir və xatirələrin dəyişməsi ilə sıx əlaqəlidir. İnsanın duyğuları və obrazları bir-birini qarma-qarışıq, xaotik şəkildə əvəz etmir. Həmin əvəzetmə müəyyən ardıcıllıqla, nizamlı şəkildə baş verir. Ona görə də insan onların birini digərindən «əvvəl» və ya «sonra» duyur, hiss edir, yaxud qavrayır. Mütəxəssislər qeyd edirlər ki, bizim qavrayışlarımız iki planda – ekstensiv mövcudluq qaydasında və

[1] Уфимцева А. А. Типы словесных знаков. М., 1974, с.6.

intensiv ardıcıllıq qaydasında - nizamlanmış duyğular məcmusundan ibarətdir. İntensiv ardıcıllıq planı isə hissi zamanla bağlıdır. Hissi və ya perseptual zamanla insanın indiki, keçmiş və gələcək «hissləri» əlaqəlidir və bu, intensiv planda hadisələrin əlaqələndirilmə meyarı kimi xidmət edir[1].

Bəllidir ki, perseptual zaman, daha doğrusu, zaman hissiyyatı real obyektiv zamana heç də həmişə dəqiqliklə uyğun gəlmir. Saat ilə ölçdüyümüz obyektiv real zaman real obyekt və hadisələrin maddi aləmdəki vəziyyətlərinin əvəzlənmə ardıcıllığı ilə bağlıdır: sinir sisteminin və orqanizmin müəyyən hallarında obyektiv real zamanla hissi zaman arasında müəyyən fərqlər ortaya çıxır. Məsələn, hansısa hadisəni səbirsizliklə gözlədiyimiz və saata baxdığımız vaxt, bizə elə gəlir ki, saat ağır gedir; əslində belə vaxtda bizim hissi (perseptual) zamanımız sürətlənir. Əksinə, hansısa maraqlı, cəlbedici şeylə məşğul olduqda, tamamilə əks effekt alınır: bizə elə gəlir ki, vaxt çox tez keçir. Xatırlama, təsəvvür və ya yuxu prosesində hissi zaman özünü daha çox qəribə şəkildə təzahür etdirir. Əslində, insan öz həyatında bir neçə il və ya hətta on illər boyu baş vermiş xeyli hadisəni bir an müddətində xatırlaya bilir.

Lakin bütün bu xüsusiyyətlərə baxmayaraq, perseptual zaman və obyektiv real zaman əsasən bir-birinə uyğun gəlir. Başqa sözlə desək, insanın duyğularının bir-birini əvəz etməsi ardıcıllığı obyektiv gerçəklikdə baş verən real hadisələrin bir-birini əvəzləməsi ardıcıllığını əks etdirir. Praktik fəaliyyətdə yuxarıda qeyd edilən xüsusiyyətlər minimuma enir və beləliklə, real zaman münasibətlərinin insan tərəfindən inikası şübhə doğurmur.

Qeyd etdiklərimiz perseptual zamanın insanın daxili dünyası ilə sıx əlaqəli olduğunu bir daha göstərir. Həmin bu əlaqə

[1] Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969, с.6.

perseptual zamanın fəlsəfədə mütləqləşdirilməsinə, beləliklə də insanın daxili aləmindən asılı olmayan obyektiv real zamanın bəzi filosoflar tərəfindən inkar edilməsinə səbəb olmuşdur. Bu məsələ ilə bağlı B.Rasselə istinad edən A.M.Mostepanenko göstərir ki, belə bir baxışa artıq dürüst ifadə edilmiş şəkildə Avqustində rast gəlmək olar[1]. İ.Kant da real zamanın mövcudluğunu inkar edir, real zamanın, eləcə də məkanın yalnız «hissi düşüncə forması» olduğunu göstərir.

Lakin elmin əldə etdiyi nəticələr belə baxışların səhv olduğunu sübut etmişdir. Psixologiya və fiziologiya elmlərinin nəticələri inandırıcı şəkildə göstərir ki, perseptual zaman heç də ilkin olmayıb, real proseslərin baş verməsi ilə, nəticə etibarilə, obyektiv real zamanla əlaqəlidir. Perseptual zaman, şübhəsiz, obyektiv real zamanın inikasıdır, lakin bu inikasın mexanizmi hələlik kifayət qədər aydın deyildir: hissi zamanın gedişatının orqanizmdən kənarda baş verən dövri proseslərdən, yoxsa orqanizmin daxilindəki fiziki və ya fizioloji dövri proseslərdən asılı olduğu hələ də mübahisə predmetidir[2]. Buna baxmayaraq, mühüm olan fakt ondan ibarətdir ki, mübahisə predmeti olan hər iki müddəa perseptual zamanın real zamanın inikası olmasının etirafı ilə bağlıdır.

Perseptual zamanın formalaşması üç dərketmə mərhələsindən keçir: obyektiv gerçəklikdə bir-birini fasiləsiz əvəz edən hadisələrin insan tərəfindən hissi qavranması, obyektiv məkan və zamanda baş verən proseslərin insanın həmin məkan və zamandakı subyektiv mövqeyindən asılı olmadığının dərk edilməsi, zaman anlayışının mücərrəd kateqoriya kimi təşəkkülü.

Perseptual zaman hərəkət və dəyişmə anlayışları, obyektiv gerçəklikdəki hadisələrin ümumi məkan-zaman əlaqələri

---

[1] Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969, с. 12-13

[2] Уитроу Дж. Естественная философия времени, М., 1964, s.64-149

və insanın bu obyektiv reallıqda öz yerini dərk etməsi əsasında formalaşmışdır. Perseptual zaman təfəkkürün digər kateqoriyaları ilə, ilk növbədə, məkan, kəmiyyət və ölçü, hərəkət və dəyişmə kateqoriyaları ilə bağlıdır və onlarla qarşılıqlı əlaqədədir.

### 1.2. Zaman və temporallıq, linqvistik zaman, dil zamanı, qrammatik zaman, bədii zaman

Filosof və təbiətşünasların zaman probleminə olan marağının tarixi bir neçə minilliklə ölçülsə də, linqvistlərin bu problemlə maraqlanmalarının tarixi kifayət qədər qısadır. Zamanın linqvistik aspekti dedikdə adətən real zamanın müəyyən modellərinin dildə əks olunması başa düşülür. Gerçəkliyin zaman münasibətlərinin insanın şüuru ilə qavranması və onların dil vasitələri ilə tərtibatı xarakterini nəzərə almadan ümumi zaman anlayışını dərindən anlamaq mümkün deyildir. Dildə zaman elə kateqoriyalar sırasına aiddir ki, onların köməyilə insanın linqvistik və ekstralinqvistik fəaliyyətləri arasında münasibətlər təyin olunur. Zaman elə kateqoriyalar sırasına daxildir ki, onlar nəinki dil vasitəsi ilə təsvir edilir, həm də dilin özündə, lüğət tərkibində və qrammatik quruluşunda təzahür edir. Məlum olduğu kimi, zamanın fəlsəfi şərhində a) real varlığın mövcudluq forması kimi başa düşdüyümüz zaman ilə b) cəmiyyətin və şəxsiyyətin mənəvi həyatının sərbəst parametri kimi mədəniyyətdə, cəmiyyətdə və fərdi şüurda inikas edən zaman arasında fərqə istinad edilir. Sonuncu forma elmdə *perseptual zaman* kimi məlumdur. Perseptual zamanın xüsusiyyətləri barədə yuxarıda ayrıca bəhs edilmişdir. Burada dil zamanının təzahüründə perseptual zamanın rolunun nəzərə alınmasından danışılacaqdır. Perseptual zaman real gerçəkliyin qavranmasında iştirak edən koqnitiv struktur və proseslər arasında müstəsna rola malikdir. Onun köməyi ilə real aləm «pro-

yeksiya olunan aləm»ə transformasiya olunur və bununla da real zaman insanın şüuru üçün əlçatan olur. Perseptual zaman bu səbəbdən özündə daha çox subyektiv elementi ehtiva edir: duyğu, hiss, həyəcan, fikir və xatirələrimizin bir-birini əvəzetməsi ilə bağlı olan indini, keçmişi və gələcəyi hissetmə, yəni «zaman hissiyyatı»mız,  hər şeydən əvvəl, onunla əlaqəlidir. O da vurğulanmalıdır ki, dialektik-materialist inikas nəzəriyyəsinə görə, bizim duyğularımız obyektiv surətdə mövcud olan əşya və predmetlərin obrazları, kopiyalarıdır. Beləliklə, perseptual zaman öbyektiv şəkildə mövcud olan zamanın, real zamanın inikasıdır. Amma insanın perseptual zamanı zamanın real fiziki xassələri ilə sıx şəkildə bağlı olsa da, o, saat vasitəsilə ölçülən real zamanla heç də həmişə tam üst-üstə düşmür. Perseptual zaman fiziki zamandan məhz nisbi, «proyeksiya olunan» təbiətilə fərqlənir. Perseptual zaman bizim tədqiqatda obyektiv gerçəklik hadisələrinin ümumi zaman əlaqələrinin inikası olaraq nəzərdən keçirilir. Bununla yanaşı, perseptual zamana həm obyektiv zamanın xassələrini adekvat şəkildə əks etdirən, həm də onların şüurda subyektiv əksi olan anlayışlar sistemi kimi baxmaq olar.

Obyektiv zamanın dərk edilməsi mahiyyətcə dildən ayrılmazdır. Bu səbəbdən dillərin verdiyi materialların təhlili perseptual zamanın xassələrinin öyrənilməsinin ən mühüm üsullarındandır. Təbii dil perseptual zaman vasitəsilə şüurumuzda proyeksiyası alınan real aləm ilə əlaqələnir. Bunları nəzərə alaraq hesab etmək olar ki, dildə zamanın interpretasiyası (= dil zamanı) ontoloji cəhətdən şərtlənir. Ona görə də *biz dildəki zamana məhz perseptual zamanın inikası kimi yanaşırıq*. Dil zamanının özəlliyi ondadır ki, o, real və perseptual zamanın xüsusiyyətlərini dil formalarında təzahüretmə münasibətlərini nümayiş etdirir. Dil bütövlükdə, eləcə də dildəki zaman formaları (dildəki zaman formaları həm feli, həm də qeyri-feli zamanları əhatə edir) obyektiv gerçəkliyin dərk edilməsindən

yaranan və dil vahidlərinin semantikasında təsbit olunan mücərrəd məntiqi anlayış-terminlərdə strukturlaşmışdır. Bu səbəbdən zamanın fiziki modellərinin qurulmasının əsasında hadisələrin kəmiyyət səciyyəsi olduğu halda, zamanın linqvistik modellərinin qurulmasının əsasında zaman münasibətlərinin keyfiyyət xarakteristikası üstünlük təşkil edir[1]. Dil vasitələri ilə verilən zaman real zamanın perseptual zaman vasitəsilə inikasıdır, onun təşkili isə real aləmin qanunauyğunluqları ilə şərtlənir.

Dil zamanı öz formaları ilə ifadə edilən hərəkətin real icra edilmə zamanının nitq momentinə görə nisbətini ifadə edir. Bu anlamda dil zamanı obyektiv zamanın ifadəsi ilə bağlıdır. Amma zaman formalarının semantikası hadisələri obyektiv zamanla əlaqələndirməklə bitmir, eyni zamanda onların məntiqi-linqvistik dərkini də ehtiva edir. Dil vasitələri ilə ifadə olunan zaman münasibətləri ünsiyyət prosesinin iştirakçılarından asılı olmayaraq obyektiv şəkildə mövcuddur, bununla belə, o, bilavasitə ünsiyyət situasiyası və ünsiyyət iştirakçıları ilə əlaqəlidir. Ona görə də dil zamanının ən vacib xüsusiyyətlərindən biri onun situasiya ilə bağlılığıdır. Həqiqətən də, ünsiyyət prosesinin zaman deyksisi labüdən eqosentrikdir, çünki həmişə subyektin özü tərəfindən «indi», «hazırda», «bu saat» deyilməklə təyin edilir, yəni temporal deyksisdə hesablanma nöqtəsi olaraq subyektin təmsil etdiyi MƏN çıxış edir. Digər tərəfdən, dil zamanı formalarından istifadə edilməsi obyektiv olaraq şərtlənir və danışan müvafiq vahidi seçməklə «obyektiv reallığın məcburiyyəti üzrə» hərəkət edir[2]. Danışan üçün nitq momenti kimi çıxış edən hesablanma nöqtəsi burada nitq aktının real zamanı kimi başa düşülmür, «həmin zamanı əks edən qram-

---

[1] Мурьянов М.Ф. Время (понятие и слово) // ВЯ, 1978, № 2, с.52.

[2] Слюсарева Н.А. Проблемы функциональной морфологии современного английского языка. М., Наука, 1986, с. 103.

matik idealizə etmə», «kommunikativ modelin elementi»[1] kimi anlaşılır. Real zamanın qavranmasında və dərk edilməsində nitq momenti subyektin şüurunda daim mövcud olur və «indiki», «keçmiş» və «gələcək» zaman sferalarının fərqləndirilməsi meyarı kimi çıxış edir (Bu barədə ətraflı məlumat üçün bu fəslin 1.3. bölməsinə bax). Dil formalarının semantikasında fiziki zamanın yalnız maddi xüsusiyyətləri deyil, həm də insanın real zamana münasibəti əks olunur. Buna görə də dil zamanı zamanın inikas olunmuş forması kimi çıxış edir. Əks olunmuş zaman olduğu üçün o, təsvir olunan hadisələrin real zaman səciyyəsindən müəyyən qədər nisbi sərbəstlik qazana bilir.

Zaman anlayışının dildə ifadəsi ilə bağlı olaraq dilçilik ədəbiyyatında «dil zamanı» (языковое время), «linqvistik zaman» (лингвистическое время, linguistic time), «temporallıq» (temporality, темпоральность), «qrammatik zaman» (грамматическое время), bədii zaman (художественное время), «nitq zamanı» (речевое время), «nitq momenti», «danışıq anı», «qrammatik nitq momenti» və s. terminlərə rast gəlmək olar. Lazımi anlayışları ifadə etmək üçün həmin terminlərin işlədilməsində qarışıqlıq olduğu aydın görünür. Bir neçə terminin eyni mənada işlənməsi və ya bir terminin bir neçə anlayışı ifadə etməsi halları da müşahidə edilir.

Burada Azərbaycan, rus və ingilis dillərində nəşr olunmuş dilçilik ədəbiyyatında dildə zaman anlayışı üçün istifadə edilən terminlərdən bəhs etməyi, onlardan bəzilərinin ehtiva etdiyi məna tutumunu nəzərdən keçirməyi lazım bilirik.

Zaman kateqoriyasının fiziki, fəlsəfi və linqvistik mahiyyətinə həsr etdiyi məqaləsində T.Deşeriyeva «zaman kateqoriyasının linqvistik aspekti» («лингвистический аспект кате-

---

[1] Веденькова М. С. Употребление временных форм глагола по коммуникативным регистрам (На мат. немецкого языка). Киев, 1981, с. 47-48.

гории времени»), «linqvistik zaman» («лингвистическое время»), «dil zamanı formaları» («языковые временные формы») terminlərindən istifadə edir[1]. «Лингвистический аспект категории времени» və «лингвистическое время» terminlərini sinonim kimi işlədir. Müəllif yazır: «Zaman kateqoriyasının linqvistik aspekti və ya linqvistik zaman dedikdə biz həmin kateqoriyanın fiziki və fəlsəfi aspektlərinin mahiyyətinin dil vasitələri ilə ifadə üsullarının bütün məcmusunu nəzərdə tuturuq»[2]. Bu mülahizədə mühüm olan məqam «linqvistik zaman»ın «dil vasitələri ilə ifadə üsullarının bütün məcmusu» şəklində müəyyənləşdirilməsidir. Müəllif «языковые временные формы» dedikdə zaman münasibətinin dildə müxtəlif ifadə üsullarını (morfoloji, sintaktik, leksik, kontekstual) nəzərdə tutur[3] .

T.Deşeriyeva zaman kateqoriyasının fiziki, fəlsəfi və linqvistik aspektlərinin olduğunu qeyd edir. Müəllif onlardan ilk ikisini vahid bir bütövün iki tərəfi kimi qəbul edir, üçüncüsünün, yəni linqvistik aspektin fiziki və fəlsəfi aspektlərə tabe olduğunu göstərir. Tədqiqatçının bu fikirlərinin əslində ona qədər deyilmiş olan ideyalara əsaslandığını görmək çətin deyildir. Onlardan bir neçəsini xatırladaq. İnsanın şüurundan asılı olmayaraq gerçəklikdə real şəkildə mövcud olan materiya və zaman münasibətlərini özündə ehtiva edən zamanın fiziki kateqoriya kimi mövcudluğu şübhə edilməyən bir faktdır[4]. Fəlsə-

---

[1] Дешериева Т.И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам //ВЯ, 1975, №2, с.111-117.

[2] Дешериева Т.И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам //ВЯ, 1975, №2, с. 111.

[3] Yenə orada, s. 112.

[4] Аскин Я.Ф. Проблема времени. Ее философское истолкование, М., Мысль, 1966; Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969; Мостепаненко А.М.,

fi zaman kateqoriyasının varlığı isə zamanla bağlı prinsipial şəkildə fərqlənən fəlsəfi baxışların mövcudluğu ilə isbat edilir. Həm xüsusi nisbilik nəzəriyyəsi, həm də ümumi nisbilik nəzəriyyəsi ilə zamanın fiziki və fəlsəfi yönlərinin mövcud olması və vəhdət təşkil etməsi sübut olunur[1]. T. Deşeriyevanın «zaman kateqoriyasının linqvistik aspekti fiziki və fəlsəfi aspektlərə tabedir»[2] mülahizəsi ilə razılaşmaq çətindir. Məsələn, onun fikrincə, təfəkkürdə inikas və dildə ifadə olunmaqla zaman kateqoriyası sözlərdə, cümlələrdə, mətnlərdə, belə demək mümkünsə, «maddiləşir». Dilin köməyi ilə zaman kateqoriyasının həm fiziki, həm də fəlsəfi yönlərinin məzmunu təsvir və ifadə olunur. Burada hər hansı tabelilikdən söhbət gedə bilməz. Fikrimizcə, bu məqamda zaman kateqoriyasının linqvistik aspektinin onun fiziki və fəlsəfi yönlərinə tabeliliyindən yox, hər üç aspektin qarşılıqlı münasibət və əlaqəsindən danışmaq daha məqsədəuyğundur.

Dilçilik ədəbiyyatında «linqvistik zaman» anlayış-termininin tamamilə başqa mənada işləndiyi də müşahidə edilir. «Linqvistik zaman» anlayışına xüsusi məqalə həsr etmiş M. Makovski onu dildəki dəyişmələrin tarixi inkişaf prosesi ilə bağlayır. Hər bir dilçilik tədqiqatında müəllifin konsepsiyasından, tədqiqatın məqsəd və nəticələrindən asılı olmayaraq iki parametrin dəyişməz şəkildə çıxış etdiyini göstərən M. Makovski bunu sinxron və diaxron planda dil sisteminin xassələri ilə əlaqələndirir[3]. Dilçi müqayisəli-tarixi təhlil zamanı dil ha-

---

Мостепаненко М.В. Четырехмерность пространства и времени, М., Наука, 1966

[1] Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969, с. 21.

[2] Дешериева Т.И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам // ВЯ, 1975, №2, с. 111.

[3] Маковский М. М. Понятие лингвистического времени // Иностранные языки в школе, 1976, № 6, с. 3.

disələrinin nisbi xronologiyasını müəyyənləşdirərkən, müxtəlif dövrlərə məxsus dil abidələrini, relikt və innovasiyaları, alınma və əsl dil realiyalarını tədqiq edərkən dil sistemi elementlərinə təsir göstərən zaman amilinə, yəni linqvistik zamana müraciət etmədən keçinə bilmir[1]. Lakin M. Makovski linqvistik zamana müraciət edərkən iki cəhəti fərqləndirməyi tövsiyə edir:1) *dilin dəyişməsi və mövcudluğunun hərəkətverici qüvvələrindən biri* kimi linqvistik zamanın öyrənilməsi və 2) *dildə zamanın ifadəsinin* (məsələn, qrammatik formalar, leksik mənalar, söz birləşmələrinin köməyilə) tədqiq edilməsi (ayırma mənimdir—T.İ). Göstərilən məqaləsində M. Makovski leksik attraksiya nəzəriyyəsi işığında dil strukturlarının və linqvistik zamanın sistem münasibətlərinin bəzi aspektlərini nəzərdən keçirdikdən sonra «linqvistik zamana» belə bir tərif verir: «Linqvistik zaman dil strukturlarının təbii yüksələn xətlə inkişafının mövcudluq forması olub, öz-özünə dildəki dəyişmələrin bilavasitə səbəbi ola bilmir, dil kontiniumlarında onların struktur xüsusiyyətlərindən və onlara təsir göstərən dildaxili, dilxarici və sosial amillərdən asılı olaraq, həmin prosesləri sürətləndirməklə və ya ləngitməklə, yaxud onlar tərəfindən neytrallaşdırılmaqla, qeyri-bərabər şəkildə təzahür edir»[2]. Göründüyü kimi, müəllif linqvistik zamana dil vahidlərinin diaxron planda öyrənilməsi baxımından yanaşır.

E.Tarasova «dil zamanı»nı («языковое время») «linqvistik zaman»la qarışdırmamağı məsləhət görür[3]. Tədqiqatçının fikrincə, «dil zamanı»nı müxtəlif səviyyəli dil vasitələrinin, dərk edən subyektdən asılı olmayaraq dildə mövcud olan müxtəlif dil vahidlərinin və strukturlarının sistemi kimi başa

---

[1] Маковский М. М. Понятие лингвистического времени // Иностранные языки в школе, 1976, № 6., с. 3.

[2] Yenə orada, s. 3.

[3] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, АДД, Краснодар, 1993.

düşmək lazımdır. «Linqvistik zaman»ı isə tədqiqatçı dilin metadil funksiyasını əks etdirən «ikinci dərəcəli» anlayış kimi izah edir: linqvistik zaman «özü özünü «dərk edən», təsvir edən dildir, linqvistik zaman dil zamanının xarakteri haqqında elmi təsəvvürləri ifadə edir və ona (dil zamanına) müxtəlif yanaşma və interpretasiyalara imkan verən baxışlar sistemidir»[1]. Başqa sözlə desək, tədqiqatçı dil zamanını və linqvistik zamanı bir-birindən ontoloji və qneseoloji anlayışlar kimi fərqləndirir.

Y.Karaulov dil zamanı («языковое время») dedikdə, dildə tarixi (diaxronik, dil) və aktual (sintaqmatik, nitq) zaman kimi fərqləndirilən iki növ zamanı nəzərdə tutur. Tədqiqatçı zaman anlayışına dilin iki aspektinin – sintaqmatika və paradiqmatikanın fərqləndirilməsi nöqteyi-nəzərindən yanaşır. «Sintaqmatikada dil bölgüləri *in absentia*, yəni öncəgəlmə münasibəti ilə, paradiqmatikada isə *in presentia* münasibəti ilə əlaqəlidir. Sintaqmatik aspekt paradiqmatik aspektdən zamanın olması, onun nəzərə alınması ilə fərqlənir»[2]. Göründüyü kimi, Y.Karaulov «dil zamanı» («языковое время») dedikdə, dil vahidlərini tarixi inkişaf prosesində götürməyi, onları dia - xron planda öyrənməyi nəzərdə tutur. Bununla kifayətlənməyən müəllif «dil zamanı» terminınə qarşı «nitq zamanı» («речевое время») terminini qoyur. «Nitq zamanı» termininin ehtiva etdiyi məna isə nitq vahidlərinin sinxron planda öyrənilməsidir.

Qərbi Avropa dillərinə həsr olunmuş bir çox tədqiqat əsərlərində «linqvistik zaman» anlayışı bəzən «qrammatik zaman» məfhumu ilə eyniləşdirilir. «Linqvistik zaman» termini

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, АДД, Краснодар, 1993, с. 18.

[2] Караулов Ю.Н. Языковое время и языковое пространство (о понятии хроноглоссы) //Вестник Московского Университета, 1970, № 1, с. 61-62.

altında felin tərz-zaman sistemi çərçivəsində zaman münasibətlərinin ifadə edilməsi başa düşülür[1].

«Qrammatik zaman» termininin məna yükünü, fikrimizcə, ənənəvi nöqteyi-nəzər təşkil edir. Bu terminlə obyektiv real zamanın dildəki ifadəsi nəzərdə tutulur, obyektiv real zaman və qrammatik zaman qarşılaşdırılır. Bu da onunla izah edilməlidir ki, «qrammatika» termini əvvəllər bu və ya digər dilin qrammatik quruluşunu, yəni sözlərin dəyişmə və birləşməsinin qanunauyğun şəkildə mövcud olmasını və fəaliyyət göstərməsini ifadə etmişdir. «Bu mənada qrammatika tamamilə obyektiv səciyyə daşıyır, yəni o, dilin özünəməxsus mexanizmini əks etdirir»[2]. Digər tərəfdən, dilçiliyə dair qədim nəzəriyyələrdən yaxşı məlumdur ki, yunan dilinin qrammatikasının müəllifi olan Frakiyalı Dionisiyə görə, «qrammatika» dil haqqında biliklərin məcmusu, yəni, ümumiyyətlə, dil haqqında elm demək idi[3]. Başqa sözlə desək, *qrammatika* müasir anlamdakı *linqvistika* anlayışının sinonimi olaraq işlənirdi. Təsadüfi deyildir ki, iki müxtəlif elm sahəsinə aid edilən məntiqi və qrammatik kateqoriyalar fərqləndirilir. Onların qarşılıqlı əlaqələrinə aid dilçilik ədəbiyyatında xeyli miqdarda araşdırmalara rast gəlmək olar[4]. İndi dilçilikdə «qrammatik zaman» dedikdə felin zaman kateqoriyası nəzərdə tutulur. «Qrammatik zaman» termininin ilkin məna tutumunda, əgər belə demək mümkünsə, daralma baş vermişdir.

---

[1] Declerck Renaat. Tense in English. Its structure and use in discourse. London and New York, 1991; Nordlander Johan. Towards a Semantics of Linguistic Time. Exploring Some Basic Time Concepts with Special Reference to English and Krio, Umea University, 1997.

[2] Axundov A.A. Ümumi dilçilik, Bakı,1979, s.144.

[3] Античные теории языка и стиля, М-Л, 1936, с.106.

[4] Мещанинов И.И. Соотношение логических и грамматических категории - В сб.: Язык и мышление. М., 1967; Панфилов В.З. Грамматика и логика. М.-Л., 1963.

Yuxarıda qeyd edildiyi kimi, rusdilli dilçilik ədəbiyyatında «linqvistik zaman» («лингвистическое время») və «dil zamanı» («языковое время») terminləri zaman anlayışının dildə ifadə vasitələrinin toplusu mənasında sinonim kimi işlədilir. Belə bir sual ortaya çıxa bilər: bunlardan hansı daha məqbuldur.

«Obyekt–anlayış–söz» üçbucağından çıxış etsək, «real zaman»ı (dünyanın bütün maddi obyektlərinin mövcudluq forması kimi), «konseptual zaman»ı (insan şüurunda zaman anlayışları şəklində inikas forması kimi) və «dil zamanı»nı (söz, söz birləşməsi, cümlə və s. şəklində dildə ifadə forması kimi) bir-biri ilə əlaqəli dərk etmək lazım gəlir. Bu səbəbdən «dil zamanı» termini «linqvistik zaman» termininə görə daha münasibdir. Dil zamanı hissi və ya perseptual zamanın dil vasitələri ilə ifadə üsullarının toplusudur. Hissi və ya perseptual zaman isə obyektiv aləmdə bizim iradəmizdən asılı olmayaraq mövcud olan zamanın, yəni fiziki zamanın insan təfəkküründəki inikasıdır. Perseptual zaman təfəkkür kateqoriyasıdır. Təfəkkürün başqa kateqoriyaları kimi, perseptual zaman da tarixi kateqoriyadır. Dil zamanı perseptual zamanın ifadəsi olduğuna görə sinxron və diaxron istiqamətlərə malikdir, yəni dil zamanı həm sinxron, həm də diaxron planda öyrənilə bilər. Burada E.Tarasovanın yuxarıda qeyd edilmiş fikri ilə razılaşmaq lazım gəlir. Görünür, elə bu səbəbdən müasir dilçilik ədəbiyyatında «dil zamanı»nı *temporallıq* da adlandırırlar. «Temporallıq» termini latın dilindəki *tempus* «zaman» sözündəndir. Bu termin XX əsrin sonlarında meydana gəlmişdir. Həmin terminin dövriyyəyə buraxılmasının əsas səbəbini, fikrimizcə, dilçilik ədəbiyyatında zamanla bağlı terminlərin bolluğunda, onların çox vaxt üst-üstə düşməsində görmək lazımdır.

Əldə olan dilçilik terminləri lüğətlərinin heç birində «temporallıq» termininə təsadüf edilmir. Funksional dilçiliyin metodoloji cəhətdən inkişaf etdiyi və bu sahədə nəzərəçarpan

uğurların əldə edildiyi rus dilçiliyində sözügedən problemlə əlaqədar ədəbiyyatın araşdırılmasından belə qənaətə gəlmək olur: *temporallıq elə bir konseptual kateqoriyadır ki, onun əsasında iş, hal və hərəkətin zaman səciyyəsi dayanır*[1]. Tədqiqatlardan o da aydın olur ki, «temporallıq» termininin özünün ehtiva etdiyi məna yükündə də müxtəliflik nəzərə çarpır. Rus və slavyan dillərinin materialları əsasında temporallıq leksik-semantik sahəsinə həsr etdiyi tədqiqatında D.Q.İşuk «temporallığı» belə müəyyənləşdirir: «Temporallıq, bir tərəfdən, obyektiv (real) zamanla, digər tərəfdən, gerçəkliyin zaman münasibətlərinin insanların şüurunda əks olunması, inikası ilə, yəni konseptual və perseptual zamanla əlaqəli olan obyektiv-subyektiv kateqoriyadır»[2].

Temporallığa, onun məna tutumunu bir qədər geniş müəyyənləşdirməklə, eyni baxış bucağından yanaşmanı, bu kateqoriyanı, başqa tədqiqatçılardan fərqli olaraq, həm sinxron, həm də diaxron planda tədqiq etməyi vacib sayan E.V.Tarasovanın araşdırmalarında müşahidə edirik. «Obyekt – anlayış – söz» üçbucağından irəli gələn «dil zamanı» anlayışını bütövlükdə «temporallıq» olaraq qəbul edən E.V.Tarasova həmin terminin məna tutumunu bir qədər genişləndirir: «Dil zamanını (= temporallığı) insanın dil və ekstralinqvistik fəaliyyəti arasında münasibəti müəyyənləşdirən kateqoriyalara aid etmək olar... Dil zamanı real zamanın perseptual zaman vasitəsilə ifadəsidir... Beləliklə, temporallıq (=dil zamanı) gerçəkliyin xüsusi dərk olunma forması kimi təsəvvür oluna bilən özünəməxsus ikiplanlı obyektiv-subyektiv kateqoriyadır və

---

[1] Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990, с. 5.

[2] Ищук Д.Г. Лексико-семантическое поле как выражение концептуальной модели времени в языке. Дисс...канд.филол. наук. СПб, 1995, с. 31.

özündə real, perseptual və individual zamanların xassələrini birləşdirir»[1].

Deyilənlərdən belə nəticə hasil olur ki, «temporallıq» zaman anlayışı ilə əlaqədar olan hər bir şeyin müəyyən vasitə və üsullarla dildə ifadə edilməsidir. Həmin vasitə və üsullar isə çox çeşidlidir. Belə ki, zaman anlayışı dildə şəkilçilər, sözlər, söz birləşmələri və cümlələrlə ifadə oluna bilər.

Dilçilik ədəbiyyatında son dövrlərdə «bədii zaman» termininə də təsadüf edilir. Bu terminin məna tutumunun müəyyənləşdirilməsində Z.Y.Turayevanın tədqiqatları seçilir. Onun əsərlərində qrammatik və bədii zaman anlayışının məzmunu müəyyənləşdirilir[2]. Müəllifə görə, qrammatik və bədii zamanların hər biri ayrıca zaman forması kimi obyektiv, perseptual və fərdi zamanın xassələrini özünəməxsus şəkildə əks etdirsə də, qrammatik zaman iyerarxik cəhətdən daha aşağı səviyyəli kateqoriya olduğu üçün bədii zamana tabedir. Qrammatik və bədii zamanların iyerarxiya münasibətlərini tədqiq edərək, müəllif belə nəticəyə gəlir: «Qrammatik zaman daxilində bir hesablanma nöqtəsi vardır və bütün digər tərz-zaman formaları birbaşa və ya dolayısı ilə ona istiqamətlənir. Bədii zaman sistemi daxilində bir neçə hesablanma nöqtəsi ola bilər»[3].

Müəllifin qrammatik və bədii zaman anlayışları ilə bağlı mülahizələri bir çox cəhətdən mübahisə doğurur. Bu məsələnin araşdırılması başqa bir tədqiqatın mövzusu ola bilər. Burada isə sadəcə onu qeyd etmək olar ki, Z.Y.Turayevanın bədii zaman konsepsiyası ilk dəfə olaraq mətnə proyeksiya edilən funksional-semantik sahə anlayışına əsaslanır. Mətndə dil za-

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, АДД, Краснодар, 1993, s. 20.

[2] Тураева З.Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М.,«Высшая школа», 1979, с. 210-212

[3] Yenə orada, s. 212.

manının vəzifələri bədii zamanın lay və yarımlaylarının münasibətləri vasitəsilə ifadə edilir. Bədii zamanın dil zamanını özünə tabe etməsi barədəki fikirlər də buradan qaynaqlanır. Məhz bu mülahizələrdən faydalanaraq Z.Y.Turayeva bədii zamanla dil zamanını, deməli, temporallığı eyniləşdirir. Bununla çətin razılaşmaq olar, çünki, məlum olduğu kimi, «linqvistik planda nitqdə (mətndə) elə bir şey yoxdur ki, dildə olmasın.., cümlələr, söyləmlər və ya mətnlər hər bir konkret dilin sistemi ilə həmin sistemin səviyyə və vahidlərinin müəyyən iyerarxiyası kimi idarə olunur»[1]. Ona görə də dil formalarının, o cümlədən zaman formalarının mətn funksiyası dilin müxtəlif səviyyələrinə aid olan vahidlərin potensialını reallaşdırmaqdan ibarətdir. Bu isə bədii zamanın dil zamanının konkret özünüifadə vasitəsi kimi çıxış etməsi deməkdir.

Göründüyü kimi, dilçilik ədəbiyyatında zaman anlayışının dildə ifadəsi ilə bağlı işlədilən terminlər çoxsaylı olduğu qədər də qarışıqdır. Həmin terminlərin qaydaya salınması üçün xeyli iş görülməlidir.

### 1.3. Zaman momenti, nitq momenti və ya danışıq vaxtı (anı)

Dilçilikdə xronoloji zaman parametri mühüm məsələlərdən biri hesab olunur. Bu kateqoriya gerçəkliyə psixolinqvistik yanaşma ilə bilavasitə əlaqəlidir. İnsan müxtəlif səviyyəli biliklər sistemi vasitəsilə rəngarəng fəaliyyət təcrübəsi qazanır. O, dərketmə prosesinin subyekti kimi çıxış edərək dünyanın dil mənzərəsinin formalaşmasında mühüm rol oynayır. Xarici mühit fasiləsiz şəkildə insana təsir göstərir. İnsanın onu əhatə edən aləmlə təması həmişə müəyyən məkani koordinat-

---

[1] Тураева З.Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М.,«Высшая школа», 1979, с. 74.

lar sistemində baş verir. Həmin təmas nöqtəsinin və ya hər şeyin ölçüsü insanın özüdür. Məkan və zaman anlayışı «insan-dil sisteminin mövcudluğu»nun hesablanma nöqtəsidir. Dünyanın konseptual mənzərəsi qavrayış və vizual informasiyanın işlənməsi proseslərində qurulur. İnsan dərketmə prosesində predmeti və onun yerini qavradığı kimi, həmin predmetin mövcudluq zamanını da qavrayır. Bütün bunlar insanın dil sistemində də öz əksini tapır.

Əsas anlayış kateqoriyalarından olan zaman bəşəri dildə linqvistik ifadə vasitələrinin köməyilə əks olunur. Linqvistik zaman, daha dəqiq desək, dil zamanı gercəklikdə bizdən asılı olmayaraq mövcud olan zamanın fiziki və fəlsəfi aspektlərinin mahiyyətini dil vasitələri ilə ifadə üsullarının məcmusu kimi qəbul edilir, yəni dil zamanının mahiyyəti zaman münasibətlərinin nəzəri anlayışlar səviyyəsində dərk edilməsindən, başqa sözlə, konseptuallaşdırılması və müəyyən dil vasitələri ilə tərtib və ifadə edilməsindən ibarətdir. Gerçəkliyin əsas kateqoriyaları olan «predmet, onun məkanca lokallaşması və zaman daxilində təzahürü»[1] mütləq nəzəri anlayışlar səviyyəsində dərk edilir və dilə çevrilir. Dilçilikdə psixosistematik məktəbin banisi olan Q.Giyom məkan və zaman dixotomiyasının dil strukturunda dərin iz buraxdığını qeyd edir[2]. Özünün zamanla bağlı konsepsiyasında Q.Giyom həmişə zamanın məkandan ayrılmazlığına işarə etmişdir. Zamanın dildə realizəsindən danışan Q.Giyom dildə obyektiv şəkildə mövcud olan fel formalarını nəzərdə tutur, çünki o, zaman təsəvvürünü fellə assosiasiya edir, yəni «zaman təsəvvürü» morfoloji səviyyəyə çıxır.

Qeyd olunduğu kimi, obyektiv zamanla dil zamanı arasındakı nisbət xeyli müddətdir ki, fəlsəfə, məntiq, psixologiya, dilçi və s. mütəxəssislərin mübahisə predmetinə çevrilmişdir.

---

[1] Степанов Ю.С. Имена, предикаты, предложения (семиологическая грамматика). М., Наука, 1981, с. 55.
[2] Гийом Г. Принципы теоретической лингвистики. М., 1992, с. 25.

Fəlsəfədə belə bir baxış postulat kimi qəbul edilir: universal zaman ardıcıllığı (yəni «əvvəl» və «sonra» tipli münasibətlər) mövcud deyildir, amma fiziki hadisələrin vahid xətti ardıcıllıqla sıralandırılması, yəni onların vahid şəkildə biri-birinin ardınca yerləşdirilməsi yalnız müəyyən hesablama sistemi təsbit edildiyi təqdirdə mümkün olur[1]. Dilçilik ədəbiyyatında ənənəvi olaraq qəbul edilmiş nəzər nöqtəsinə əsasən isə danışan şəxs zaman münasibətlərini hərəkəti hesablama momenti kimi götürülən nitq momenti ilə əlaqələndirmə yolu ilə müəyyənləşdirir[2].

İndiki, keçmiş və gələcək zamanların müəyyənləşdirilmə meyarı kimi nitq momentinin rolu barədə bir çox dilçilər mülahizələrini söyləmişlər. «Nitq momenti» anlayışının özünün şərhi heç də həmişə birmənalı deyildir. Məsələn, T.P.Lomtevin fikrinə görə, *nitq momenti* anlayışı yalnız və yalnız fiziki zamanla əlaqədardır, amma qrammatik zamanda nitq momenti zaman axınının tərkib hissəsi kimi uzunluq komponentini (компонент длительности) təşkil edir: «Felin zaman formalarının temporal mənasına fiziki baxış onu nəzərdə tutur ki, nitq momenti indiki zamanın təyinolunma, keçmiş və gələcək zamanlarda isə hesablanma nöqtəsidir. Felin zaman formalarının temporal mənasına qrammatik yanaşma isə ondan ibarətdir ki, qrammatik zaman kateqoriyası üzrə fərqləndirilən fel formalarına zaman axınının tərkib hissəsi kimi uzunluq (длительность) aid edilir»[3].

---

[1] Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969, с.154.

[2] Bu barədə bax: Axundoв A.A. Felin zamanları, Bakı, 1961; Коклянова А.А. Категория времени в современном узбекском языке. М., 1963; Грамматика русского языка. Том 1, М., Изд-во АН СССР, 1952; Общее языкознание (Формы существования, функции, история языка). М., Наука, 1970, с. 405.

[3] Ломтев Т.П. Предложение и его грамматические категории. М., МГУ, 1972, с. 67

V.N.Migirin felin zaman kateqoriyasını hərəkətin başvermə ardıcıllığı (nizamı) və hərəkətlərin mövcudluğunun kəmiyyəti kimi səciyyələndirərək göstərir ki, hərəkətlərin ardıcıllığı (nizamı) müəyyənləşdirilərkən müxtəlif hesablama nöqtələrindən istifadə oluna bilər: digərləri ilə bərabər, bu, hərəkətin özü və danışıq aktı ola bilər[1].

Bu hesablama nöqtəsi – nitq momenti – necə adlandırılmasından asılı olmayaraq, obyektiv səciyyə daşıyır, çünki öbyektiv gerçəkliyin konseptual səviyyədə formalaşmasını göstərir. Dilçilikdə zamana hərəkətin nitq momentinə münasibətdə üç tipinə əsaslanan sistem kimi yanaşılması artıq ənənəvi baxışdır. Hərəkətin nitq momentinə münasibətdə ortaya çıxan üç tipi *öncəgəlmə*, *eynizamanlılıq* və *sonragəlmə* şəklində təsnif edilir. Hərəkət nitq momenti ilə üst-üstə düşdükdə, onun üçün nitq momenti ilə *eynizamanlılıq* mənası xarakterik olur; əgər hərəkət nitq momentinə qədər baş verirsə, onda *öncəgəlmə* mənası xarakterik olur; əgər hərəkət nitq momentindən sonra gerçəkləşirsə, onda belə hərəkət üçün *sonragəlmə* mənası səciyyəvi olur; əgər hərəkət nitq momenti ilə üst-üstə düşmürsə, onda həmin üç münasibət başqa bir hesablanma nöqtəsinə görə mövcud olacaqdır. Beləliklə, nitq momenti psixoloji qəbildən olan anlayış olmayıb, şərti xarakter daşıyan linqvistik anlayış kimi meydana çıxır.

İnsanın bütün fəaliyyəti, o cümlədən təfəkkür fəaliyyəti real gerçəkliklə, real zamanla sıx bağlıdır. İnsandan asılı olmayaraq mövcud olan real zamanın onun şüurundakı inikası zamanın insan tərəfindən fərdi əqli və psixi qavranılmasıdır. Gerçəklik, eləcə də real zaman bütövdür, amma insanın şüuru onu ayırır, hissələrə bölür. Bu, kortəbii şəkildə baş verən proses deyildir. Bu proses fiziki aləmlə psixi aləm arasında möv-

---

[1] Мигирин В.Н. Язык как система категорий отображения. Кишинев, 1973, с.137.

cud olan qarşılıqlı əlaqənin nəticəsi kimi baş verir. Beləliklə, real fiziki aləm psixika vasitəsilə «təsəvvür aktlarına» çevrilir və bunların əsasında da dil «qurulur». Nitq aktında dil faktları nitq faktlarına çevrilir. Bu çevrilmənin mexanizmi isə dil faktını aktuallaşdıran əməliyyatların müəyyən sistematikası ilə aşkarlanır. Dil faktını aktuallaşdıran hər bir əməliyyat real, amma qavrayış üçün əlçatmaz olan «əməliyyat zamanı»nda baş verir. Həmin «əməliyyat zamanı» nə qədər qısa olsa belə, dili nitqdən ayırır və onların hər ikisi ilə qarşılıqlı əlaqədə olur.

Bu səbəbdən zaman çox geniş, müxtəlifplanlı bir anlayış olaraq təfəkkür hadisəsi, fiziki hadisə, linqvistik hadisə, subyektiv-psixoloji hadisə kimi diqqəti cəlb etmişdir.

B.Rassel fiziki zamanla təfəkkür hadisəsi olan mental zaman haqqında danışarkən qeyd edir ki, fiziki zaman obyektlə obyekt arasındakı münasibətdən meydana gələn zamandır, mental zaman isə subyekt və obyekt arasındakı münasibətdən irəli gələn zamandır[1]. Şübhəsiz, bunu nəzərə alaraq, dildə gerçəkliyin subyektiv qavrayışını qeyd etməmək olmaz, çünki zaman münasibətlərinin ifadəsinin mərkəzində həmişə subyekt dayanır və gerçəklik məhz subyektin təfəkküründə inikas edir. Bu subyekt real zaman daxilində yaşayır və real zamanı iki mərhələdə, əvvəlcə, hiss edir, qavrayır (perseptual zaman), sonra isə onu anlayışlar (konseptual zaman) şəklinə salır. Tarixi xronologiyaya aid faktlar barədə söylənən fikirlər (məsələn, *1670-ci ildə, 15 may 1983-cü il*) istisna olmaqla, qalan bütün hallarda zaman hansısa hesablama nöqtəsinə əsasən ifadə olunur. Həmin hesablama nöqtəsi ya danışan subyektin nitq momentidir, ya da danışan subyektin nitq momentinə görə keçmişdə və ya gələcəkdə yerləşən nitq momentidir. Bütün hadi-

---

[1] Bu barədə bax: Кравченко А.В. Язык и восприятие. Когнитивные аспекты языковой категоризации. Иркутск, 1996, с. 59.

sələrin mərkəzində dayanan həmin subyektdən, yəni danışan şəxsdən asılı olaraq hər şey təşkil olunur. Bu təşkilolunma ya onunla və onun indiki zamanı ilə birbaşa münasibətdə (məsələn, *bu gün, indi, hazırkı momentdə*), ya da onunla və onun indiki zamanına görə əvvəl və ya sonra gələn momentlə dolayısı ilə (*o gün, onda, o anda* və s.) münasibətdə olur. Məhz nitq momenti (bir sıra tədqiqatçılar onu «danışıq momenti» də adlandırırlar) zaman oriyentiri kimi dönüş nöqtəsini təşkil edir. İndiki zamanda olan bu nöqtəni başlanğıc, ilkin, əsas hesablama nöqtəsi adlandırmaq olar. İndiki zamanın davametmə (uzunluq) müddətinin nə qədər olmasından asılı olmayaraq, indini (indiki zamanı) həmişə «mən» təyin edir. İndiyə qədər, ondan sonra və onunla eyni zamanda nə baş verirsə, özlüyündə yalnız və yalnız həmin «mən»ə nisbətən olur. Nitq momentinin seçilməsi real gerçəkliklə şərtlənir, amma nitq momentinin vəziyyəti real şəraitdən asılı olaraq danışan tərəfindən müəyyən edilir. Əgər hesablama nöqtəsi kimi başqa bir nitq momenti seçilirsə (hadisə ona əsasən başqa ox üzərinə keçirilir), o halda bu nitq momenti ikinci hesablama nöqtəsi hesab olunur. Ənənəvi təsnifatda ilkin hesablama nöqtəsi mütləq zamanlara, ikinci isə nisbi zamanlara uyğun gəlir. Dildə bu planda müxtəlif ifadə vasitələri vardır. Onların əsasları, yuxarıda qeyd olunduğu kimi, felin zaman formalarıdır və bu formalar həmin ifadə vasitələrinin nüvəsini və ya mərkəzini təşkil edir. Zamanın digər ifadə vasitələri – leksik, leksik-sintaktik vasitələr və digərləri isə periferik vasitələrə aid edilir. Onları da yaxın və uzaq periferik vasitələrə ayırmaq olar. İfadə vasitələri bütövlükdə nitq prosesində qarşılıqlı əlaqədə olaraq fəaliyyət göstərir.

Beləliklə, nitq momenti elə bir vahiddir ki, obyektiv real zamanı dildə ifadə olunan zamanla (dil zamanı ilə) əlaqələndirməyə imkan verir. Ona görə də iki nitq momentini fərqləndirmək olar: dilxarici nitq momenti və dildəki nitq mo-

menti. Dilxarici nitq momenti insan şüurundan asılı olmayaraq mövcud olan obyektiv zamanın ünsürüdür. Dilxarici nitq momenti bütöv, hissələrə ayrılmayan obyektiv zamanın hərəkətini göstərən şərti ox üzərində elə bir nöqtədir ki, həmin nöqtədən əvvəl və ya sonra gələn hadisələrin axınını insan tərəfindən qavramağa imkan verir. O özünün birölçülülüyü, asimmetrikliyi və dönməzliyi ilə səciyyələnir. Əslində bu nöqtə *zaman momenti* adlandırıla bilər. Real zamanın xassələri ilə məşğul olan fizika, astronomiya və bu qəbildən olan elm sahələrində elə bu cür də adlandırılır. Beləliklə, *dilxarici nitq momenti* dedikdə, daim hərəkətdə olan, eləcə də şüurumuzdan kənarda və ondan asılı olmayaraq mövcud olan obyektiv zamanın müəyyən momenti nəzərdə tutulur. Dilxarici nitq momentinin dildə inikası, əksi *qrammatik nitq momenti* adlanır. Qrammatik nitq momenti isə dil sisteminin komponentidir.

Azərbaycan dilçilik ədəbiyyatında dildəki zaman formalarının müəyyənləşdirilmə meyarı kimi *nitq momenti* termini ilə bərabər *danışıq vaxtı, danışıq momenti, nitq vaxtı, nitq anı, danışıq anı, danışmaq momenti* və s. terminlərdən də istifadə olunur[1]. Fikrimizcə, bir anlayışın ifadəsi üçün bu qədər termindən istifadə olunması istər-istəməz qarışıqlığa səbəb olur. Görünür, elə bu səbəbdən onların heç biri ayrıca lüğət məqaləsi şəklində «İzahlı dilçilik terminləri» lüğətinə düşməmişdir. Bu qədər termindən hansının daha məqbul olduğunu söyləmək heç də asan deyildir. Bizim fikrimizə görə, obyektiv və qrammatik zaman münasibətləri üçün daha məqbul olanı *nitq momenti* terminidir. Digər terminlərin heç biri həmin münasibətləri lazımı şəkildə aydınlaşdıra bilmir, çünki *nitq momenti* termini nitq prosesi ilə bağlıdır. Başqa dillərdə də obyektiv və

---

[1] Axundov A. Felin zamanları, Bakı, 1961; Cahangirov F. Perfekt zamanlar. Bakı, 2000; Cəfərova B. İngilis və Azərbaycan dillərində felin zamanlar sistemi.Bakı, 2004; Əsgərov M. Türk dillərində zaman formaları, adverbial fel formaları və onlar arasında funksional-semantik əlaqələr. Bakı, 2003 və s.

qrammatik zaman münasibətlərindən bəhs edilərkən eyni termin işlədilir. Məsələn, rusdilli və ingilisdilli ədəbiyyatda bu anlayış üçün *момент речи* və *moment of speech* terminlərindən istifadə edilir. Rusdilli ədəbiyyatda *момент речи* termini ilə bərabər *момент говорения* termininə də təsadüf edilir[1].

Son dövrlərdə aparılan tədqiqatlarda bu sahədəki terminlərin sahmana salınmasına müəyən cəhdlər edilir. Türk dillərində zaman formaları, adverbial fel formaları və onlar arasında mövcud olan funksional-semantik əlaqələri tədqiq edən M.Əsgərov *nitq vaxtı* termininə üstünlük verir. Bundan əlavə, o, qrammatik zamanın müəyyən olunma meyarı kimi *qrammatik nitq vaxtı* terminindən istifadə edir, obyektiv zamanın müəyyən olunma meyarını isə *obyektiv nitq vaxtı* termini ilə adlandırır[2]. Hesab edirik ki, onun «nitq vaxtı obyektiv zamanın meyarı ... olduğuna görə ...»[3] ifadəsi ilə razılaşmaq olmaz. Müəllifin istifadə etdiyi *nitq vaxtı* (bu termini o, *nitq momenti* mənasında işlədir) obyektiv zamanın meyarı ola bilməz, olsa-olsa keçmişdən gələcəyə doğru hərəkət edən şərti zaman oxu üzərində bir andır, nöqtədir. Bu an və ya nöqtə elmi ədəbiyyatda *zaman momenti* adlanır. Beləliklə, bir daha vurğulamaq lazım gəlir ki, obyektiv və qrammatik zaman münasibətləri fonunda daha məqbul olanı *nitq momenti* terminidir.

### 1.4. Birinci fəslə dair nəticələr

Mövzu ilə bağlı nəzəri materialın təhlili bizə müəyyən nəticələr çıxarmağa imkan verir. Zaman geniş və çoxplanlı bir anlayışdır. Fiziki, fəlsəfi, linqvistik və subyektiv-psixoloji hadisə olan zamanı müxtəlif yönlərdən tədqiq etmək olar.

---

[1] Пешковский А.М. Русский синтаксис в научном освещении. М., 1956

[2] Əsgərov M. Türk dillərində zaman formaları, adverbial fel formaları və onlar arasında funksional-semantik əlaqələr. Bakı, 2003, s. 12-30.

[3] Yenə orada, s. 23.

Dil sistemi üçün obyektiv universal hadisə ondan ibarətdir ki, gercəkliyin əsas kateqoriyalarından olan zaman mütləq özünün konseptual səviyyədə ifadəsini tapır, yəni insanın istənilən ekstralinqvistik təcrübəsi onun şüurunda inikas edərək dil vasitələri ilə reallaşır. Zaman münasibətləri sisteminin bu şəkildə qurulması obyektiv zamanla dil zamanı münasibətlərinin müəyyənləşdirilməsini nəzərdə tutur.

Dilçilik ədəbiyyatında artıq postulat kimi qəbul edilən bir mülahizədə bildirilir ki, zaman münasibətləri subyekt tərəfindən hərəkətin nitq momenti ilə əlaqələndirilməsi yolu ilə müəyyən edilir. Əsas hesablanma nöqtəsi sayılan nitq momenti həmişə obyektiv səciyyə daşıyır, çünki o, real gerçəkliyi anlayış səviyyəsində təqdim edir, konseptuallaşdırır. Məhz bunun sayəsində zaman hərəkətin hesablanma nöqtəsinə görə üç tipinə – öncəgəlmə, eynizamanlılıq və sonragəlməyə əsaslanan bir sistem kimi dərk edilməsi ümumi yanaşma səviyyəsinə qalxır.

Bəllidir ki, zamanın dildə reallaşması çox vaxt zaman haqqında təsəvvürlərin morfoloji səviyyəyə çıxması ilə assosiasiya olunur. Başqa sözlə desək, zamanın dildə reallaşmasından söhbət gedərkən birinci növbədə qrammatik kateqoriya olan fel zamanlarından bəhs edilir. Qeyd etmək lazımdır ki, zaman dilin morfoloji səviyyəsindən başqa, leksik, leksik-sintaktik, frazeoloji səviyyələrinə, eləcə də söyləm və mətn səviyyələrinə nüfuz etmişdir. Burada söhbət dildəki bütün mümkün ifadə vasitələrinin və onların kombinasiyalarının məcmusundan gedir.

Zamanın təfəkkür vasitəsilə dərki və ifadəsi əvvəlcə anlayış kateqoriyası kimi, sonra isə dil faktlarına sahə yanaşması ilə bağlı olan funksional-semantik kateqoriya kimi meydana

çıxmasına gətirib çıxardı. Belə yanaşma metodu istənilən kateqoriyanın həm ayrıca götürülmüş dildə, həm də müxtəlif dillərdə müqayisəli təhlilində çox faydalıdır.

Dil zamanının anlayış və funksional-semantik sahələr vasitəsilə kompleks şəkildə dərk edilməsi zamanın daha geniş olub *temporallıq* adlanan kateqoriya kimi meydana çıxmasına səbəb olmuşdur.

# II FƏSİL

# TEMPORALLIQ SAHƏSİNİN STRUKTUR- FUNKSİONAL STATUSU

## 2.1. Dilçilikdə sahə metodu haqqında

«Sahə» fizika elminə aid bir anlayış olub, obyekti müxtəlif yönlərdən səciyyələndirmə, hadisələri hərtərəfli öyrənmə texnikasıdır. Bu termin fizikada müəyyən fiziki hadisələrin nəzərdən keçirildiyi məkan vahidi (məsələn, temperatur sahəsi, təzyiq sahəsi, elektromaqnit sahəsi və s.) mənasında işlənir. «Sahə» anlayışı fizikadan əlavə, psixologiya, biologiya, sosiologiya və başqa elm sahələrində də istifadə olunur. Eyni terminlə psixologiya və sosiologiyada bir-birindən asılılıq vəziyyətində olan faktların toplusu nəzərdə tutulur[1].

Dilçilikdə «sahə» dedikdə «insan həyatının və insan təcrübəsinin müəyyən sahəsi ilə əlaqədar olan məzmunlu vahidlərin (məfhumların, sözlərin) məcmusu» başa düşülür[2].

Dilçilik ədəbiyyatını nəzərdən keçirdikdə, hər şeydən öncə, «sahə» termini ilə müxtəlif anlayışların ifadə olunduğu diqqəti cəlb edir. *Modallıq sahəsi, temporallıq sahəsi, kəmiyyət sahəsi, aspektuallıq sahəsi* və s. birləşmələrin tərkibində bu anlayış «kateqoriya» mənasında, bir sıra başqa hallarda isə daha geniş mənada, «sistem», «paradiqma», «funksional-semantik plan» terminləri ilə sinonim kimi işlənir. Bəzən hətta dil strukturu sadəcə olaraq «sahə» kimi izah olunur[3].

Dildə sahə nəzəriyyəsinin mahiyyəti ondan ibarətdir ki, vahid anlayış məzmununun ifadə edilməsi üçün çeşidli vasitə-

---

1 Щур Г.С. Теория поля в лингвистике. М., 1974.
2 Adilov M.İ., Verdiyeva Z.N., Ağayeva F.M.İzahlı dilçilik terminləri (sorğu lüğəti). Bakı, 1989, s. 230.
3 Щур Г.С. Теория поля в лингвистике. М., 1974, с.78, 95.

ləri ehtiva edən dil sferaları tədqiqat obyekti kimi götürülür. Bunlar özünəməxsus koqnitiv, məzmun və funksional-kommunikativ səciyyələri ilə müəyyən struktura malik olan xüsusi tipli dil qruplaşmaları – sahə şəklində təsəvvür edilir. Dil və nitq kateqoriyalarının sahə şəklində modelləşdirilməsi müəyyən bir ümumi məfhumun ifadə edilməsində müxtəlif üsul və formalar çoxluğunu sistemə salmaq, sistemləşdirmək vəzifəsini ortaya qoyur.

Nəzəri dilçilik ədəbiyyatından yaxşı məlumdur ki, dilçilikdə sahə anlayışının meydana gəlməsi XX əsrin 20-ci illərində Avropa dilçiliyində yeni humboldtçuluq cərəyanının inkişaf etməsi ilə bağlıdır. Həmin cərəyanın inkişafı ilə dil sahələri nəzəriyyəsinin ilkin rüşeymləri yaradıldı. Bü rüşeymlər, hər şeydən öncə, dilin leksikasının sistemli xarakterinin müəyyənləşdirilməsində özünü göstərdi.

Dilçilikdə «sahə» anlayış-termininin meydana gəlməsini Avstriya alimi Y.Tririn adı ilə bağlayırlar. G.İpsenin «Der alte Orient und die İndogermanen» əsəri işıq üzü görəndən sonra «sahə» termini daha çox yayılır. G. İpsen bu əsərində ümumi mənaya malik olan sözlərin məcmusunu «sahə» termini adı ilə müəyyənləşdirir. G.İpsendən sonra L.Vaysgerber, A.Yolles, E.Oskaar və başqa tədqiqatçılar zamanın bu və ya başqa tarixi inkişaf mərhələlərində özlərinin leksik mənalarının xətti ilə bir-birinə bağlı olan sözlər toplusunu «sahə» kimi başa düşürdülər. Y.Trirə gəldikdə isə o, müəyyən məfhum sferasının strukturunu «sahə» kimi qəbul edirdi ki, buna da dildə söz sahəsi və ya leksik sahə uyğun gəlir.

Y.Trir dil sistemi anlayışı altında onun elementlərinin əlaqəsini başa düşürdü. Belə əlaqəni dərk etmənin özü isə isveçrəli Ferdinand de Sössürə məxsus idi. Başqa sözlə, Y.Trir dil sistemi ilə onun elementlərinin əlaqəsini məhz F.de Sössürün başa düşdüyü tərzdə görürdü. O, sözün mənasını dil mənasının üzvü kimi götürürdü. Dil bütövlüyü sözdən ötrü özünə-

məxsus mövcudluq məkanıdır. Söz bu mövcudluq məkanından çıxarılıb, özünün məfhumi müəyyənliyini də ondan alır. Y.Trir yalnız bütöv sahə daxilində və həmin bütövə görə sözün mənaya malik olduğunu vurğulayır. Onun fikrincə, sahədən kənarda sözün, ümumiyyətlə, mənası yoxdur[1].

Y.Trir özünün semantik sahə nəzəriyyəsini inkişaf etdirərkən V. fon Humboldtun «dilin daxili forması» haqqındakı təliminə, yəni dilin üzvlənməsi və üzvlənən bütöv funksiyasına, eləcə də F. de Sössürün «söz özünün işarəvi təbiətinə uyğun olaraq məna məzmununu yalnız anlayış sahəsindəki qonşularından alır» müddəasına əsaslanmışdı.

Sahə nəzəriyyəsinin inkişaf etdirilməsində Y.Tririn xidmətlərini «leksik sahə» və «məfhumi sahə» terminlərini elmi dövriyyəyə daxil etməkdə və onlar arasında fərqləndirmə aparmaqda görmək lazımdır. Alim sözügedən terminlər arasında fərqləndirmə aparmaq üçün məfhumu meyar kimi götürür. Məhz bu səbəbdən dilçilikdə Y.Trir sahəsini bəzən «məfhumi sahə» də adlandırırlar. Trir nəzəriyyəsinin əsas xüsusiyyəti odur ki, semantik sahənin mərkəzində bir konsept və ya semantik dominant durur. Bu konsept əslində semantik əlamətlərin toplusundan ibarət olur. Həmin toplu ümumi məfhumdan, növ məfhumundan və temadan, yəni haqqında bəhs olunan predmetdən təşkil olunur. Mərkəzdə çoxmənalı komponentin olması səbəbindən mərkəzdən uzaqlaşdıqca semantik əlamətlərin kəmiyyəti azalır. Ən kənarda olan ünsürlər semantik dominantın fərqləndirici əlamətlərindən müxtəlif dərəcədə uzaqlaşmış, bununla da semantik cəhətdən müəyyənləşmiş olur. Ucqardakı məna ilə semantik dominantın əlaqəsi semantik meyl və semantik məsafə terminləri ilə göstərilə bilər. Hə-

---

[1] Cəfərov Q. Azərbaycan dilinin leksik-semantik sistemi. Bakı, 1984, s.4.

min əlaqələrin dərəcələri leksikoloji işlərdə, sintaktik transformasiyada və s. müxtəlif qaydalar əsasında hesablanır[1].

Bizim dövrümüzdə sahə nəzəriyyəsi ilə bağlı çoxlu tədqiqatlar aparılmış, sahə tədqiqatları ilə əlaqədar xeyli maraqlı və uğurlu işlər görülmüşdür. Dilçilikdə sahə nəzəriyyələrinə ümumiləşdirici əsər həsr etmiş Q.S.Şur yazır: «Müasir dilçilikdə «sahə», «sistem» və «struktur» terminləri ənənəvi dilçiliyə nisbətən daha çox işlənir. Bu səbəbdən elə təsəvvür yarana bilər ki, həmin kateqoriyaların tədqiqi ilk növbədə çağdaş dilçiliyin tədqiqat obyektidir. Əslində bu fikrin heç bir əsası yoxdur, çünki ənənəvi dilçilik empirik olaraq həmişə həmin kateqoriyaları öyrənmişdir və bu tədqiqatlar çox zaman daha dərin səciyyə daşımışdır»[2].

Sahə nəzəriyyəsinin ilk dəfə Y.Trir tərəfindən sistemləşdirilib irəli sürülməsinə baxmayaraq, ondan əvvəllər də belə ideyaların olduğu tədqiqatçılar tərəfindən qeyd edilir[3]. Mənaca yaxın olan söz qruplarının tədqiqinə əsaslanan yanaşma metodu ideya mənbəyi cəhətdən dilçiliyin filosofu hesab olunan V. fon Humboldta gedib çıxır. Bu metoddan H.Osthof, R.Meyer, H.Şperber kimi alman tədqiqatçıları yararlanmışlar. F. de Sössür isə dilin leksikasının öyrənilməsində «sistem» terminindən istifadə etmişdir. F. de Sössür semantikada paradiqmatik münasibətlərin öyrənilməsi zərurətini ilk dəfə qeyd etmişdir. O, dilin məna vahidlərini sırf semantik cəhətdən deyil, qarşılıqlı nisbətlərinin qeydə alınması ilə təyin olunmasını vurğulayırdı[4]. Beləliklə, sahə metodunun linqvistik ənənəyə əsaslan-

---

1 Verdiyeva Z., Ağayeva F., Adilov M. Dilçilik problemləri, 1982, s. 313.

2 Щур Г.С. Теория поля в лингвистике. М., 1974, с.210.

3 Verdiyeva Z., Ağayeva F., Adilov M. Dilçilik problemləri, 1982, s. 312; Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998, s. 14-16.

4 Cəfərov Q. Azərbaycan dilinin leksik-semantik sistemi. Bakı, 1984, s.4.

dığı aşkar görünür. Mövcud dilçilik ədəbiyyatında hələ Hötedə sahə fikirlərinin olduğu qeyd edilir[1].

Y.Trirdən sonra sahə tədqiqatları iki istiqamət üzrə davam edir. Onlardan birincisi ekstralinqvistik və ya onomasioloji yöndür ki, burada əsas olaraq anlayış, məfhum götürülür. İkincisi linqvistik və ya semasioloji istiqamətdir ki, burada sahələrin fərqləndirilməsi və bölünməsində əsas meyar sözün mənası götürülür.

Sahə nəzəriyyəsinin inkişafında V.Porsiqin mühüm xidməti olmuşdur. O, sələflərinin bir çox çatışmazlıqlarını aradan qaldırmış, parataktik (paradiqmatik) və sintaktik (geniş mənada sintaksis) sahələri fərqləndirmiş, onların əsasında sözlərin məzmununu müəyyənləşdirmişdir. V.Porsiqin sahə nəzəriyyəsi dilçilikdə sözlərin semantik valentliyi üsulu da adlanır. Bu üsulun əsas xüsusiyyəti sözlərin semantik cəhətdən birləşmə qaydalarını öyrənmək olmuşdur[2].

Dilin leksikasının tədqiqində sahə yanaşması metodunun ardıcılları arasında K.Royninq, Ş.Balli, O.Duxaçek, F.Brüno və O.Yespersen kimi alimlərin adlarını çəkmək olar. K.Royninq tədqiqatlarında təkcə adları deyil, həm də başqa nitq hissələrini öyrənir, çarpazlaşan və ya kəsişən sahələrin mövcudluğunu göstərir. Ş.Balli əsərlərində assosiativ sahələr anlayışını təqdim edir: belə sahədə söz-stimul ətrafında müəyyən sözlər-assosiativ qrup birləşir. Tədqiqatçı sahədə yaxın və uzaq assosiasiyaların mövcud olduğunu göstərir. O.Duxaçek anlayış (məfhum) və söz sahələrini fərqləndirir: söz sahəsində, tədqiqatçının fikrincə, morfoloji, sintaktik və assosiativ yarımsahələri ayırmaq olar. F.Brüno və O.Yespersen sahəyə səviy-

---

[1] Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998, s. 16.
[2] Verdiyeva Z., Ağayeva F., Adilov M. Dilçilik problemləri, 1982, s. 315.

yələrarası yanaşmanın (qrammatik, funksional-semantik və s. sahələr) əsasını qoymuşlar[1].

Rus dilçiliyində dilin leksikasının sistemli tədqiqinin əsasları A.V.Şerba, V.V.Vinoqradov, B.A.Larin, F.P.Filin, D.N.Şmelyov və başqalarının əsərlərində qoyulmuşdur. Leksikanın belə sistemli öyrənilməsi A.A.Ufimseva, Q.S.Şur, Y.N.Karaulov, L.V.Vasilyev, L.A. Novikov, E.V.Tarasova və digərlərinin əsərlərində davam etdirilir. Sahə metodu dil sisteminin müxtəlif səviyyələrinin (fonetik, semantik, sintaktik, frazeoloji) tədqiqi zamanı, eləcə də səviyyələrarası, funksional yanaşmada (bu yanaşmada funksional-semantik sahələr üzə çıxarılır) tətbiq edilir. Belə çoxyönümlü və çeşidli yanaşmalar ayrı-ayrı tədqiqat əsərlərində *sahə* sözü ilə çoxlu söz birləşmələrinin meydana çıxmasına rəvac verir. Dilçilikdə sahə nəzəriyyələrinə xüsusi ümumiləşdirici əsər həsr etmiş Q.Ş.Şur 100-ə yaxın belə söz birləşməsini nümunə gətirir[2].

Ümumiyyətlə, müasir dilçilikdə sahənin semantik model kimi tətbiqində bir neçə əsas aspekti ayırmaq olar.

1. Semasioloji aspekt. Bura paradiqmatik və sintaqmatik təhlil səviyyələri aiddir. Sözlər leksik mənalarının semantik aidiyyətinə, nisbətinə görə qruplaşdırılır.

2. Onomasioloji aspekt. Bu aspekti nominativ aspekt də adlandırmaq olar. Bu zaman sözlər dilxarici aidiyyəti üzrə, yəni sözlərin arxasında dayanan əşya, hadisə anlayışlara görə qruplaşdırılır.

3. Funksional və səviyyələrarası aspekt. Bu zaman sahənin vahidləri onların semantik funksiyalarının ümumiliyi üzrə qruplaşdırılır.

---

[1] Щур Г.С. Теория поля в лингвистике. М., 1974; Васильев Л.М. Теория семантических полей // Вопросы языкознания, М., 1971, № 5, s. 106-111.

[2] Щур Г.С. Теория поля в лингвистике. М., 1974.

Birinci iki yanaşmada sahənin vahidləri eynicinsli elementlər, funksional yanaşmada isə dilin müxtəlif səviyyələrinin elementləridir.

Sahə metodunun dilin leksik-semantik sistemində, ümumiyyətlə, leksikologiyada tətbiq edilməsinin səmərəliliyi onun qrammatikaya da nüfuz etməsinə zəmin yaratdı. Alman alimi X.Brinkman ilk dəfə olaraq modallıq sahəsinin mövcudluğunu əsaslandırdı və dilçiliyə «Modalfeld» terminini gətirdi. Onun arxasınca Q.Qlinq və X.Xamann müəyyən fikrin ifadə edilməsində «özək mühit» və ya «nüvə»ni fərqləndirməklə «antiqrammatika» yaratmağa cəhdlər etdilər. Məhz X.Xamann ilk dəfə olaraq zamanı sahə formasında tədqiq etmişdir.

Sahə tədqiqatları metodunun bir sıra mühüm müddəaları sonralar Praqa dilçiliyinin funksional qrammatikasında daha da təkmilləşdirilərək zənginləşdirildi. Məhz Praqa dilçiliyinin funksional qrammatika təlimində bütün dil hadisələrini mərkəz və periferiya qarşılaşdırması baxımından nəzərdən keçirmək təklifləri vurğulanırdı.

Sahə dilin sistemində onun sistemli təşkili vasitəsi kimi mövcuddur və dilin sistemində onu təşkil edən ünsürlərin real əlaqələrini əks etdirir. Dil sahələri müxtəlif mürəkkəblik və mücərrədləşdirmə səviyyəsinə malik ola bilər. Çağdaş dilçilikdə sahə probleminə kifayət qədər tədqiqat həsr olunmuşdur. Həmin tədqiqatlarda müxtəlif müəlliflər dilin tədqiqində sahə metodunun mahiyyətini nəzəri cəhətdən şərh etmiş və onun daha səmərəli tətbiq edilməsinin sərhədlərini müəyyənləşdirmişlər. Dilçilikdə sahə nəzəriyyəsinin inkişaf etdirilməsində rus dilçilərinin mühüm rolu olmuşdur. V.Q.Admoni[1], E.V. Qulıqa və E.İ.Şendels[2], A,V.Bondarko[1] və başqalarının əsər-

---

[1] Адмони В.Г. Основы теории грамматики. М. – Л., 1964.

[2] Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексические поля в современном немецком языке. М., 1969.

lərində dil sahəsinin qurulmasının ümumi prinsipləri müəyyənləşdirilmişdir. Hazırda ümumi dilçilik ədəbiyyatında dilin sahə təhlilinin ümumi prinsip və kateqoriyaları müəyyənləşmişdir. Bu istiqamətdə tədqiqatçılar prinsipial məsələlərdə ümumi rəyə gəlmişlər. Həmin prinsipləri ümumiləşdirilmiş şəkildə təqdim etməzdən əvvəl başqa bir məsələni qeyd etmək lazımdır.

İstər sahə nəzəriyyəsinin ümumi nəzəri prinsiplərinin əsası qoyulduğu mənbələri, istərsə də sahə metodunun müəyyən dilin materialları əsasında araşdırılmaya tətbiq olunduğu dilçilik ədəbiyyatını nəzərdən keçirərkən bir cəhəti müşahidə etmək olur. Bu ondan ibarətdir ki, dilin sahə təhlilinin ümumi prinsip və kateqoriyaları barədə tədqiqatçılar prinsipial məsələlərdə ümumi rəyə gəlsələr də, bu, müxtəlif tədqiqatçıların irəli sürdüyü sahələrin tipinin və xarakterinin şərhindəki fərqləri istisna etmir. Qeyd etmək lazımdır ki, tədqiqatlarda sahələrin müxtəlif tipləri irəli sürülmüşdür. Bu barədə rusdilli ədəbiyyatda geniş şəkildə bəhs olunduğuna görə[2], biz onun üzərində geniş dayanmayıb, onlar haqqında qısa məlumat verəcəyik. Bu həm də azərbaycandilli auditoriyanın ehtiyacını ödəmək tələbindən irəli gəlir.

Beləliklə, dilçilik ədəbiyyatına müxtəlif tədqiqatçılar tərəfindən qrammatik sahə, leksik-qrammatik sahə, sintaktik sahə, morfem sahəsi, morfosemantik sahə, funksional-semantik sahə anlayış-terminləri daxil edilmişdir.

M.M.Quxman qrammatik modelləşdirmənin xüsusi struktur vahidi kimi ümumi bir termin – *qrammatik sahə*

---

[1] Бондарко А.В. Грамматическая категория и контекст. Л., Наука, 1971; Yenə onun: О функционально-семантических категориях // Actes du X$^{e}$ Congrès des linguistes, I / Ed. par A.Grant et al. Bucarest: Editions de l'Académie de la République Socialiste de Roumanie, 1969. P. 30-63; Yenə onun: Функциональная грамматика. Л., Наука, ЛО, 1984.

[2] Щур Г.С. Теория поля в лингвистике. М., 1974.

terminini təklif edir. Tədqiqatçı qrammatik sahənin qurulmasında qeyri-paradiqmatik vahidlərin paradiqmatik sistemlərlə özünəməxsus nisbət və bağlılığını nəzərə alır. Onun fikrinə görə, paradiqmatik sistemlər qrammatik sahənin qurulmasında aparıcı rola malikdir və onun nüvəsini təşkil edir, qeyri-paradiqmatik vahidlər isə sahənin periferiyasını əmələ gətirir. Nüvəni və periferiyanı əmələ gətirən vahidlər bir-birindən həm statusuna, həm də xarakterinə görə fərqlənir. Bu vahidləri yalnız anlayış ümumiliyi birləşdirir[1].

N.İ.Filiçeva dilçiliyə *sintaktik sahə* terminini gətirir. O, müasir alman dilinin materialı əsasında sahə ideyasını feli söz birləşmələri arasındakı semantik-sintaktik uyarlığın araşdırılmasına tətbiq edir və feli söz birləşmələrini makro- və mikrosahə strukturları kimi təsvir edir[2].

E.A.Makayev dildə müəyyən bütövlük əmələ gətirən qrammatik kateqoriyaların toplusu üçün *morfem sahəsi* terminini istifadə edir[3].

Q.S.Şur german dillərində gələcək zamanın və vasitəli şəklin xüsüsiyyətlərini *morfosemantik sahə* metodu ilə tədqiq etmişdir. Morfosemantik sahə ideyası, semantik (məzmun planı) və ya morfoloji (ifadə planı) olmasından asılı olmayaraq ümumi diferensial əlamət anlayışına əsaslanır. Morfosemantik sahələr, alimin qənaətinə görə, həm leksika, həm də qrammatika üçün tipikdir[4].

E.V.Qulıqa və E.İ.Şendelsin sahə nəzəriyyəsinə gətirdikləri leksik-qrammatik makro- və mikrosahə ideyası, tədqiqatçıların qənaətinə görə, belə bir zərurətə əsaslanır ki, sahəyə aid

---

[1] Гухман М.М. Грамматическая категория и структура парадигм // Исследования по общей теории грамматики. М., 1968, с. 170.
[2] Филичева Н.И. Синтаксические поля. М., Высшая Школа, 1977.
[3] Вах: Гухман М.М. Грамматическая категория и структура парадигм // Исследования по общей теории грамматики. М., 1968, с. 168.
[4] Щур Г.С. Теория поля в лингвистике. М., 1974.

qrammatik tədqiqatların sərhədlərini paradiqmatik dəstlərlə (nabor) müəyyənləşən formaların hüdudlarından kənara çıxmaqla genişləndirmək lazımdır. Bu ideyada leksik və qrammatik mənaların qarşılıqlı əlaqələri, leksik materialın qrammatik formalara əsas təsir xətləri və s. problemlər geniş şəkildə işlənib hazırlanmışdır. Alimlər bir şeydə əmindirlər ki, leksik faktların qrammatika sferasına cəlb edilməsi yeni faktların üzə çıxarılmasına meydan açır. Bir-birilərindən tədric edilmiş şəkildə işləyən qrammatistlər və leksikoloqlar bəzən həmin faktları nəzərdən qaçırırlar. Tədqiqatçılar özlərinin qeyd edilən nəzəri müddəalarını alman dilinin leksik-qrammatik sahələrinin strukturlaşdırılmasında tətbiq etmişlər[1].

Müxtəlif dil səviyyələrinə aid ifadə vasitələrinin vahid sistemdə nəzərdən keçirilməsi müasir dilçilikdə funksional-semantik yanaşma metodu ilə bağlıdır. Belə yanaşmada «funksiya» termini funksional-semantik sahə nəzəriyyəsi ilə bağlı olaraq daha geniş şəkildə anlaşılır. Funksional-semantik sahələr problemini ortaya ilk dəfə görkəmli rus linqvisti A.V. Bondarko dilçilikdə qoymuşdur. Alim bu konsepsiyasını morfologiyası geniş inkişaf etmiş dillər əsasında işləyib hazırlamışdır. Qrammatika sistemində morfoloji kateqoriyaların aparıcı rola malik olması barədə fikri müdafiə etməklə, tədqiqatçı onu da vurğulayır ki, morfoloji kateqoriyalar sintaktik yönümə malikdir. Bu səbəbdən A.Bondarko morfoloji formaların məna və funksiyalarını özündə ehtiva edən funksional morfologiya kimi xüsusi bir sahənin ayrılmasını məqsədəuyğun sayır. Müxtəlif funksional-semantik sahələrin təsvirini verməklə tədqiqatçı rus dilinin funksional qrammatikasını hazırlamışdır. Funksional-semantik sahələrin bölünməsi və təsviri A.Bondarkonun tədqiqatlarında bütövlükdə qrammatika üçün vahid kateqorial

---

[1] Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексические поля в современном немецком языке. М., 1969.

əsasa söykənir. Tədqiqatçının qənaətinə görə, funksional-semantik sahə dilin qrammatik (morfoloji və sintaktik) vasitələri və onlarla qarşılıqlı əlaqədə olan, eyni semantik zonaya aid leksik, leksik-qrammatik və sözyaratma ünsürləri ilə formalaşan ikitərəfli (məzmun-forma) bütövlüyüdür[1].

Sahə metodunu rus dilinin bir sıra funksional-semantik (qrammatik-leksik) laylarının araşdırılmasına tətbiq edən A. Bondarko strukturun daxili təşkilinin xarakterinə görə morfoloji kateqoriyanın mərkəz kimi çıxış etdiyi qrammatik-leksik qruplaşmaları «funksional-semantik sahə» adlandırmağın daha düzgün olması qənaətinə gəlir. Göründüyü kimi, burada söhbət iki sahədən – *funksional-semantik sahə və leksik-qrammatik sahə*dən gedir. Əslində funksional-semantik sahə və leksik-qrammatik sahə bir-birindən yalnız terminoloji cəhətdən fərqlənir. Burada eyni bir hadisənin müxtəlif tərəfləri vurğulanır. Funksional-semantik sahə termini sahənin konstituentlərinin semantik funksiyasının ümumiliyi ilə birləşdiyini göstərir. Leksik-qrammatik sahə termini isə, onun fikrincə, sahənin müxtəlif dil səviyyələrinə aid olan konstituentlərdən təşkil olunmuşdur.

Dilçilikdə sahə nəzəriyyəsinə qısa baxışdan sonra sahənin qurulma prinsiplərini də yığcam şəkildə nəzərdən keçirmək məqsədəuyğun olardı. Mövcud prinsiplərə görə, dil sahəsi mürəkkəb bir qurum olub, özündə aşağıdakı xarakterik əlamətləri ehtiva edir:

1. Sahənin onu təşkil edən konstituentlərin hər birinə az və ya çox dərəcədə xas olan ümumi invariant mənaya malik olması.

2. Dilin müxtəlif səviyyələrinə aid olan, sistem əlaqələri ilə birləşən, sahədə avtonomluq dərəcəsinə görə müxtəlif va-

---

[1] Бондарко А.В. Принципы функциональной грамматики и вопросы аспектологии. Л., 1983, с.40.

sitələrin mövcud olması. Sahədə birləşən müxtəlif vasitələr onun konstituentləri adlanır və 1) bir-birinə münasibətdə müəyyən mövqe ilə, 2) paradiqmatik və sintaqmatik cəhətdən üzə çıxarılan kvantitativ müəyyənliklə xarakterizə olunur.

3. Hər bir sahə struktur cəhətdən mikrosahələrə, onlar da öz növbəsində daha kiçik sahələrə bölünür.

4. Konstituentlərinin polisemantik xarakterinə görə sahənin strukturu açıqlığı ilə səciyyələnir. Bu isə obyekti təkcə onun tərkib hissələri cəhətdən yox, eyni zamanda digər qonşu ünsürlərlə qarşılıqlı əlaqələri baxımından nəzərdən keçirməyə imkan verir.

5. Tərkib hissələrinin tədrici keçid və əvəzlənmələri, ümumi seqmentlərin meydanda olması.

6. «Mərkəz-periferiya» üzvlənməsi. Belə üzvlənmə sahənin strukturunda qrammatik kateqoriyanın aparıcı rolunu əks etdirir. Sahənin strukturunda aparıcı rol oynayan qrammatik kateqoriya öz ətrafında digər müxtəlifsəviyyəli qurumları cəmləşdirə bilmək xassəsinə malikdir[1].

Sonuncu müddəaya görə sahənin mərkəzini və ya nüvəsini müvafiq qrammatik kateqoriya təşkil edir. Nüvəyə daxil olan ünsürlər sahənin aparıcı komponentləri kimi fəaliyyət göstərir. Bu ünsürlər ona görə aparıcı komponentlər kimi qəbul edilir ki, onlar sahənin daşıdığı ümumi anlayışı, invariant mənanı ifadə etmək üçün maksimal dərəcədə xüsusiləşmişdir. Sahənin qalan qeyri-kateqorial komponentlərində başqa qrammatik kateqoriyalar üçün səciyyəvi əlamətlər mövcud ola bilər. Bu səbəbdən həmin komponentlər sahənin periferiyasını təşkil edir. Onlar marginal komponentlər adlandırılır. Sahənin nüvəsini əmələ gətirən ünsürlərdən biri dominant rolunu oynayır. Dominant ünsür sahənin strukturunda xüsusi mövqeyə

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии. Автореф. дисс. ... докт. филол. наук. Краснодар, 1993, с.14.

malik olur. Xüsusi mövqeyə malik olmaq üçün həmin dominant ünsür, əvvələn, sözügedən semantik əlamətin ifadə edilməsində ən çox ixtisaslaşmış vasitə, ikincisi, həmin mənanın nitqdə ifadəsində ən məhsuldar üsul olmalıdır. Sahənin dominantı morfologiya, sintaksis və ya leksikaya aid ola bilər. Sahənin tərkibinə daxil olan mikrosahələrin hər birində özünün aparıcı konstituenti və ya dominantı mövcud olur. Dominantın ətrafında adətən onunla sıx əlaqəli olan konstituentlər qruplaşır. Onlar da ya dominantla birgə nüvəni təşkil edir, ya da nüvəətrafı zonanı əmələ gətirir.

Yuxarıda qeyd edildiyi kimi, funksional-semantik sahə və leksik-qrammatik sahə terminləri eyni bir hadisəni müxtəlif yöndən işıqlandırır. Hər iki terminin məna həcmlərini nəzərdən keçirdikdə onların ümumən sahənin struktur təbiəti, komponentlərin üzvlənmə səmərəliliyi, sahənin konstituentlərinin əlaqə vəhdəti, daxili dinamizmi ilə fəal səsləşdiyi aydın olur. Bu səbəbdən də funksional-semantik sahə və ya leksik-qrammatik sahə terminlərindən hansısa birinə üstünlük verməyinin daha məqsədəuyğun olması barədə bəhs etmək heç bir əhəmiyyət daşımır.

Beləliklə, bu tədqiqatda temporallıq kateqoriyası Azərbaycan dilçiliyində ilk dəfə olaraq vahid invariant məna əlamətinə malik olan ifadə variativliyi, leksik-qrammatik və ya funksional-semantik sahə kimi nəzərdən keçirilir.

## 2.2. Temporallıq sahəsinin strukturu

Temporallıq kateqoriyası ən ümumi dil zamanı anlayışıdır. Bu kateqoriya, bir tərəfdən, obyektiv, real zamanla, digər tərəfdən, konseptual və perseptual zaman anlayışı ilə əlaqədar olaraq universal xarakter daşıyır. Temporallıq kateqoriyasının universal xarakteri onun bütün dünya dillərində mövcud olma-

sı və hər bir konkret dilin bütün səviyyələrini əhatə etməsi ilə şərtlənir.

Dildə zaman kateqoriyasını və ya temporallığı müxtəlif yönlərdən öyrənmək olar. Temporallığın öyrənilməsi üsullarından biri bu kateqoriyanın sahə metoduna əsasən modelləşdirilməsidir. Qeyd olunan kateqoriyaya sahə metodu ilə yanaşma bir tərəfdən müxtəlif dillərin materiallarına əsasən özünün məqsədyönlü və faydalı olduğunu sübut edir[1], digər tərəfdən zaman münasibətlərinin insan şüuru ilə qavranılması, onların dil vasitələri ilə təsbit edilməsinin xarakterini nəzərə almağa imkan verir. Temporallığın hər hansı bir dilin materiallarına əsasən sahə modelləşdirilməsi həmin dilin arsenalında zaman münasibətlərinin və əlaqələrinin bütün məna çalarlarının verilməsi üçün mümkün olan bütün çoxsaylı və rəngarəng ifadə imkanlarını ehtiva etməyə şərait yaradır. Ümumiyyətlə, hər hansı bir sahənin modelləşdirilməsi ümumi və təkcə münasibəti ilə bir-birinə aid makro- və mikrosistemlərin qarşılıqlı əlaqə və nisbətinə əsaslanan sistem münasibətlərinin aşkara çıxarılmasından ibarətdir. Modelləşdirmə modeli qurulan sahənin məzmun və ifadə planlarını ortaya qoyur.

Temporallıq sahəsinin məzmun planı hərəkət, hadisə və ya vəziyyətin zaman səciyyəsi və xarakteristikasından ibarətdir. Hərəkət, hadisə və ya vəziyyətin zaman səciyyəsi danışanın və ya subyektin zaman münasibətlərinin hesablanma və ya istinad nöqtəsi kimi qəbul etdiyi nitq momentinə hərəkət, hadisə və ya vəziyyətin nisbətini göstərir. Məhz məzmun planı temporallıq sahəsinin kommunikativ xarakterini müəyyən edir. Kommunikativ xarakter insanın obyektiv, fiziki zaman

---

[1] Вах. Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990; Бондарко А.В. Функциональная грамматика. Л., Наука, ЛО, 1984; Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексические поля в современном немецком языке. М., 1969; Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998.

və onun xassələri haqqında təsəvvürlərini özünün dilində temporal məna vahidləri ilə əks etdirir. Temporallıq sahəsinin ifadə planı müxtəlif səviyyəli dil vasitələrinin heterogen məcmusuna əsaslanır. Belə vasitələrin təbiəti məqsədyönlülüyü, kommunikasiyada seçim üstünlüyü ilə müəyyən olunur. Dildə temporallığın ifadə vasitələrinin nomenklaturası çox zəngindir.

Temporallıq sahəsinin məzmun və ifadə planları onu şaquli və üfüqi istiqamətlərdə nəzərdən keçirməyə imkan verir. Başqa cür ifadə etsək, temporallığın məzmun və ifadə planları onun şaquli və üfüqi strukturunu ortaya qoyur.

Temporallıq sahəsinin şaquli struktur üzrə üzvlənməsi dilin müxtəlif səviyyələrinə aid ifadə vasitələrinin, invariant zaman semantikasının, semantik funksiyanın onu reallaşdıran funksional vahidlər arasında paylanma nisbətində ifadə olunur. Temporallıq sahəsinin üfüqi struktur üzrə üzvlənməsi isə həmin invariant mənanın makro- və mikrosahələr üzrə bölgüsünü nəzərdə tutur. Başqa sözlə, «şaquli üzvlənmə müxtəlif ifadə laylarını, konstituentlər arasındakı semantik-struktur və funksional asılılıq nizamını meydana çıxarırsa, üfüqi üzvlənmədə konkret diferensial semantik əlamətə uyğun gələn və həmin əlamətin reallaşdırıcısı kimi çıxış edən komponentlərin məna qruplaşması, aparıcı dil elementlərinə, ifadə leytmotivinə çevrilmə xassəsi əks olunur. Belə çoxplanlı, çoxkeçidli çarpazlaşma prizmasından istər makro-, istərsə də mikrosahələri mərkəzi və ucqar (periferik) fiqurların mürəkkəb semantik-funksional əlaqələr şəbəkəsi kimi təsəvvür etmək olar»[1].

Adətən sahənin aparıcı struktur elementi morfoloji kateqoriya olduqda belə sahələr struktur tipinə görə monosentrik və güclümərkəzləşmiş sahə adlandırılır[2]. Bu cür sahənin mərkəzini və ya nüvəsini morfoloji kateqoriya təşkil edir, onun

---

[1] Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998, s. 19.

[2] Бондарко А.В. Функциональная грамматика.Л., Наука, 1984, с. 61.

struktur nizamı sadə və aydın olur. Temporallıq da belə sahələrdəndir. Onun əsas, aparıcı elementi morfoloji zaman kateqoriyasına əsaslanır. Temporallıq sahəsinin strukturu sahəni təşkil edən komponentlərin əsas əlaqə formasını ifadə edir.

Sahə strukturuna görə «mərkəz–periferiya» bölgüsü dilçilik ədəbiyyatında çox müzakirə olunan mövzulardandır. Mərkəz – periferiya struktur tipinin müəyyənləşdirilməsində bir çox diferensial əlamətlər (əlaqələr) əsas götürülür. Belə ki, mərkəz – periferiya struktur tipini müəyyənləşdirmək üçün E.Qulıqa və E.Şendels üç binar cütü əsas götürür: 1) müvafiq məna bütövlüyünün ifadəsi üçün daha yüksək «ixtisaslaşma» səviyyəsi (mərkəz üçün) – həmin ifadə ixtisaslaşmasının nisbi zəifliyi (periferiya üçün); 2) mənanın ifadəsinin vasitəsiz xarakteri (mərkəz üçün) – mənanın ifadəsinin yayğınlıq və vasitəli xarakteri (periferiya üçün); 3) işlənmə müntəzəmliyi (mərkəz üçün) – işlənmə müntəzəmliliyinin aşağı həddi (periferiya üçün)[1].

V.Q. Admoni sahədaxili əlaqələrin qarşılaşdırılmasında bir cütlüyü əsas götürür: əlamətlərin tamlığı və intensivliyi (mərkəz üçün) – həmin tamlıq və intensivliyin getdikcə zəifləməsi (periferiya üçün)[2].

A.Bondarko əsas binar cütlüklərin sayını beşə çatdırır: 1) spesifik əlamətlərin maksimal konsentrasiyası (mərkəz üçün) – spesifik əlamətlərin zəifləməsi, struktur gərginliyin zəifləməsi, kontaktlıq-diffuzluq (periferiya üçün); 2) qarşılaşdırmalar sistemində daha fəal iştirak etmək (mərkəz üçün) – əlaqələr şəbəkəsinin yayğınlığı və zəifliyi, müəyyən təcridlik meydana çıxması (periferiya üçün); 3) maksimal funksional yüklənmə (mərkəz üçün) – funksional yüklənmənin zəifləməsi (periferi-

---

[1] Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексические поля в современном немецком языке. М., 1969, с. 10.
[2] Адмони В.Г. Грамматический строй как система построения и общая теория грамматики. Л., 1988, с. 55.

ya üçün); 4) müəyyən semantik funksiyanın reallaşması üçün daha yüksək ixtisaslaşma səviyyəsi (mərkəz üçün) – müəyyən semantik funksiyanın reallaşması üçün ixtisaslaşmanın aşağı səviyyəsi (periferiya üçün); 5) müvafiq dil elementinin müntəzəmliyi, yüksək işlənmə tezliyi (mərkəz üçün) – qeyri-müntəzəmlik və ya az müntəzəmlik, işlənmə tezliyinin aşağı səviyyəsi (periferiya üçün)[1].

S.Abdullayev bu əlamətləri əsas götürməklə onlara daha bir cütlüyün əlavə edilməsini zəruri sayır: maksimal neytrallıq və optimallıq (mərkəz üçün) – nüvə qatından uzaqlaşdıqca neytral üslub layının seyrəkləşib-zəifləməsi və affektiv-psixoloji başlanğıcın güclənməsi (periferiya üçün)[2]. O, sahə prinsipini «sözün geniş mənasında həm də sistem əlaqələri ilə birləşən ən müxtəlif ifadə vasitələrinə üslubi yanaşma texnikası» kimi qəbul edir: « ... istər leksik-semantik sahə daxilində dominant anlayış, başcıl semantik münasibət ifadə edən neytral söz-nüvə, istərsə də funksional-semantik sahənin ucqarlarına doğru getdikcə sərbəstlik, bununla da emosional fəallaşma üçün nisbi imkan açılır. Əksinə, sahənin mərkəzinə doğru gəldikcə, ekspressivləşmə imkanının zəifləməsi, affektiv-iradi başlanğıcın neytrallaşması prosesi başlayır»[3].

Temporallıq sahəsi üçün mərkəz–periferiya komponentlərini aşağıdakı kimi müəyyənləşdirmək olar: - temporallıq sahəsinin nüvəsini qrammatik zaman, yəni felin zamanlar sistemi təşkil edir. Felin zamanlar sistemi dildə zaman kateqoriyasının – temporallığın maksimal şəkildə ümumiləşmiş və mücərrədləşmiş ifadə vasitəsidir. Lakin dildə zaman felin zaman

---

[1] Бондарко А.В. К теории поля в грамматике - залог и залоговость (на материале русского языка) // Вопросы языкознания. 1972, № 3, с. 20-24

[2] Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998, s. 22.

[3] Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998, s. 22.

formaları ilə yanaşı başqa vasitələrlə də ifadə olunur. Başqa vasitələrə leksik, sintaktik, leksik-sintaktik, leksik-qrammatik vasitələr daxildir. Lakin dildə zamanın əks etdirilməsində morfoloji vasitələr leksik, sintaktik, leksik-sintaktik, leksik-qrammatik vasitələrdən ayrılmazdır. Hər bir səviyyənin vahidləri reallıqla müxtəlif cür əlaqələnir: zamanın leksik ifadə vasitələri temporallıq sahəsinin periferiyasını təşkil edir. Buna baxmayaraq, leksik zaman göstəricilərinin zaman kəsiklərini qrammatik zaman vasitələrinə nisbətən situasiya ilə birbaşa əlaqələndirməsi daha güclüdür. Qrammatik zaman formaları və leksik vahidlər arasında əlaqə kommunikativ səviyyədə müəyyənləşir ki, bu da ya qarşılıqlı semantik əlaqədən, ya da funksional kompensasiyadan ibarət olur.

### 2.2.1. Temporallıq sahəsinin şaquli strukturu

Artıq yuxarıda qeyd edildiyi kimi, temporallıq sahəsinin şaquli struktur üzrə üzvlənməsi  dilin müxtəlif səviyyələrinə aid ifadə vasitələrinin, invariant zaman semantikasının, semantik funksiyanın onu reallaşdıran funksional vahidlər arasında paylanma nisbətində ifadə olunur.

Deyilənləri nəzərə alaraq, qarşılaşdırılan Azərbaycan və ingilis dillərində temporallıq sahəsinin şaquli struktur üzrə üzvlənməsini və hər iki dil üçün mərkəz–periferiya komponentlərini müəyyənləşdirməyə çalışaq.

Temporallıq sahəsinin nüvəsini qrammatik zaman kateqoriyası, yəni nitq momentinə və ya hər hansı başqa hesablanma nöqtəsinə görə eynizamanlılıq, öncəgəlmə və sonragəlmə kimi diferensial əlamətlərlə bir-biri ilə qarşılaşdırılan qrammatik  formalar sistemi təmsil edir. Azərbaycan dilində zaman kateqoriyası təsriflənən fel formaları çərçivəsində xəbər şəkli ilə məhdudlaşır.

Azərbaycan dilində felin xəbər şəklinin zamanlar sistemi üçüzvlü oppozisiyada aşağıdakı formalardan təşkil olunmuşdur: 1) indiki zaman forması [-*(y)ır*$^4$, -*(y)ırdı*$^4$, -*(y)ırmış*$^4$ şəkilçiləri ilə düzələn forma]; 2) keçmiş zaman formaları: a) şühudi keçmiş zaman [-*dı*$^4$ şəkilçiləri ilə düzələn forma]; b) nəqli keçmiş zaman [-*mış*$^4$, -*(y)ıb*$^4$, - *mışmış*$^4$, -*(y)ıbmış*$^4$ şəkilçiləri ilə düzələn forma]; 3) gələcək zaman formaları: a) qəti gələcək zaman [-*(y)acaq*$^2$, -*(y)acaqdı*$^2$, -*(y)acaqmış*$^2$ şəkilçiləri ilə düzələn forma]; b) qeyri-qəti gələcək zaman [-*(y)ar*$^2$, -*(y)ardı*$^2$, -*(y)armış*$^4$ şəkilçiləri ilə düzələn forma].

Azərbaycan dilində felin zaman formalarının tərkibi barədə müəyyən fikir ayrılıqları olsa da[1], bütövlükdə üç zamanla təmsil olunan beş formanın mövcudluğu şübhə doğurmur. Biz burada zaman və sıra kateqoriyalarının qarşılıqlı münasibətindən irəli gələn zaman fonlarını da nəzərə alırıq[2].

Üç cərgədə birləşən beş zaman forması temporallıq sahəsinin keyfiyyət spesifikasını müəyyən edən əsas əlamətlərin təsriflənən zaman formaları sistemində maksimal şəkildə konsentrasiyaolunma, ümumi zaman münasibətlərinin ifadəsi üçün ən çox ixtisaslaşma və işlənmə müntəzəmliyi kimi əlamətlər məcmusuna görə səciyyələnir.

Sahənin periferiyasını təşkil edən konstituentlərin üzərində dayanmazdan öncə qeyd edək ki, funksional-semantik sahədə nüvədən periferiyaya keçiddə onun struktur elementlərinin münasibətlərində tədricilik, kontinuallıq nəzərə çarpır və bu mərkəz (nuvə)–periferiya strukturu üçün tamamilə tipik ha-

---

[1] Bax: Müasir Azərbaycan dili. II cild, Morfologiya, Bakı, Elm, 1980, s. 320-345; Hüseynzadə M. Müasir Azərbaycan dili. Morfologiya. 3- cü hissə. Bakı, Maarif, 1983, s. 189-198; Гаджиева Т.А. Система форм прошедшего времени глагола в современном азербайджанском языке . Автореф. дисс. ... канд. филол. наук. М., 1958.

[2] Axundov A. Türk dillərində zaman və sıra kateqoriyalarının qarşılıqlı əlaqəsi // Ağamusa Axundov. Dil və Ədəbiyyat. I cild, s. 260-266.

disədir. Burada yaxın periferiya və ya nüvəətrafı zonadan söhbət gedir. Buraya aid edilən komponentlər sahənin nüvəsini təşkil edən fel formaları ilə birbaşa əlaqələrini hələ tam itirməmişdir. Birbaşa əlaqələrini tam itirmədikləri üçün onları nüvəətrafı zonaya aid etməyə əsas vardır. Həmin komponentlər aşağıdakılardır:

1. Feli sifətlər və onların əmələ gətirdikləri tərkiblər (*dayanmış, ağaran, yazılacaq, uzun həyat yolu keçmiş, özünə azmaz hörmət qazanmış, öz qədrini bilən, məktəbi bitirən, münasibətləri qura biləcək*).

2. Feli bağlamalar və onların əmələ gətirdikləri tərkiblər (*səhər yuxudan duranda, nəhəng ayını görcək, küçəni keçərkən, küçələri keçdikcə, gün doğmamış*).

İstər feli sifət və feli bağlama, istərsə də onların əmələ gətirdikləri tərkiblər müstəqil zaman ifadə etmir. Onların ifadə etdiyi zaman həmişə cümlədəki əsas hərəkətin zamanı ilə əlaqədar olur, yəni onların ifadə etdiyi hərəkətin zamanı cümlədəki əsas hərəkətin zamanından ya öncə baş verir, ya onunla eynizamanlılıq təşkil edir, ya da ondan sonra baş verəcəyini bildirir. *Amma bu gülüşlər səngiyəndə o, aydınca bir səs də eşitdi* (İ.Şıxlı). *O, əlləri titrəyə-titrəyə suyu aldı* (İ.Şıxlı). *Uşağın tökdüyü pulları nəzarətçi yığıb apardı* (Ə.Cəfərzadə). *Maya ilk dəfə qayınanası ilə necə görüşəcəyi haqqında fikirləşirdi* (M.İbrahimov).

Bu səbəbdən həmin vahidlərin əmələ gətirdikləri konstruksiyalar nüvəətrafı zonaya aid edilir.

3. Xəbərlik şəkilçilərinin, *vardır/yoxdur* sözlərinin işləndiyi indiki zaman mənalı sintaktik konstruksiyalar və həmin konstruksiyaların zaman nisbətini dəyişdirən *idi, imiş,* (onların ixtisar olunmuş formaları (*-dı*$^4$, *-mış*$^4$) daxil olmaqla) və *olmaq* köməkçi fellərinin işləndiyi sintaktik konstruksiyalar (*Müəllimən/sən/dir; Oktyabrın axırıdır; Soyuqdur; Gecədir; O bağdadır; Nazim evdə yoxdur; Görməyə çoxlu iş var(dır)* və s.).

Qeyd olunmuş nümunələr təktərkibli və cüttərkibli cümlələrin müxtəlif növlərinə aiddir. Bu nümunələri birləşdirən ümumi cəhət ondan ibarətdir ki, onların zaman nisbətlərini dəyişdirmək üçün *idi, imiş,* (onların ixtisar olunmuş formaları (*-dı*$^{4}$, *-mış*$^{4}$)) və *olmaq* köməkçi fellərinin işləndiyi konstruksiyalardan istifadə olunur (*Müəllim idim*; *Oktyabrın axırı idi/imiş; Soyuq idi/olacaq; Gecə idi; O bağda idi/olacaq; Nazim evdə yox idi/imiş; Görməyə çoxlu iş var idi/imiş* və s.).

Buraya adlıq cümlələri də əlavə etmək olar. Adlıq cümlələr də indiki zaman mənalı sintaktik konstruksiyalara aiddir. Amma həmin konstruksiyaların digər növlərindən fərqli olaraq, *idi, imiş* köməkçi felləri ilə adlıq cümlələrin zaman nisbətlərini dəyişdirmək mümkün deyil. Məsələn: *Kişinin evi. **Axşam*** (Elçin). *Kişinin evi. **Bazar günü. Səhər***. (Elçin)

Nümunələrdəki «Axşam.» və «Bazar günü.» «Səhər.» adlıq cümlələrdir. *İdi* və *imiş* felləri ilə işləndikdə həmin cümlələr ismi xəbərli şəxssiz cümlələrə çevrilir. Ənənəvi fikrə görə, adlıq cümlələrin xəbəri, şəxssiz cümlələrin mübtədası olmur. Son tədqiqatlarda adlıq cümlələri şəxssiz cümlələrlə yaxınlaşdırmaq meylləri müşahidə edilir. Q.Kazımov hərtərəfli araşdırmaları ilə «adlıq cümlələrlə şəxssiz cümlələr qədər bir-birinə yaxın cümlə növü yoxdur» nəticəsinə gəlir[1]. O, şəxssiz cümlələrdə hərəkətin icraçısının, əlamətin daşıyıcısının adının çəkildiyini və predikativliyin konkret morfoloji əlamətlər olan *-dır*$^{4}$ şəkilçisi, *idi, imiş* köməkçi sözləri ilə yaradıldığını göstərir. Adlıq cümlələrdə də hərəkətin icraçısının, əlamətin daşıyıcısının adı çəkilir, predikativlik isə təbii-morfoloji vasitələrlə deyil, intonasiya vasitəsilə yaradılır. «... İntonasiya fikrin ifadəsi prosesində predikativliyin qrammatik ifadəçisinə çevrilir. ... Adlıq cümlələrdə predikativlik intonasiya ilə reallaşan hadisələrin indiki zamanda mövcud olduğunu təsdiq edən sintaktik

---

[1] Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, s. 191

zaman və sintaktik modallıq əsasında yaranır»[1]. Onun fikrinə görə, təsdiq formasında olan adlıq cümlələrdə varlığın yalnız indiki zaman kəsiyində mövcudluğu təsdiq edilir. Adlıq cümlələrin şəxssiz cümlələrlə müəyyən mənada eynitipli cümlələr olduğunu vurğulayan Q.Kazımov həmin sintaktik vahidlərlə ifadə olunan fikri başqa zamanlara aid etməyin mümkün olduğunu qeyd edir: «Adlıq cümlələrlə ifadə olunan fikri keçmiş zamana aid etmək üçün şəxssiz cümlələrdən, gələcək zamana aid etmək üçün cüttərkibli cümlələrdən istifadə etmək olar»[2].

Adlıq cümlələr də digər indiki zaman mənalı sintaktik konstruksiyalar kimi temporallıq sahəsinin nüvəətrafı zonasına aiddir.

İndiki zaman mənalı konstruksiyalar müxtəlif dillərdə mövcuddur və müxtəlif şəkildə şərh olunur. Geniş yayılmış fikirlərdən biri həmin konstruksiyaların sintaktik zamanın paradiqması olması anlayışına əsaslanır[3]. Sintaktik zamanı məhz belə konstruksiyalar nümayiş etdirir.

Nüvəətrafı zonaya aid edilən bu konstruksiyalar temporallıq sahəsində xüsusi yer tutur. Onların nitqdə işlənmə müntəzəmliyi heç də az deyildir. İndiki zaman mənasının müxtəlif variantları öz ifadəsini bu konstruksiyalarda tapır. İndiki zaman semantikasının ifadə üsulu  verbal morfolji üsul olmasa da, belə halda morfoloji vasitələrlə (*idi // olacaq* ilə) əlaqə və ya nisbətin olması göz qabağında olur. Zaman mənasının sintaktik ifadə forması isə qrammatik vasitədir. Bütün bunlar həmin konstruksiyaları temporallıq sahəsinin mərkəzi (nüvəsi) ilə yaxınlaşdırır. Bir cəhəti də qeyd etmək lazımdır. Bu konstruksiyalar zaman mənasını təqdimetmə üsulu baxımından iş, hal və hərəkətin indiki, keçmiş və gələcək zaman arasında paylaşmasını açıq-aşkar şəkildə göstərən fel formalarının iş-

---

[1] Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, s. 192.
[2] Yenə orada, s. 192.
[3] Бондарко А.В. Теория морфологических категорий, Л., 1976, s. 16-25.

ləndiyi konstruksiyalarla eyniləşdirilə bilməz. Buna baxmayaraq, onların arasındakı birbaşa əlaqə də itməmişdir.

Temporallıq sahəsinin uzaq periferiyasına aid edilən konstituentlər aşağıdakılar hesab oluna bilər:

1. Mürəkkəb cümlə daxilində budaq cümləni baş cümləyə bağlayan *onda, onda ki, o vaxt, o vaxt ki, o zaman, o zaman ki, elə bir vaxtda, elə ki, o vədə, haçan, nə vaxt, nə zaman* tipli zaman anlayışlı bağlayıcı sözlər.

***O vaxt ki****, Yer üzünü su basdı və* ***o vaxt ki****, Nuhun gəmisi üzməyə başladı, bir nəfər suda çapalaya-çapalaya qışqırdı* (Elçin). ***Haçan ki****, bir fikrə gəldin, yəni* ***haçan ki****, bağı mənə qaytarmaq istədin, bu telefonla zəng elə, bir saata qulluğunda hazıram* (Anar).

2. *İndi, dünən, sabah, bu gün, çoxdan, əvvəl, öncə, sonra, axşamdan sabahadək* tipli temporal zərflər.

*Ax,* ***indi*** *bu kolun dalında qulaq asıb eşidəydi ki, mən deyirəm: gedirəm özgəsinə.* (M.F.Axundov) ***Sabahdan axşamadək, axşamdan sabahadək*** *arvad kimi gərək dustaq alaçığın içində oturasan* (M.F.Axundov). *Əmiraslan bəyin övladı genə* ***dünən*** *də Ağcabədi bazarında dədələri osmanlıda kəsb etdiyi gümüş rəxtlərdən satırdılar* (M.F.Axundov). *Bir-iki gün Tbilisidə qalacaqdıq,* ***sonra*** *mehmanxanalarda qala-qala Qara dənizin sahilindən ötüb Şimali Qafqaza gedəcəkdik,* ***sonra*** *da Rostov - Bakı magistralı ilə evə qayıdacaqdıq* (Elçin)

3. *Əvvəl, sonra, qədər, kimi, bəri* tipli temporal qoşmalar.

*Doğrudan da səhərdən* ***bəri*** *heç nə yeməmişdi. Amma iştahı da yoxdu* (Anar). *O gecə Oruc səhərə* ***qədər*** *yata bilmədi* (Anar). *Həm də bir aydan* ***sonra*** *həftəlik adəti üzrə bağa baş çəkməsəydi bunun özü də şübhəli görünə bilərdi* (Anar).

4. *Zaman, vaxt, dövr, an, ay, il, həftə, gün, saat, dəqiqə, saniyə* tipli temporal isimlər.

***O vaxt** zaman, dövr bax, bunu diktə eliyirdi* (S.Səxavət). *...bir **an** çaşır; «ilahi, gör mən nə boyda adamam...»* (S.Səxavət)

5. *Əvvəlki, indiki, sonrakı, keçmiş, gələcək, cari* tipli temporal sifətlər.

*İndi də o **əvvəlki** vaxt deyil, qəzetdə, mitinqdə, hər yerdə səni yaş yuyub quru sərəcəklər ...* (Anar). ***Cari** ildəki ilk hesabatında Dünya Bankı 2015-ci ilədək MDB məkanında yoxsulluqla mübarizə sahəsində əldə olunacaq tərəqqidən söz açıb* (Xalq Qəzeti).

Bütün bunlar temporallığın leksik ifadə vasitələrinə aiddir. Temporallığın leksik ifadə vasitələrinin və ya temporal leksikanın funksiyaları situasiya və ya kontekstlə bağlı olaraq üzə çıxır. Onların əsas funksiyalarından biri qrammatik zaman formaları (=fel zamanları ) ilə ifadə olunan ümumi zaman münasibətlərini özünün konkret leksik mənasına görə dəqiqləşdirmək, konkretləşdirmək və lokallaşdırmaqdan ibarətdir. Temporal leksika felin zaman formasının xüsusi mənasının daha aşkar ifadəsinə yardım edir. Temporal leksikanın digər bir funksiyası isə fel formasının mənasını dəyişdirməklə situasiyanın zaman əlaqəsini birbaşa göstərməyə xidmət edir. Hər iki funksiyada temporal leksika müəyyən sintaktik mövqedə ifadə edilən sabit temporal mənaya malik olur.

Yuxarıda konkret dil vasitələri ilə ifadə olunmuş konstituentlər Azərbaycan dilində temporallıq funksional-semantik sahəsinin şaquli strukturunu əks etdirir.

İndi isə ingilis dili üçün temporallıq sahəsinin strukturunu təsvir edək. Azərbaycan dilində olduğu kimi, ingilis dilində də temporallıq sahəsinin nüvəsini felin zaman kateqoriyası təşkil edir. Zaman dünyanın əksər dillərində tam və hərtərəfli olaraq dinamik əlamətin daşıyıcısı olan nitq hissəsində – feldə ifadə olunmuşdur. Bunda təəccüblü heç bir şey yoxdur, çünki zaman hərəkətlə, inkişafla ayrılmaz şəkildə bağlıdır.

İngilis dilində də felin zamanları hərəkətin nitq momentinə münasibətinə görə müəyyən edilir, lakin nitq momentinə əsasən müəyyən edilmiş keçmiş, indiki və gələcək zamanlar xüsusi qrammatik qruplar əmələ gətirir. İngilis dilində temporallıq sahəsinin nüvəsini təşkil edən felin zamanları dörd qrup əmələ gətirir. Həmin qruplar ayrı-ayrılıqda istər semantik, istərsə də qrammatik cəhətdən vahid bütövlər təşkil edir.

İngilis dilində felin xəbər şəklinin zamanlar sistemi aşağıdakı formalardan təşkil olunmuşdur: 1) *Indefinite* zaman formaları: *Present Indefinite, Past Indefinite, Future Indefinite, Future Indefinite in the Past*; 2) *Continuous* zaman formaları: *Present Continuous, Past Continuous, Future Continuous, Future Continuous in the Past*; 3) *Perfect* zaman formaları: *Present Perfect, Past Perfect, Future Perfect, Future Perfect in the Past*; 4) *Perfect Continuous* zaman formaları: *Present Perfect Continuous, Past Perfect Continuous, Future Perfect Continuous, Future Perfect Continuous in the Past.*

Müasir ingilis dilində kateqorial mənalarının müəyyən edilməsi çətinlik törədən xeyli miqdarda formalar vardır. Onların zaman və ya tərz formaları kimi qəbul edilməsi məsələsi hələ də açıq qalmış hesab edilə bilər. Bu məsələdə biz V.N.Yartseva[1] və A.İ.Smirnitskinin[2] nəzəri baxışlarını əsas götürürük. İngilis dilində felin tərz-zaman formalarının həmin tədqiqatçılar tərəfindən qəbul edilmiş sxemi fel formalarının real fiziki zamanı əks etdirmək imkanlarını təhlil etməyə şərait yaradır. İngilis dilində, eləcə də digər german, habelə roman dillərində felin zaman formalarının kifayət qədər çox olması həmin dillərin daşıyıcıları olan xalqlarda zaman haqqında xüsusi təsəvvürlərin olması kimi izah olunmamalıdır. Bu, hər

---

[1] Ярцева В.Н. Историческая морфология английского языка. М.-Л., 1960.
[2] Смирницкий А.И. Морфология английского языка. М., 1956.

şeydən öncə, müxtəlif qrammatik formalarda təsbit olunan tərz mənalarının detallaşması ilə bağlı ola bilər.

Mərkəz (nuvə) – periferiya strukturu üçün tamamilə tipik hadisə olan, struktur elementlərin münasibətlərindəki tədricilik burada da nəzərə çarpır. Bu tədriciliyi təzahür etdirən komponentlər sahənin nüvəsini təşkil edən fel formaları ilə birbaşa əlaqələrini hələ tam itirməmişlər. Birbaşa əlaqələrini tam itirmədikləri üçün onları nüvəətrafı zonaya, yaxud da yaxın periferiyaya aid etməyə əsas vardır. Həmin komponentlər aşağıdakılardır:

1. Feli sifətlər və onların əmələ gətirdikləri tərkiblər.

2. Cerund və onun əmələ gətirdiyi tərkiblər.

Feli sifət, cerund və onların əmələ gətirdikləri tərkiblər cümlədə müstəqil zaman ifadə etmir. Onların ifadə etdiyi zaman həmişə cümlədəki əsas felin zamanı ilə əlaqədar olur. Onlar nisbi zamanın ifadəçisidir, yəni onların ifadə etdiyi hərəkətin zamanı cümlədəki əsas hərəkətin zamanından ya öncə baş verir, ya onunla eynizamanlılıq təşkil edir, ya da ondan sonra baş verəcəyini bildirir. Məsələn:

*This header should be the first thing seen* ***when viewing*** *this Project Gutenberg file. I sometimes hushed in my arms, sometimes dandled on my knee, sometimes watched* ***playing with daisies*** *on a lawn…*(Ch.Bronte). *Thence a narrow passage led into the hall:* ***in crossing*** *it, I perceived my sandal was loose…* (Ch.Bronte).

Feli sifətlərin nisbi periferik mövqeyinin təzahürlərindən biri onların zaman paradiqmalarının ikiüzvlü olmasından ibarətdir: keçmiş zaman forması və indiki zaman forması. Azərbaycan dilindən fərqli olaraq ingilis dilində feli sifətlərin gələcək zaman formaları yoxdur.

3. Analitik dil olan ingilis dilinin spesifik cəhətlərindən biri onda xüsusi sintaktik konstruksiyaların olmasıdır. Bu konstruksiyaları zaman və modallıq mənalarına malik olan qram-

matik-leksik konstruksiyalar adlandırırlar. Adi feli birləşmələrdən fərqli olaraq belə konstruksiyalarda tam və ya qismən desemantikləşmiş fel birinci komponent, məsdər və ya cerund forması isə ikinci komponent kimi işlənir. Əsas leksik nüvə kimi ikinci komponent çıxış edir. Konstruksiyanın zaman mənası isə bütövlükdə birləşmədə ehtiva olunur. Özlərinin yarımqrammatikləşmiş təbiətinə görə belə biləşmələr ingilis dilinin zaman mikrosahələrində morfoloji nüvə ilə leksik periferiya arasında aralıq qat təşkil edir, yəni belə birləşmələri temporallıq sahəsinin nüvəətrafı zonasına aid etmək üçün tam əsas vardır.

Buna keçmiş zaman mənalı *used + infinitive, would + infinitive* tipli birləşmələr nümunə göstərilə bilər. Bu birləşmələr keçmişdə təkrarən baş vermiş hərəkətləri ifadə etmək üçün istifadə edilir. Belə birləşmələr nitq prosesində az istifadə edilir.

Eyni fikri gələcək zaman mənalı *to be going + infinitive, to be about + infinitive, to be sure + infinitive, to be certain + infinitive, to be (un)likely + infinitive, to feel like + cerund, to be on the verge of + cerund, should||would like + infinitive, had better + infinitive, would rather + infinitive* tipli birşəmələrə də aid etmək olar.

4. *The sixth of March, 1886. Night. Late in November in the year 1885* tipli indiki zaman mənalı sintaktik konstruksiyalar və ya qeyri-felli cümlələr. Belə cümlələrdə fellər iştirak etmir, amma cümlənin ümumi məzmunu temporal səciyyə daşıyır.

İngilis dilində temporallıq sahəsinin periferiyasını təşkil edən komponentlər aşağıdakılar hesab olunur:

1. Mürəkkəb cümlə daxilində budaq cümləni baş cümləyə bağlayan *when, while, as, till, until, as soon as, after, scarcely…when, no sooner…than* tipli zaman mənalı bağlayıcılar.

2. *Now, today, yesterday, tomorrow, before, ago, after* tipli temporal zərflər.

3. *After, before, on, at, within, during, for, since* tipli temporal sözönülər.

4. *Time, period, week, month, day, minute, second, epoch* tipli temporal isimlər

5. *Present, past, future, current, previous, final, prior, contemporary* tipli temporal sifətlər.

İngilis dilində temporallığın leksik ifadə vasitələrinin və ya temporal leksikanın funksiyaları situasiya və ya kontekstlə bağlı olaraq üzə çıxır. Onların əsas funksiyalarından biri qrammatik zaman formaları, yəni felin zamanları ilə ifadə olunan ümumi zaman münasibətlərini özünün konkret leksik mənasına görə dəqiqləşdirmək, konkretləşdirmək və lokallaşdırmaqdan ibarətdir. Azərbaycan dilində olduğu kimi, ingilis dilində də temporal leksika felin zaman formasının xüsusi mənasının daha aşkar ifadəsinə yardım edir. Temporal leksikanın digər bir funksiyası isə fel formasının mənasını dəyişdirməklə situasiyanın zaman əlaqəsini birbaşa göstərməyə xidmət edir. Hər iki funksiyada temporal leksika müəyyən sintaktik mövqedə ifadə edilən sabit temporal mənaya malik olur.

### 2.2.2. Temporallıq sahəsinin üfüqi strukturu

Universal dildənxaric zaman anlayışı varlığın obyektiv mövcudluğunun indiki, keçmiş və gələcək sferalarına bölünməsini nəzərdə tutur. Bu bölünmə dilə proyeksiya olunduqda indiki, keçmiş və gələcək olmaqla üç semantik sferada təzahür edir. Göstərilən semantik sferalar temporallığın sahə strukturunda mikrosahələr şəklində təmsil olunur. Mikrosahələr adətən ümumi sahənin və ya makrosahənin tərkib hissələri kimi nəzərdən keçirilir. Məzmun və ifadə planında bu mikrosahələr müəyyən sərbəstliyə malik olur və bir-biri ilə müəyyən prinsip

əsasında əlaqələnir. Mikrosahə strukturu temporallıq makrosahəsinin üfüqi görünüşünü, eninə kəsiyinin çoxlaylılığını əks etdirir, yəni makrosahə onun tərkib hissələri kimi strukturlaşan mikrosahələrə bölündüyü kimi, mikrosahələrin özləri də daha kiçik sahələrə ayrılır. Başqa cür ifadə etsək, bu mikrosahələr özünü daxili funksional şəbəkələr, keçid zonaları kimi göstərir. Beləliklə, temporallıq makrosahəsi mikrosahə əmələ gətirən keçmiş zaman – indiki zaman – gələcək zamana bölündüyü kimi, həmin mikrosahələr də mərkəz – periferiya prinsipi üzrə invariant semantik əlamətin fərqlənməsində daha kiçik ifadə zonalarına bölünür. Həmin prinsip temporallığın sahə mikrosistemlərindən hər birində bütün element və xüsusiyyətlərin daxili struktur vəhdətini ifadə edir. Həmin prinsip eyni zamanda hər bir mikrosahənin onu əhatə edən digər sahə və yarımsahələri ilə rəngarəng əlaqə və münasibətlərini təzahür etdirir. Mikrosahələr qapalı avtonom birləşmələr olmadığına görə, onların konstituentləri öz aralarında funksional cəhətdən qarşılıqlı əlaqədə olur. Digər tərəfdən, müəyyən bir mikrosahənin dominantı olan və ya sahənin nüvəsini təşkil edən komponent qonşu mikrosahənin periferik komponenti kimi çıxış edə bilir.

Beləliklə, bu nəzəri şərhdən sonra qarşılaşdırdığımız Azərbaycan və ingilis dillərində temporallıq sahəsinin üfüqi strukturunu təsvir etməyə çalışaq.

### 2.2.2.1. Keçmiş zaman mikrosahəsi

Zaman anlayışı hind-Avropa və türk dillərində ən ümumi şəkildə feldə ifadə olunur. Zaman hərəkətlə ayrılmaz şəkildə bağlıdır. Buna görə də qarşılaşdırdığımız hər iki dildə mikrosahələrin nüvəsini felin müvafiq formaları təşkil edir.

Mikrosahənin modelini qurmaq üçün onun invariant mənasını təyin etmək lazımdır. Bəllidir ki, «keçmiş zaman danı-

şanın şüurunda maddiləşən faktların və təcrübələrin xronikasıdır»[1]. Beləliklə, keçmiş zaman anlayışı əşyalar, hadisələr və onların xüsusiyyətləri arasında əlaqəni müəyyənləşdirən semantik münasibətlərin elə bir növüdür ki, onun əsas məzmunu keçmiş sferasında əşyaları, hadisələri və onların xüsusiyyətlərini qarşılıqlı şəkildə əlaqələndirməkdir. Deməli, keçmiş zaman mikrosahəsi üçün vahid invariant məzmun hərəkət və ya prosesin keçmişə aid edilməsidir.

Azərbaycan dilində keçmiş zaman mikrosahəsi aşağıdakı kimi təsəvvür olunur.

Keçmiş zaman mənasının əsas morfoloji ifadə vasitələri şühudi keçmiş zaman [-*dı*$^4$ şəkilçisi ilə] və nəqli keçmiş zaman [-*mış*$^4$, -*(y)ıb*$^4$ şəkilçiləri ilə] formalarıdır. Bu formalarda keçmiş zaman mənası tam və birbaşa ifadə olunur. Buna görə də həmin formalar keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edir.

Azərbaycan dilində keçmiş zaman mənasının başqa zaman formaları ilə ifadə edilməsi hallarına da təsadüf etmək olar. Həmin formaları keçmiş zaman mənasının ikinci dərəcəli morfoloji ifadə vasitələri adlandıraraq, nüvəətrafı zonaya aid edirik. Onlar indiki [-*(y)ır*$^4$ şəkilçisi ilə] və qeyri-qəti gələcək [-*(y)ar*$^2$ şəkilçisi ilə] zaman formalarını ehtiva edir. İkinci dərəcəli morfoloji ifadə vasitələrinə feli sifət və feli bağlamaları da aid etmək olar. Feli sifət və feli bağlamaların nisbi zaman bildirməsi barədə yuxarıda bəhs etmişdik. Əlavə edək ki, onlar da nüvəətrafı zonaya aiddir.

Keçmiş zaman mikrosahəsinin periferiyasını keyfiyyətcə bir-birindən fərqlənən, sintaktik və leksik ifadə vasitələrindən ibarət iki lay təşkil edir. Birinci layda zaman mənası sintaktik səviyyədə çıxış edir, yəni sintaktik zaman özünün cümlə sə-

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии. Автореф. дисс. ... докт. филол. наук. Краснодар, 1993, с. 21.

viyyəsində əlaqə vasitələri, struktur sxemi ilə təzahür edir. İkinci layda temporallıq ayrı-ayrı sözlərin – zərflərin (*dünən, bildir, onda, yaxında* və s.), sifətlərin (*dünənki, bildirki, sabiq, keçmiş, əvvəlki* və s.), isimlərin (*dünən, dün, keçmiş* və s.), müxtəlif söz birləşmələrinin (*keçmiş günlərdə, dünən səhər, bir gün, günlərin bir günü, o gün* və s.) və frazeoloji vahidlərin (*Nuh əyyamından, dədə-babadan qalma, qədim zamanlarda(n), it ilində*) leksik mənalarında təzahür edir. Periferiya haqqında deyilmiş bu mülahizələr həm keçmiş zaman mikrosahəsi, həm də digər mikrosahələr üçün eynilik təşkil edir.

İndi ingilis dilində keçmiş zaman mikrosahəsinin komponentlərini müəyyənləşdirək:

Keçmiş zaman mənasının əsas morfoloji ifadə vasitələri dörddür: *Past Indefinite, Past Continuous, Past Perfect, Past Perfect Continuous*. Temporallıq sahəsinin nüvəsini qrammatik zaman kateqoiyası təşkil etdiyi kimi, keçmiş zaman mikrosahəsinin nüvəsini də felin keçmiş zaman formaları təşkil edir. Azərbaycan dilində olduğu kimi, ingilis dilində də zaman anlayışının morfoloji ifadə vasitələri xarakterinə görə yekcins deyildir. Onların bəziləri birbaşa olaraq keçmiş zaman mənasını ifadə edir, digərləri isə bu mənanın ifadə olunmasında ikinci dərəcəli rol oynayırlar. Başqa sözlə desək, birincilər invariant keçmiş zaman mənasını özündə daşıdığına görə paradiqmatik səviyyədə zaman oppozisiyasının ünsürü kimi çıxış edə bilir. İkincilərin keçmiş zaman mənası isə konkret kontekstdə müəyyənləşir. Onlara *Present Indefinite, Present Perfect, Present Continuous, Present Perfect Continuous* formaları aiddir. Bu formalar nüvəyə aid edilə bilməz, çünki əsas invariant semanın birbaşa daşıyıcıları deyildir. Bununla belə, invariant semanın ifadəsindəki potensialları onları nüvəni təşkil edən elementlərdən sonra ikinci yerə çıxarmağa tam əsas verir. Buna görə də onlar nüvəətrafı zonaya aid edilir.

İngilis dilində morfoloji zaman sistemində zaman kateqoriyasına malik olmayan, müstəqil zaman mənası daşımayan, yalnız nisbi zaman mənasına malik olan qrammatik vahidlər ehtiva olunur. Onlar da nüvəətrafı zonaya aiddir. Bu qrammatik vahidlərə feli sifət (*Participle I və Participle II*), cerund və məsdərlər daxildir. Həmin vahidlər də kontekstdən asılı olan komponentlər kimi səciyyələndirilə bilər.

İngilis dilində keçmiş zaman mikrosahəsinin komponentləri arasında diqqəti cəlb edən vahidlərdən biri yarıqrammatikləşmiş təbiətə malik qrammatik-leksik konstruksiyalardır: *used + infinitive, would + infinitive.* Məhz yarıqrammatikləşmiş təbiəti imkan verir ki, onlar ingilis dilinin zaman mikrosahələrində morfoloji nüvə ilə leksik periferiya arasında aralıq qatda yerləşdirilsin. İngilis dilinin zaman mikrosahələrində belə komponentlərin olması onu Azərbaycan dilindən fərqləndirən xüsusiyyətlərdən biri hesab olunmalıdır.

Azərbaycan dilində keçmiş zaman mikrosahəsində olduğu kimi, burada da periferiyanı sintaktik və leksik ifadə vasitələrindən təşkil olunan iki lay əmələ gətirir. Birinci layda zaman mənası sintaktik səviyyədə çıxış edir, yəni sintaktik zaman özünün cümlə səviyyəsində əlaqə vasitələri, struktur sxemi ilə üzə çıxır. İkinci layda isə temporallıq ayrı-ayrı sözlərin – zərflərin (*yesterday, recently, ever, then, since* və s.), sifətlərin (*former, early, recent, previous, prior* və s.), isimlərin (*yesterday, past, future* və s.), müxtəlif söz birləşmələrinin (*in the past, in bygone days, yesterday morning* və s.) və frazeoloji vahidlərin (*in the day of old, the good old days, from time immemorial, since Adam was a boy*) leksik mənalarında təzahür edir.

Qarşılaşdırdığımız dillərdə keçmiş zaman mikrosahəsinin təhlili onu deməyə əsas verir ki, Azərbaycan dilinə nisbətən, ingilis dilində mikrosahənin morfoloji nüvəsi keçmiş zaman zonasını daha çox dərəcədə detallaşdırma gücünə ma-

likdir. Həmin detallaşdırmanı ifadə etmək üçün kifayət qədər morfoloji ifadə vasitələri vardır. Azərbaycan dilində morfoloji ifadə vasitələrinin sayı azdır, buna baxmayaraq, həmin ifadə vasitələrinin potensiyası imkan verir ki, onlar keçmişlə bağlı olan bütün semantik çalarları büruzə verə bilsin. Əlbəttə, hər iki dildə morfoloji ifadə vasitələri kommunikasiya prosesində informasiyanın ötürülməsində təkbaşına deyil, leksik, sintaktik və frazeoloji vahidlərlə birgə fəaliyyət göstərir.

### 2.2.2.2. İndiki zaman mikrosahəsi

«İnsan psixikası ilə və insanın təbiətə və başqa insanlara emosional münasibəti ilə bağlı spesifik cəhət və xüsusiyyətlər digər zaman anlayışlarına nisbətən indiki zamana daha çox dərəcədə xasdır. Temporal semantikanın bu geniş və kommunikativ cəhətdən mühüm sahəsinin nitqdə realizə edilməsində müxtəlif səviyyəli dil vahidləri, eləcə də onların müxtəlif kombinasiyaları birgə fəaliyyət göstərə bilər»[1].

Keçmiş zaman mikrosahəsinin modelləşdirilməsində istifadə etdiyimiz ümumi prinsip əsasında müqayisə edilən dillər üçün indiki zaman mikosahəsini də modelləşdirməyə çalışaq. Əvvəlcə modeli qurulan sahəni xarakterizə edən vahid semantik əlaməti, yəni indiki zamanın invariant zaman mənasını müəyyənləşdirək.

İndiki zamanın statusunun müəyyənləşdirilməsi həm fəlsəfədə, həm də dilçilikdə uzun müddət mübahisələrə səbəb olmuşdur. «İndi»nin semantik diapazonu çox yayğın, onun şərhi isə konkret situasiyadan asılı olaraq subyektiv səciyyə daşıyır. Fəlsəfi şərhdə «indiki zaman həmişə hansısa mövcud vəziyyətlə, hadisə ilə əlaqəlidir, həmin hadisənin uzunluğu və ya

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии. Автореф. дисс. ... канд. филол. наук. Краснодар, 1993, с. 23.

müddəti indiki zamanın «ölçülərini» müəyyən edir. İndiki zamanın müxtəlif uzunluğu və ya müddəti zaman spesifikasının təzahüründə xarakterik cəhətlərdən biridir»[1].

Azərbaycan dilçiliyində indiki zamanla bağlı ümumi fikir bundan ibarətdir ki, indiki zamanın məzmununda iki məna nəzəri daha çox cəlb edir. Bu məna xüsusiyyətlərindən birincisi, indiki zamanda iş, hal və hərəkətin danışıq vaxtına bilavasitə uyğun gəlməsi, ikincisi isə iş, hal və hərəkətin icra vaxtının danışıq vaxtına tam uyğun gəlməsidir. Bu məna xüsusiyyətinə görə hal və hərəkətin icra müddəti öz davamlılığına görə danışıq vaxtı müddətindən kənara çıxır[2].

Linqvistik indiki zaman formalarının əksəriyyəti özünün zaman mənasında obyektiv keçmişi və obyektiv gələcəyi ehtiva edir. Məsələn, deyək ki, indiki zamanda müxtəlif üsullarla hərəkət təkrarlanan, adət halını alan, zamanca qeyri-məhdud, yaxud nitq momentini ehtiva edən, ondan kənara çıxmayan az və ya çox müddətdə baş verən kimi təqdim edilə bilər. Əgər daimi, təkrarlanan və ya dəfələrlə təkrarlanan hərəkətlərin müəyyən kəsikləri nitq momentindən əvvəl, digəri isə nitq momentindən sonra gəlirsə, onlar bütövlükdə nə keçmişə, nə də gələcəyə aid edilə bilər. Belə hərəkətlərin indiki zamanla verilməsi tamamilə qanunauyğun haldır.

Beləliklə, indiki zaman şüurumuzda «indi» momenti ilə eyniləşir. Ona görə də linqvistik indiki zamanın məzmununu belə səciyyələndirmək olar: burada hərəkətlər nə nitq momentindən öncə, nə də ondan sonra gəlir. İndiki zaman mikrosahəsinin bütün konstituentləri üçün invariant semantik əlamət kimi «indiki zaman oriyentasiyası oxunun vektor sıfırı ilə əlaqəliliyi» («неразобщенность с векторным нулем оси ориен-

---

[1] Аскин Я.Ф. Проблема времени. Ее философское истолкование. М., 1966, с.85

[2] Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980, s. 338.

тации настоящего времени»)[1] hesab olunmalıdır. O halda linqvistik indiki zaman formaları vasitəsilə nitq momentini ya zaman oxu üzərində nöqtə kimi, ya da daha geniş zaman kəsiklərini əhatə edərək ehtiva edən bütün hərəkət və proseslər ifadə edilə bilər. Məhz bu invariant məna sayəsində indiki zaman mikrosahəsi həm fasiləsiz, daimi, həm də dəfələrlə təkrarlanan hərəkətləri ifadə etmək iqtidarındadır. Beləliklə, indiki zaman mikrosahəsinin konstituentləri *nitq momentini ya zaman oxu üzərində nöqtə kimi, ya da daha geniş zaman kəsiklərini əhatə edərək ehtiva edən bütün hərəkət və prosesləri ifadə etmək* kimi invariant semantik məzmun ətrafında birləşir. Bu vahid invariant semantik əlamət müəyyənləşdirildikdən sonra mikrosahənin modelinin qurulmasına başlamaq olar.

Azərbaycan dili üçün indiki zaman mikrosferası belə təsəvvür edilir.

Keçmiş zaman mikrosahəsində olduğu kimi, burada da nüvəni əsas morfoloji komponent olan indiki zaman forması [-(*y*)*ır*$^4$ şəkilçisi ilə düzələn forma] təşkil edir. -(*Y*)*ır*$^4$ şəkilçisi ilə düzələn indiki zaman forması bu zamana aid olan bütün məna xüsusiyyətlərini ifadə etmək potensiyasına malikdir.

Yuxarıda qeyd olunduğu kimi, mikrosahələri əmələ gətirən komponentlərin bir cəhəti ondan ibarətdir ki, onlar qapalı olaraq qalmır, sahələrarası qarşılıqlı əlaqədə olur, yəni bir sahənin sərəncamında olan ifadə vasitələri o biri sahələrin semantikasını ifadə etmək üçün də istifadə edilir. Belə əlaqələrin bir növü də zamanların üslubi işlənmə hallarıdır. Müəyyən hallarda başqa morfoloji komponentlər də indiki zamanın məna xüsusiyyətlərini ifadə edir. Bunları yuxarıda ikinci dərəcəli morfoloji ifadə vasitələri adlandırmışdıq. Buraya qeyri-qəti gələcək zaman forması [-(*y*)*ar*$^2$ şəkilçisi ilə düzələn forma],

---

[1] Тураева З.Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М.,«Высшая школа», 1979, с. 59.

şühudi keçmiş zaman [-*dı*[4] şəkilçisi ilə düzələn forma], nisbi zaman ifadə edən feli sifət və feli bağlama aiddir. Onlar nüvəətrafı zonaya daxildir.

İndiki zaman mikrosahəsinin periferiyası yaxın və uzaq olmaqla iki laya ayrılır. Yaxın laya indiki zaman mənasının sintaktik ifadə vasitələri, uzaq laya isə leksik ifadə vasitələri daxildir. Yaxın layda zaman mənası sintaktik səviyyədə çıxış edir, yəni sintaktik zaman özünün cümlə səviyyəsində əlaqə vasitələri, struktur sxemi ilə təzahür edir. Buna xəbərlik şəkilçilərinin, *vardır/yoxdur* sözlərinin işləndiyi indiki zaman mənalı sintaktik konstruksiyalar, adlıq cümlələr nümunə ola bilər. İkinci layda indiki zaman mənası zərflərin (*indi, anən* və s.), sifətlərin (*indiki, bugünkü, çağdaş, müasir, cari* və s.), isimlərin (*müasir, həmyaş* və s.), müxtəlif söz birləşmələrinin (*bu an, bu anda, bu dəmdə, indiki halda, son zamanlarda, son dövrlərdə, son vaxtlarda* və s.) və frazeoloji vahidlərin (*söz vaxtına çəkər, göz açıb yumunca,* [*bir*] *göz qırpımında*) leksik mənalarında təzahür edir.

İngilis dilində temporallıq makrosahəsinin indiki zaman mikrosahəsi aşağıdakı kimi modelləşdirilə bilər.

Mikrosahənin nüvəsində indiki zaman mənasını birbaşa ifadə edən morfoloji komponentlər cəmləşmişdir. Nüvəni dörd indiki zaman qrammemi təmsil edir: *Present Indefinite, Present Continuous, Present Perfect, Present Perfect Continuous*.

İndiki zaman mikrosahəsində ingilis dilində «qnomik gələcək» (gnomic future) adlandırılan forma da işlənir. Onu indiki, keçmiş və gələcək zaman mənalarının özünəməxsus sintezi adlandırmaq olar. Bu zaman forması ümumiləşmiş ifadələrdə, hikmətli sözlərdə işlənir və hərəkətin danışıq anında baş verməsini inkar etmir.

İndiki zaman mikrosahəsinin periferiyasını tərkibinə görə yekcins olmayan leksik temporal vasitələr təşkil edir. Onları da əsas və ikinci dərəcəli leksik komponentlərə ayırmaq olar.

Əsas leksik komponentlərə elə leksik vahidlər aiddir ki, onlar indiki zaman anlayışını leksik səviyyədə bilavasitə ifadə etmək potensiyasındadır. Onların əsas funksiyası hərəkəti indiki zaman sferasında lokallaşdırmaq və konkretləşdirməkdir. Buraya hərəkəti bütövlükdə indiki zamana aid edən zərflər (*today, presently, now*), sifətlər (*present, current, modern*), isimlər (*today, the moment*) və sözönülü temporal birləşmələr aiddir.

İkinci dərəcəli leksik vasitələrə *modal fel + infinitive* birləşmələri daxildir. Bu birləşmələr birbaşa zaman mənasını ifadə etmir, lakin müəyyən qrammatik və leksik tərtibatda zaman oriyentasiyası vermək imkanı qazanır. Bu, onların semantik strukturunda müvafiq temporal semanın olması ilə şərtlənir. Modal fellər hərəkətin zaman oriyentasiyasını modallıqla eyni vaxtda ifadə edir. Lakin modal fellərdə zaman mənası konkretlikdən məhrumdur. Məhz bu səbəbdən modal fellərlə ifadə olunan hərəkət indiki zamanı bildirsə də, onun realizə olunması gələcəyə aid olur. Ona görə də kontekstdən asılı olaraq onlar həm indiki, həm də gələcək zaman mikrosahəsinin komponentləri kimi nəzərdən keçirilə bilər.

### 2.2.2.3. Gələcək zaman mikrosahəsi

Zaman kateqoriyası insanın şüurunda və onun nitq fəaliyyətində özünü üç mütləq zamanın – indiki, keçmiş və gələcək zamanların məcmusu kimi təqdim edir. «İndiki, keçmiş və gələcək arasındakı fərq mövcud olan, mövcud olmuş və mövcud olmayan arasındakı fərqdir… Dəyişmənin zaman as-

pekti məhz təşəkkül, inkişaf prosesini ifadə edir»[1]. Gələcək inkişaf proses ilə bağlıdır. O, sadəcə, mövcud olmayan deyildir. Gələcək mövcud olacağına, var olacağına inandığımızdır.

Azərbaycan və ingilis dillərində gələcək zaman çox geniş ifadə vasitələri sisteminə malikdir. Həmin ifadə vasitələri üçün məna cəhətdən qeyri-yekcinslik və müxtəlifplanlılıq xarakterikdir. Hadisənin gələcək sferasına aid edilməsində istifadə edilən ifadə vasitələrinin rəngarəngliyi onların təsnifatını xeyli çətinləşdirir. Azərbaycan dili üçün burada mübahisəli məsələlər olmasa da, ingilis dili üçün bunu demək mümkün deyildir. Gələcək zamanın ifadə vasitələri sisteminin müxtəlif şəkildə təsnif edilməsi bu məsələni bir qədər də çətinləşdirir[2]. Bundan əlavə, ingilis dilinin zaman sisteminə həsr olunmuş tədqiqatlarda gələcək zamanı, ümumiyyətlə, zaman paradiqmasının bir üzvü olaraq qəbul etməyən fikirlərə də rast gəlmək olur[3].

Bütün bunlara baxmayaraq, ingilis və Azərbaycan dillərində gələcək zaman mikrosahəsinin komponentlərini müəyyənləşdirmək üçün, digər iki mikrosahə üçün etdiyimiz kimi, onların da tabe olduğu invariant semantik əlaməti müəyyənləşdirmək lazımdır.

---

[1] Аскин Я.Ф. Проблема времени. Ее философское истолкование, М., Мысл, 1966, с. 85.

[2] Bu barədə bax: Leech G., Svartvik J. A Communicative Grammar of English. M., 1983, pp. 54-56; Quirk R., Greenbaum S., Leech G., Svartvik J. A University Grammar of English. M., 1982, pp. 47-50; Declerck Renaat. Tense in English. Its structure and use in discourse. London and New York, 1991.

[3] Bu barədə bax: Есперсен О. Философия грамматики Москва, 1958; Fries Ch. C. The Structure of English. London, 1958; Palmer F.R. A Linguistic Study of the English Verb. London: Longman. 1965; Quirk R., Greenbaum S., Leech G., Svartvik J. A University Grammar of English (ed. and abbrev. by I.P. Verkhovskaya), Moscow, "Vyssaja škola", 1982 və s.

Beləliklə, qarşılaşdırdığımız dillərdə gələcək zaman mikrosahəsinin əsasında ümumi anlayış kateqoriyası olan gələcək zaman dayanır. Ona görə də gələcəyə aidiyyət, nitq momentindən sonra gələn zaman kəsiyinə aidlik bu sahəyə aidliyin invariant semantik əlaməti sayılır.

Bunları nəzərə alaraq, Azərbaycan dilində gələcək zaman mikrosahəsini aşağıdakı kimi təsəvvür etmək olar.

Digər mikrosahələr kimi burada da sahənin nüvəsini morfoloji komponent olan fel zamanları təşkil edir. Azərbaycan dilində gələcək zaman iki forma ilə təmsil olunur: qəti gələcək zaman [-*(y)acaq*$^2$ şəkilçisi ilə düzələn forma], qeyri-qəti gələcək zaman [-*(y)ar*$^2$ şəkilçisi ilə düzələn forma].

İngilis dilində isə gələcək zaman mikrosahəsinin nüvəsini *Future Indefinite, Future Continuous, Future Perfect, Future Perfect Continuous* zaman formaları təşkil edir. Bu zaman formalarından ilk üçü gələcək zamana aid hərəkət və prosesləri birbaşa ifadə edir və daha işləkdir. *Future Perfect Continuous* zaman formasının işlənmə tezliyi isə çox aşağıdır. Belə aşağı göstəricilər, hətta bu zaman formasını mikrosahənin morfoloji komponentləri sırasından çıxarmağa əsas verir (4-cü fəslə bax).

Müqayisə edilən dillərdə gələcək zaman mikrosahəsində ikinci dərəcəli morfoloji komponentlər də özünü göstərir. Bu daha çox üslubi əvəzetmə ilə bağlıdır. Məsələn, Azərbaycan dilində şühudi və ya qəti keçmiş zaman [-*dı*$^4$ şəkilçisi ilə ] və indiki zaman [-*(y) ır*$^4$ şəkilçisi ilə] formaları gələcək zamanın yerində işlənir və həmin mənanın ifadə edilməsinə xidmət edir. İngilis dilində isə *Present Indefinite* və *Present Continuous* formaları gələcək zamanda icra ediləcək hərəkətləri ifadə edən morfoloji komponentlərdəndir. Həm Azərbaycan, həm də ingilis dilində qeyd edilən zaman formaları mikrosahənin nüvəətrafı zonasına aid edilir. Sintetik quruluşlu Azərbaycan dilində nüvəətrafı zonaya daxil edilən ikinci dərəcəli morfoloji

komponentlərdən biri – feli sifət (indiki və gələcək zaman feli sifətləri) bu cəhətdən Azərbaycan dilindəki müvafiq mikrosahəni ingilis dilindəkindən fərqləndirir. İngilis dilindəki mikrosahəni Azərbaycan dilindəkindən fərqləndirən isə burada məsdərin işlənməsidir. Onu da qeyd edək ki, məsdərin gələcək hərəkətləri ifadə etməsi halları çox az təsadüf edilir. Onun işləkliyi Azərbaycan dilində feli sifətin işlənmə tezliyi ilə müqayisə edilə bilməz. Bunu belə izah etmək olar: Azərbaycan dilində gələcək zaman feli sifəti morfoloji vasitə ilə düzəlir və ən azı onun məzmununda gələcəkdə icra olunacaq hərəkət barədə siqnal vardır. Buna baxmayaraq Azərbaycan dilində feli sifət nisbi zaman bildirir. İngilis dilində isə məsdərin gələcək zamanı hətta nisbi şəkildə ifadə etməsi digər yardımçı vasitələrdən, xüsusilə kontekstdən asılı olur.

İngilis dilinin fərqli cəhətlərindən biri də bu dildə, yuxarıda qeyd etdiyimiz kimi, yarıqrammatikləşmiş *to be going* + *infinitive, to be about* + *infinitive, to be sure* + *infinitive, to be certain* + *infinitive, to be (un)likely* + *infinitive, to feel like* + *cerund, to be on the verge of* + *cerund, should||would like* + *infinitive, had better* + *infinitive, would rather* + *infinitive* tipli birşəmələrin işlənməsidir. Belə birləşmələrdə tam və ya qismən desemantikləşmiş fel birinci komponent, məsdər və ya cerund forması isə ikinci komponent kimi işlənir. Əsas leksik nüvə kimi ikinci komponent çıxış edir. Konstruksiyanın zaman mənası isə bütövlükdə birləşmədən irəli gəlir. Belə birləşmələri temporallıq sahəsinin nüvəətrafı zonasına aid etmək üçün tam əsas vardır.

Mikrosahələrin periferiyası, o biri zamanlar üçün modelləşdirdiyimiz sahələrdə olduğu kimi, iki qatdan ibarətdir. Azərbaycan dili üçün birinci qat cümlə səviyyəsində hərəkəti gələcəyə aid edən sintaktik predikativ konstruksiyalardır. İngilis dilində buraya *modal fel* + *məsdər* tipli birləşmələr aid edilə bilər. Modal fellər və onların ekvivalentləri müəyyən qram-

matik tərtibatda və leksik əhatədə hadisəni gələcək zaman sferasına aid edə bilir. Gələcək mənasını leksik yolla özündə təzahür etdirən *intend, plan, suppose, expect, wait, aim* və s. fellər özündən sonra gələn məsdərlə ifadə olunan hərəkəti gələcəyə aid edir. Azərbaycan dilində də buna oxşar fellər (*niyyətində olmaq, planlaşdırmaq, istəmək, gözləmək, güman etmək, fərz etmək* və s.) özündən sonra gələn məsdərlə ifadə edilən hərəkəti gələcək sferasına keçirir. Məsələn:

*Kişi yenə boylanıb Oğulun oxuduğu kitabın səhifəsinə baxmaq istəyir* (Elçin). *Satıb, sonra Leninqrad tərəfə getmək istəyirəm* (Ə.Əylisli). *Cəfər Cabbarlı adına Gəncə Dövlət Dram Teatrının aktyor truppası yaxın günlərdə yeni tamaşaları tamaşaçıların ixtiyarına verməyi planlaşdırır* ("Şərq" qəzeti).

Eyni hadisə hər iki dildə müəyyn isimlərdə müşahidə olunur. Həmin isimlərin leksik mənasında gələcəkyönümlülük vardır. Buna Azərbaycan dilində *plan, məqsəd, hədəf* «məqsəd», *niyyət*, ingilis dilində *aim, plan, purpose, intention, task, goal* kimi isimləri nümunə göstərmək olar.

Qarşılaşdırdığımız dillərdə gələcək zaman mikrosahəsinin uzaq periferiyası kimi qeyd edilən ikinci qat gələcək zamanı leksik səviyyədə təmsil edən zərflər, sifətlər, isimlər, müəyyən frazeoloji temporal birləşmələr və sərbəst söz birləşmələri olan sintaktik vahidlərdir.

Azərbaycan dilində: zərflər (*sabah, səhər, həmişə* və s.), sifətlər (*gələcək, növbəti* və s.), isimlər (*sabah, gələcək* və s.), müxtəlif söz birləşmələri (*bir gün , günlərin bir günü, o gün* və s.) və frazeoloji vahidlər (*dəvənin quyruğu yerə dəyəndə, qum göyərəndə*).

İngilis dilində: zərflər (*tomorrow, hereafter* və s.), sifətlər (*future, next, oncoming* və s.), isimlər (*tomorrow, morrow, future* və s.), müxtəlif söz birləşmələri (*in (the) future, early or*

*late*, *soon or late* və s) və frazeoloji vahidlər (*for the moment* "in near future", *one of these days* "in coming days").

Beləliklə, qeyd etdiyimiz leksik vahidlər öz leksik mənalarında gələcək zaman semasını daşımaqla, mikrosahənin morfoloji və ya qrammatik formalarının müşayiətçisi rolunu oynayaraq, invariant semantik əlamətin realizə olunmasında müəyyən rol oynayır.

## 2.3. Temporallıq sahəsi konstituentlərinin semantik funksiyaları

Materiyanın mövcudluğunun əsas formalarından biri kimi zaman dilin müxtəlif səviyyələrinə aid olan faktlarında əks olunur. Temporallığın müxtəlif ifadə vasitələri pərakəndə, dağınıq halda səpələnmiş vahidlərin təsadüfi yığını deyildir, onlar qarşılıqlı əlaqəli və biri-birindən asılı vasitələrin sistemini təşkil edir. Temporallığın ifadə vasitələri arasında sistemli münasibətlərin mövcud olması ona dilin müxtəlif səviyyəli ifadə vasitələrinin sistemi olaraq funksional-semantik sahə kimi yanaşmağı mümkün edir və həmin ifadə vasitələri burada özlərinin semantik funksiyalarının ümumiliyi və qarşılıqlı əlaqəsi əsasında birləşir[1]. Semantik funksiyaların ümumiliyi dedikdə, müxtəlif dil vasitələri ilə ifadə olunmuş semantik elementlərin müəyyən semantik zonaya aidliyi başa düşülür. Ən ümumi semantik əlamət həmin zona üçün invariant adlanır. Bu da semantik əlamətlərin əmələ gətirdiyi iyerarxiya pilləsinin zirvəsində dayanır. Məsələn, temporallıq sahəsi üçün «zaman münasibətlərinin ifadəsi» invariant semantik əlamət kimi iyerarxik nərdivanın zirvəsində dayanır, həmin pillənin aşağı hissələrində semantik variasiya genişlənir.

---

[1] Бондарко А.В. Функциональная грамматика.Л., Наука, 1984, с. 34.

Dil vahidinin semantik funksiyası haqqında dilçilik ədəbiyyatında xeyli yazılmışdır. A.V.Bondarkonun fikrini əsas götürərək, semantik funksiyanı biz bir sıra sahə konstituentlərinin müəyyən, ümumiləşmiş mənanın ifadə edilməsində dil vahidinin imkanları kimi başa düşürük[1].

Temporallıq sahəsinin konstituentləri «zaman koordinatı» kimi ümumi mənaya malikdir. Başqa sözlə desək, temporallıq sahəsinin konstituentləri zamanın lokallaşması funksiyasının reallaşmasına xidmət edir. Zaman lokallaşması kimi ümumi semantik funksiya öz növbəsində bir sıra xüsusi semantik funksiyaları özündə ehtiva edir: 1) təsbitli temporal lokallaşdırma funksiyası; 2) mütləq temporal lokallaşdırma funksiyası; 3) nisbi temporal lokallaşdırma funksiyası. Onları Azərbaycan və ingilis dilllərinin materialları əsasında nəzərdən keçirək.

### 2.3.1. Təsbitli temporal lokallaşdırma funksiyası

Bu semantik funksiya ümumi qəbul edilmiş şərti zaman oxunun müəyyən nöqtəsində və ya kəsiyində hərəkəti qeydə almaq və ya təsbit etmək yolu ilə onun zaman koordinatını təyin edir. Bu zaman hərəkət daim hamı üçün eyni olan, öz vəziyyətini dəyişməyən, ümumqəbul edilmiş hesablanma nöqtəsi ilə, yəni bizim eranın başlanğıcı, miladi təqvimi ilə əlaqələndirilir. Müqayisə edilən dillərdə aşağıdakı sintaktik vahidlər qeydəalma yolu ilə temporal lokallaşdırma funksiyasının reallaşmasına xidmət edir:

a) Zamanın hesablanma vahidlərinin adlarını bildirən isimlərin dəqiq vaxt, ayın, ilin, əsrin gününü göstərən saylarla əmələ gətirdikləri müxtəlif birləşmələri.

---

[1] Бондарко А.В. К истолкованию понятия "функция" // Известия АН СССР. Серия литературы и языка. 1987. Т. 46. № 3, с. 195-207.

Sıra və miqdar saylarının işləndiyi belə birləşmələr Azərbaycan dilində ismin müxtəlif hallarında və qoşmalarla, ingilis dilində isə sözönülü birləşmələrdə işlənir. Məsələn:

***Sentyabrın 17-18-də*** *ölkənin maliyyə sistemində yaranmış böhran yenidən təkrarlana bilər* («Ayna» qəzeti). *Mütəxəssislərin bildirdiyinə görə,* ***oktyabrın 7-dək*** *hər gən zəif maqnit həyəcanı olacağı gəzlənilir* («Xalq Qəzeti»). *Müzakirə zamanı Koalisiya Şurasının mətbuat üçün* ***31 mart 2005-ci il*** *tarixli açıqlamasında qaldırılan suallara da aydınlıq gətirildi* («Xalq Qəzeti»).

*Cooper was born* ***on September 15, 1789****, in Burlington, New Jersey. He died at Cooperstown,* ***on September 14, 1851****. He came back to town* ***in September 1983****. This file was first posted* ***on September 10, 1996****.*

b) Azərbaycan dilində *bazar günü(ndə), oktyabr ayı(nda), oktyabr ayından dekabradək, çərşənbə günündən cümə axşamınadək, avqustun axırlarında, ömrünün sonuna kimi* tipli birləşmələr. İngilis dilində isə *on Wednesday, in July, from Monday to Saturday, from Monday through Wednesday* tipli sözönülü birləşmələr.

Qarşılaşdırdığımız bu dillərdə belə birləşmələrdə saylar işlənmir, onlar implisit şəkildə təsəvvür edilir, çünki danışan hadisənin dəqiq təqvim tarixini bilir. Məsələn:

*Son məlumatlara görə,* ***avqustun axırlarında*** *baş vermiş təbii fəlakət nəticəsində həlak olanların sayı 1185-ə çatıb* («Xalq Qəzeti»). *O,* ***ömrünün sonuna kimi*** *... Geologiya İnstitutunda «Neft və qaz geologiyası» şöbəsinə rəhbərlik etmişdir* («Elm» qəzeti). *Ukraynanın keçmiş baş naziri ... Viktor Yanukoviç* ***mart ayında*** *keçiriləcək parlament seçkilərinin ədalətli olacağına inanmadığını bildirib* («Gündəlik Azərbaycan» qəzeti).

*So, Tuesday, Wednesday, and Thursday, passed; and* ***on Friday morning*** *I went to Mr…* (Ch.Dickens). *One day* ***in***

***January*** *he called at the seminary to return a book which he had borrowed* (Ch.Dickens). *My fellow-friend stayed in Jakarta* ***from Monday to Friday***.

c) Azərbaycan dilində *XXI əsrin ilk beş ili, 1994-cü ilin sentyabrı, ötən əsrin 70-ci illəri* tipli birləşmələrin işləndiyi cümlələr; ingilis dilində *The last weeks of 1986, The last months of 2005* tipli birləşmələrin işləndiyi cümlələr.

Belə cümlələr də qeydəalma yolu ilə temporal lokallaşdırma funksiyasının reallaşdığı sintaktik vahidlər sırasına daxil edilə bilər. Məsələn:

***XXI əsrin ilk beş ili*** *respublikamızın sosial-iqtisadi həyatında nəzərə çarpan uğurlarla zəngindir* («Xalq Qəzeti»); ***1994-cü ilin sentyabrı*** *«Əsrin Müqaviləsi»nin bağlanması ilə yaddaşlara həkk olunub* («Azərbaycan» qəzeti). *Xırdalan, Ceyranbatan və Mehdiabad qəsəbələrində* ***ötən əsrin 70-ci illərində*** *tikilmiş körpülər evi-uşaq bağçasının dam örtükləri bərpa edilməli, kommunikasiya xətləri yenidən qurulmalıdır* («Xalq Qəzeti»). ***1990-cı ilin payızında***, *seçkilər zamanı, Xətai rayonunda, axşam həyətlərin birində ətrafıma toplaşan adamların arasında, həyətin az işıqlanan yerində, onun adamların arasından ürkək-ürkək boylandığını görəndə gözlərimə inanmadım* (S.Rüstəmxanlı).

***The last months of 2003*** *were dominated electioneering. Chinese retail sales rose 14.7 percent* ***in the first two months of 2007*** *compared with a year earlier* (The Washington Times, March 25, 2007). ***The last six month of 2006*** *the Hong Kong government lay the ground for the election* (The Times Online, March 20, 2007)

Nümunələrdən göründüyü kimi, hadisələr şərti zaman oxu üzərində hansısa nöqtədə qeydə alınma yolu ilə lokallaşdırılır və miladi təqvimi ilə əlaqələndirilir. Bu funksiya daha çox zaman adları ilə sayların birləşməsindən əmələ gələn sintaktik temporal birləşmələr üçün səciyyəvidir.

### 2.3.2. Mütləq temporal lokallaşdırma funksiyası

Bu semantik funksiyanın mahiyyəti ondan ibarətdir ki, o, sahənin konstituentləri hərəkəti, hadisəni fərdi, şəxsi zaman oxu üzərində lokallaşdırır. Belə halda hesablanma nöqtəsi kimi öz vəziyyətini zaman oxu üzərində daim dəyişən nitq momenti götürülür, sahənin konstituentlərinin zaman mənası isə sıfır nöqtəsindən zamanın hesablanma istiqamətini göstərir. Hərəkət və ya hadisə isə danışanla fərdi zaman oxunun müəyyən nöqtəsi və ya kəsiyi ilə əlaqələnir. Fərdi zaman oxunun müəyyən nöqtəsi və ya kəsiyi nitq momentindən asılı olaraq üç şəkildə ola bilir: hərəkət və ya hadisə nitq momenti ilə üst-üstə düşürsə, indiki zamana, nitq momentindən əvvəl gəlirsə, keçmiş zamana, nitq momentindən sonra gəlirsə, gələcək zamana aid olur. Q.Mileykovskaya dildəki zaman kateqoriyasının obyektiv zamanın danışan tərəfindən dərk edilməsindən asılı olduğuna işarə edir[1]. Buna etiraz edən mülahizələr də nəzərə çarpır[2]. Fərdi zaman oxu dildə, hər şeydən öncə, felin qrammatik zaman kateqoriyası ilə əks olunur. Qrammatik zaman kateqoriyası temporallıq sahəsinin nüvəsini təşkil edir. Keçmiş, indiki və gələcək arasında sərhədin müəyyənləşdirilməsində hesablanma nöqtəsi kimi nitq momentinin götürülməsi tamamilə qanunauyğundur. Dilçilik ədəbiyyatında qrammatik zamanların fərqləndirilməsində nitq aktının aparıcı rola malik olması xüsusi vurğulanmışdır.

Fərdi zaman oxu üzərində nitq momentinə münasibətdə felin zaman formaları üzrə aşağıdakı mənaları fərqləndirmək olar.

---

[1] Милейковская Г.М. О соотношении объективного и грамматического времени // Вопросы языкознания. 1956, № 5, с. 76.

[2] Axundov A. Fəlsəfi və qrammatik zaman kateqoriyaları // Ağamusa Axundov. Dil və Ədəbiyyat. I cild, s. 201-203.

1. Nitq momentindən öncəgəlmə – bu mənanı Azərbaycan dilində *-mış*$^4$, *-ıb*$^4$, *-dı*$^4$ şəkilçiləri ilə düzələn morfoloji zaman formaları, ingilis dilində *Past Indefinite, Present Perfect, Past Continuous, Past Perfect, Past Perfect Continuous* zaman formaları ifadə edir.

2. Nitq momenti ilə eynizamanlılıq – bu mənanı Azərbaycan dilində *-ır*$^4$, *-maqda*$^2$ şəkilçiləri ilə düzələn morfoloji zaman formaları, ingilis dilində *Present Indefinite, Present Continuous* zaman formaları ifadə edir.

3. Nitq momentindən sonragəlmə – bu mənanı Azərbaycan dilində *-(y)acaq*$^2$, *-(y)ar*$^2$ şəkilçiləri ilə düzələn morfoloji zaman formaları, ingilis dilində isə *Future Indefinite, Future Continuous, Future Perfect, Future Perfect Continuous* zaman formaları ifadə edir.

Mütləq temporal lokallaşdırma funksiyasına sahənin digər konstituentləri də malikdir. Həmin konstituentlərin mənalarının strukturunda «indiki zaman», «keçmiş zaman», «gələcək zaman» seması fərqləndirilə bilir.

Aşağıda üç zaman planını əks etdirən leksik, frazeoloji və sintaktik vahidlər verilir.

KEÇMIŞ ZAMAN:

**Azərbaycan dilində:** ***leksik vahidlər:*** *dünən* (is., z.), *dünənki* (sif.), *keçmiş* (is., sif.), *bildir* (z.), *bildirki* (sif.), *dün* (is.), *əvvəlki* (sif), *sabiq* (sif.), *yaxında* (z.) *yaxınlarda* (z.), *onda* «keçmişdə»; ***frazeoloji vahidlər:*** *Nuh əyyamından, dədə-babadan qalma, qədim zamanlardan, it ilində*; ***sintaktik vahidlər (söz birləşmələri)***: *keçmiş günlərdə, dünən səhər, bir gün, günlərin bir günü, o gün* və s.

**İngilis dilində:** ***leksik vahidlər:*** *yesterday* (n., adv.), *since* (adv., prep., conj.), *hitherto* (a.), *former* (a.), *early* (a.), *recent* (a.), *recently* (adv.), *ever* (adv.), *then* (adv.); ***frazeoloji vahidlər:*** *the other day, in the day of old, the good old days, from time immemorial, since Adam was a boy*; ***sintaktik va-***

***hidlər (söz birləşmələri)*****:** *in the past, in bygone days, yesterday morning*

İNDIKI ZAMAN:

**Azərbaycan dilində:** ***leksik vahidlər***: *indi* (z.), *indiki* (sif.), *bugünkü* (sif.), *çağdaş* (sif.) *müasir* (is., sif.), *cari* (sif.), *anən* (z.), *ani* (sif.), *yeni* (sif.) «dövrümüzə aid olan» ; ***frazeoloji vahidlər:*** *söz vaxtına çəkər, göz açıb yumunca, <bir> göz qırpımında*; ***sintaktik vahidlər (söz birləşmələri)***: *bu an, bu anda, bu dəmdə, həmin əsnada, indiki halda, son zamanlarda, son dövrlərdə, son vaxtlarda* və s.

**İngilis dilində:** ***leksik vahidlər***: *today* (n., adv.), *present* (a.), *presently* (adv.) "indiki zamanda, indi ", *the moment* (n.), *now* (adv.), *nowaday* (a.), *current* (a.), *currently* (adv.), *modern* (a.), *instant* (a.) "indiki zaman haqqında", *yet* (a.); ***frazeoloji vahidlər*****:** *for the moment, up to the minute, in these latter days, these days;* ***sintaktik vahidlər (söz birləşmələri)***: *(in) this month (year), for the present, (at) the present time, at present*

GƏLƏCƏK ZAMAN:

**Azərbaycan dilində:** ***leksik vahidlər***: *sabah* (is., z.), *səhər* (z.), *gələcək* (is., z.), *növbəti* (sif.), *həmişə* (z.), *daim* (z.) *yaxında, yaxınlarda, onda* «gələcəkdə»; ***frazeoloji vahidlər:*** *dəvənin quyruğu yerə dəyəndə, qum göyərəndə*; ***sintaktik vahidlər (söz birləşmələri)***: *bir gün , günlərin bir günü, o gün* və s.

**İngilis dilində:** ***leksik vahidlər***: *tomorrow,* (adv., n.), *morrow* (n.), *future* (a., n.), *hereafter* (adv.), *hereupon* (adv.), *next* (a.), *oncoming* (a.); ***frazeoloji vahidlər:*** *for the moment* "gələcəkdə", *one of these days* "yaxın günlərdə, gələcəkdə": ***sintaktik vahidlər (söz birləşmələri)***: *in (the) future, early or late, soon or late.*

Mütləq temporal lokallaşdırma funksiyasını reallaşdıran morfoloji, leksik, frazeoloji və sintaktik vasitələr nitqdə qarşı-

lıqlı əlaqəli şəkildə bir-birini tamamlayır. Bunu aşağıdakı misallardan görmək olar:

***Dünən*** *bu münasibətlə həmin bü səhnədə ölümsüz bir bəstəkarın yubileyi* ***keçirildi*** (Ə.Cəfərzadə). ***Dünən axşamkı*** *müsahibələri, daha doğrusu,* ***dünən axşamkı*** *mübahisələri* ***yadına düşdü*** (Ə.Cəfərzadə). *Sabir Əhmədli* ***indi*** *də bir ədib kimi məhsuldarlıqla* ***çalışmaqda****, yazıb* ***yaratmaqdadır****.* ***O vaxtlar*** *Yazıçılar İttifaqında* ***həftədə*** *bir dəfə gənclər günü* ***keçirilirdi****, Səməd Vurğun da* ***rəhbərlik eləyirdi*** (S.Səxavət). ***Ertəsi gün səhər tezdən*** *Qoca Vəziri yanımda görəndə* ***təəccübləndim*** (S.Səxavət). ***İlk insan yaranan gündən bu günə qədər*** *Allah* ***yazır****, bir «əsəri» o birinə qətiyyən* ***oxşamır*** *və* ***axırıncı insan dünyaya gələnə qədər də yazacaq*** (S.Səxavət).

*I* ***went*** *into grandfather's room* ***yesterday*** (J.Galsworthy). *Looking round, he* ***saw*** *Maggy in her big cap which had been long abandoned, with a basket on her arm as* ***in the bygone days*** (Ch.Dickens). *I wonder! It* ***doesn't look*** *much like it* ***at present*** (J.Galsworthy).

Zaman irəli hərəkət etdikcə, yəni gələcək indikiyə, indiki keçmişə döndükcə, nitq momentinə görə hərəkət və ya hadisəyə verilən qiymət şərti zaman oxü üzərindəki vəziyyətini dəyişir və mütləq mənada doğruluğunu itirir.

### 2.3.3. Nisbi temporal lokallaşdırma funksiyası

Bu semantik funksiyanı reallaşdıran konstituentlər hərəkətin zaman koordinatlarını müəyyənləşdirmək iqtidarındadır. Onlar hərəkətin zaman koordinatlarını iş, hal və hərəkəti hesablanma və ya istinad nöqtəsi kimi götürülən başqa hərəkət, iş, hadisə və ya situasiya ilə əlaqələndirməklə təyin edir. Artıq bu halda ümumqəbul edilmiş şərti zaman oxundan əlavə başqa bir zaman oxunun dildə əks olunmasından söhbət gedir. Onu linqvistik cəhətdən nisbi zaman oxu adlandırırlar. Məlum ol-

duğu kimi, burada iki zaman oxunun – mütləq və nisbi zaman oxlarının bir- birinə nisbətindən söhbət gedir. Həmin zaman oxları üzrə hərəkətlərin bir-birinə qarşılıqlı münasibəti çox mürəkkəb olmaqla daim mütəxəssislərin diqqətini cəlb etmişdir. Nitq momentinə və ya hesablanma nöqtəsi kimi qəbul edilmiş hər hansı başqa bir hərəkətə münasibətdə nisbi zaman oxu üzərində eynizamanlılıq, öncəgəlmə və sonragəlmə vəziyyətlərini fərqləndirmək olar.

Azərbaycan dilində temporallıq sahəsinin mərkəzi konstituenti sayılan morfoloji zaman formalarında öncəgəlmə, eynizamanlılıq və sonragəlmə münasibətlərini fərqləndirmək olar.

Öncəgəlmə münasibəti *-dı*$^{4}$, *-mış*$^{4}$, *-mışdı*$^{4}$, *-mışmış*$^{4}$, *-ıb*$^{4}$ şəkilçiləri ilə ifadə olunan zaman formalarında təzahür edir.

Eynizamanlılıq münasibəti *-(y)ır*$^{4}$, *-maqda(dır)*$^{2}$ şəkilçiləri ilə ifadə olunan zaman formalarında təzahür edir.

Sonragəlmə münasibəti *-(y)acaq*$^{2}$, *-(y)ar*$^{4}$ şəkilçiləri ilə ifadə olunan zaman formalarında təzahür edir.

*-dı*$^{4}$, *-(y)ır*$^{4}$, *-(y)acaq*$^{2}$, *-(y)ar*$^{4}$ şəkilçiləri ilə ifadə olunan zaman formaları hərəkətlərin ardıcıllığını göstərmək üçün həmcins xəbərli cümlələrdə sonragəlmə və ya ardıcıllıq mənası qazana bilir. Məsələn: *O, bir az gözləyib tini* ***buruldu*** *və qənbər döşənmiş küçəni keçib Sənubərgilin çöl qapısından* ***içəri girdi*** (Elçin). *Cümə günü axşam tərəfi axırıncı pasientlərini qəbul edib evinə* ***gedər****, paltarını* ***dəyişər****, - «Volqa»sına minib bağa* ***yollanardı*** (Anar). *Mən yaxındakı avtomat budkasına* ***girdim****, yarığa iki qəpiklik* ***saldım*** *və nömrəni* ***yığdım*** (Anar).

Azərbaycan dilinin materialları əsasında aparılan təhlil göstərir ki, felin zaman formalarında mütləq temporal lokallaşdırma funksiyası nisbi temporal lokallaşdırma funksiyası ilə eyni vaxtda mövcud ola bilər, amma bu zaman üstünlük mütləq temporal lokallaşdırma funksiyası tərəfində olur. Məsələn,

-*ır*[4] şəkilçili forma nitq momentinə nisbətdə mütləq zaman şkalası üzrə «eynizamanlılıq» və ya «indiki zaman» mənasını, nisbi zaman şkalası üzrə isə başqa bir hərəkətlə nisbətdə «eynizamanlılıq» və «müddət» mənalarını ehtiva edə bilər. Məsələn: *Top **atılır**, fişəng **yanır**, Sarı, yaşıl, al qırmızı işıq **saçır**, qəşəng **yanır*** (M. Rahim). *Əslində əvvəllər Sənubər elə **bilirdi** ki, o, onuncu sinifdə **oxuyur*** (Elçin). *Bilirsən... Nə bu ev bizimdi, nə o dəniz bizimdi, nə Bakı bizimdi, nə də Azərbaycan bizimdi – **zəmanə** bizimdi, – **deyir** Bağırov və göylərin dibi qədər dərin bir **fikrə gedir*** (S.Səxavət).

Felin təsriflənməyən formaları nisbi temporal lokallaşdırma funksiyası daşıya bilir. Məsələn: *Cahandar ağa ... **səhər-səhər atı minib Kürə sulamağa aparanda** samanlığın üstünə çıxıb arxasınca **baxardı*** (İ.Şıxlı). *... günorta evdən **çıxanda demişdi** ki, dərsdən sonra Vovayla kinoya gedəcəkdilər* (Elçin).

İngilis dilində də nisbi zaman oxu üzərində başqa bir hərəkətə nəzərən eynizamanlılıq, öncəgəlmə və sonragəlmə münasibətlərini fərqləndirmək olar. İngilis dilindəki finit və qeyri-finit fellərdə öncəgəlmə və eynizamanlılıq münasibətləri özünü göstərir.

Öncəgəlmə münasibəti *Present Perfect, Past Perfect* və *Future Perfect* zaman formaları ilə təzahür edir.

Eynizamanlılıq münasibəti *Present Continuous, Past Continuous* və *Future Continuous* zaman formaları ilə təzahür edir.

*Present Indefinite, Past Indefinite* və *Future Indefinite* zaman formaları hərəkətin icrasının ardıcıllığını göstərmək üçün həmcins xəbərli cümlələrdə sonragəlmə mənası qazana bilir. Məsələn:

*Lord Henry **elevated** his eyebrows and **looked** at him in amazement through the thin blue wreaths of smoke that curled up in such fanciful whorls from his heavy, opium-tainted*

*cigarette* (O.Wilde). *He **lighted** his cigarette, **said** good night, and **went** on* (J.London). *I **turned** half-way round and **saw** Dorian Gray for the first time* (O.Wilde).

İngilis dilində felin təsriflənməyən formaları nisbi temporal lokallaşdırma funksiyası daşıya bilir. Felin təsriflənməyən formaları Azərbaycan dilində olduğu kimi öncəgəlmə və eynizamanlılıq ifadə edir. Felin təsriflənməyən formalarının perfekti öncəgəlmə, qeyri-müəyyən forması isə eynizamanlılıq ifadə edir. Misallar:

*Strickland **seemed <u>to bear</u>** in his heart strange harmonies and unadventured patterns* (S.Maugham). *When he arrived home, about half-past twelve o'clock, he **saw** a telegram **<u>lying</u>** on the hall table* (O.Wilde). *… **<u>having quarreled</u>** with him more violently than usual, he had made up his mind to have nothing more to do with him* (S.Maugham).

Cümlədə kontekstdən asılı olaraq indiki zaman feli sifəti nisbi öncəgəlmə semasına malik ola bilər. Məsələn:

***Approaching the table**, he saw lying upon it a letter addressed to him, in Montanelli's handwriting* (E.Voynich). *"I don't understand you," Montanelli said, **turning** to him with a startled look* (E.Voynich). ***Turning** round, he stared at me, but I perceived that he did not see me* (S.Maugham).

Nisbi temporal lokallaşdırma funksiyasına leksik vahidlər də malik ola bilər. Hər iki dilə aid belə vahidlər izahlı lüğətlərdə verilmiş izahların təhlili əsasında, Azərbaycan dilinə aid olan sözlər isə həm də orfoqrafiya lüğətindən seçilmişdir. İzahların təhlili göstərir ki, Azərbaycan dilinə aid seçilmiş sözlərin lüğət məqalələrində *qabaq, əvvəlcədən, irəlicədən, öncə, eyni zamanda, eyni vaxtda, sonra, sonradan* və b.k. təyinedici söz və söz birləşmələrindən, ingilis dilinə aid seçilmiş sözlərin lüğət məqalələrində isə *before, beforehand, in advance, simultaneously, after, afterwards, at the same time, prior, soon* və b.k. təyinedici sözlərdən və ya lüğət məqaləsi-

nin şərhində onlara yaxın mənalı söz və ya söz birləşmələrindən istifadə olunur. Məhz həmin vahidlər nisbi temporal lokallaşdırma funksiyasının göstəriciləri kimi çıxış edir. Nümünə kimi lüğətdə verilmiş bəzi izahlara nəzər salaq.

«Tezdən – z. 1. alaqaranlıqdan, sübh erkəndən T. yola çıxmaq 2. Vaxtından əvvəl, qabaq, tez T. yatmaq»[1];

«Müasir – sif. və i. 1. Başqası və ya başqaları ilə bir əsrdə, bir zamanda yaşamış və ya yaşayan; həməsr // Müasir(lər)imiz – bizimlə bir əsrdə, bir dövrdə yaşayan(lar) 2. indiki əsrdə, indiki dövrdə olan; çağdaş M. ədəbiyyat»[2];

«Postsovet – sif. sovet quruluşu, SSRİ dağıldıqdan sonrakı dövr»[3].

«early (a., adv.) - near the beginning of a period of time, or before the usual, expected or planned time»[4];

early (a., adv.) 1 near the beginning of a period of time, an event etc: 2 arriving, or done before the usual, expected or planned time[5];

«presently *adv* 1 soon: *I''ll be with you presently*. 2 (US) at the present time: *The Secretary of State is presently in Africa*»[6];

«antecedent (*n*.) [C] someone or something existing or happening before, especially as the cause or origin of something existing or happening later; (*a*.) previous»[1].

---

[1] Azərbaycan dilinin izahlı lüğəti. III c., Bakı, 2000, s. 93.

[2] Azərbaycan dilinin izahlı lüğəti. II c., Bakı, 1999, s. 281.

[3] Axundov A. Azərbaycan dilinin izahlı lüğəti. Bakı, 2005, s. 322

[4] Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk.

[5] The Oxford English Dictionary, Volume X1, T-U, Oxford, At the Clarendon Press.

[6] Hornby A.S. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. I-II, 1982, II, 154.

Beləliklə, lüğətlərdən nisbi temporal lokallaşdırma funksiyasına malik olan aşağıdakı sözlər seçilmişdir:

**Azərbaycan dili üçün**

| *ÖNCƏGƏLMƏ* | *EYNİZAMANLILIQ* | *SONRAGƏLMƏ* |
|---|---|---|
| **İsim:**<br>arxaizm, avans, başlanğıc, başlanılma, başlanış, dün, dünən, düngün, ərəfə, əzəl, əzəlilik, əzəliyyət, ilkinlik, müqəddimə<br><br>**Sifət:**<br>arxaik, bayaqkı, əvvəlinci, əvvəlki, əzəli, əzəlki, ilkin, inişilki, irəlidəki, irəliki, qabaqdakı, qabaqkı, məktəbəqədər, tarixəqədərki<br><br>**Zərf:**<br>axşamayaxın, axşamqabağı, ba- | **İsim:**<br>birvaxtlılıq, eynivaxtlılıq, eynizamanlılıq, əsrdaş, həməsr, həmyaş, həmyaşlıq, həmyaşıd, həmyaşıdlıq, həmzaman, indilik, müasir, müasirlik, nəsil, sinxroniya, sinxronizm, sinxronluq, sinxronlaşdırma<br><br>**Sifət:**<br>buaykı, bugünkü, builki, çağdaş, eynivaxtlı, eyniyaşlı, eynizamanlı, hazırkı, həmvaxt, həmyaş, həmyaşıd, indiki, müasir, mövcud, sinxron | **İsim:**<br>axır, axırzaman, axirət, geclik, məbəd, postimpressionizm, postmodernizm, son<br>**Sifət:**<br>növbəti, postsovet, postmodernist, sonralıq,<br><br>**Zərf:**<br>axırda, ertə (hazırkı gündən sonra gələn), gec, gecdən, gecdən-gec, gec-gec, həftəso- |

[1] Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk.

| | | |
|---|---|---|
| yaq, bayaqdan, bayramqabağı, bildir, çoxdan, erkən, ertə (tez, qabaq, əvvəl), ertədən, əqdəm, əvvəl, əvvəlcə, əvvəlcədən, əvvəldən, əvvəli, əvvəllər, əvvəllərdə, əvvəlləri, əzəllər, əzəlcə, ibtidada, ibtidadan, inişil, irəli, irəlicə, irəlicədən, irəlidə, qabaq, qabaqca, qabaqcadan, onda (keçmişdə) öncə, öndən, sübhəyaxın, <br>**Qoşma:** <br>əvvəl, qədər, müqəddəm, -dak (-dək), -can (-cən) kimi, <br>**Ara söz:** <br>Əvvəla, əvvələn, | **Zərf:** <br>İndi, indilik, indicə, indilikdə, indilikcə, vaxtında, vaxtlı-vaxtında, dərhal, əlüstü, hazırda, hələ (ki), hələlik <br><br>**Fel:** <br>yaşamaq, var olmaq, mövcud olmaq müasirləşdirilmək, müasirləşdirmək, müasirləşmək, sinxronlaşdırmaq <br><br>**Bağlama:** <br>ikən | nu, nəhayət, nəhayətdə, nəticədə, onda (indi yox, o zaman), sonra, sonradan, sonradan-sonraya, sonralar, sonralıqca, sonrası, tezliklə, yaxında, yaxınlarda <br>**Qoşma** <br>bəri, sonra, doğru, <br><br>**Ara söz:** <br>nəhayət, axırda, ikincisi, saniyən |

**İngilis dili üçün**

| ***ÖNCƏ-GƏLMƏ*** | ***EYNİZAMANLILIQ*** | ***SONRA-GƏLMƏ*** |
|---|---|---|
| **İsim:**<br>Antecedent, antecedence, antedate, anteriority, anticipation, eve, ex, forenoon, forerunner, foreplay, prearrangement, precondition, precaution preface, prejudice, precedent, pre-election, prevention<br><br>**Sifət:**<br>Antenatal, anterior, early, foregoing, past, precedent pre-classical, preconscious, pre-election, pre-dynastic, pre-Columbian, pre-human, preliminary, premature, predictable, premier, previous, | **İsim:**<br>Attendant, coexistence, coincidence, concomitance, concourse, contemporary, coeducation, contemporaneity, modernity, modernization, simultaneity, simultaneousness, synchronism, synchronization<br>**Sifət:**<br>Attendant, coexistent, coexisting, coextensive, coeval, coincident, concurrent, contemporary, contemporaneous, simultaneous, synchronous<br><br>**Zərf:**<br>Coincidently, | **İsim:**<br>Aftercare, aftereffect, aftergrass, afterlife, afterimage, aftershave, aftershock, posteriority, posterity, postgraduate, postimpressionism, sequence, subsequence<br><br>**Sifət:**<br><br>After, consecutive, conesquent, posterior, post-classic, post-graduate, post-war, subsequent, successive, ulterior, belated, coming, |

| | | |
|---|---|---|
| prior, primary<br><br>**Fel**:<br>Foreordain, prearrange, predict, pre-elect, preoccupy, prepay, prepossess, presuppose, preview, prevent, predetermine, predestine<br>**Zərf:**<br>Afore, aforetime, already, anteriorly, before, beforehand, ago, early, formerly, lately, latterly, previously, recently, yesterday, once<br><br>**Sözönü:**<br>Afore, before, ere, till, by, until<br><br>**Bağlayıcı:**<br>before, since, till, until, when | meantime, meanwhile, (at) once “at the same time”, still, yet<br><br>**Fel:**<br>Accompany, attend, concur, modernize, synchronize<br><br>**Sözönü**<br>At, in, on, over, upon, with, during<br><br>**Bağlayıcı:**<br>As, no sooner … than, when, whenever, while | late, latter, next<br><br>**Zərf:**<br>After, afterwards, immediately, instantly, lastly, late, next, nextly, prospectively, subsequent ly, successively,<br><br>**Fel:**<br>Defer, delay, postdate postpone<br><br>**Sözönü**<br>After, following, on, past, since<br><br>**Bağlayıcı:**<br>After, as soon as, directly, immediately |

Müqayisə edilən hər iki dildə nəzərdən keçirilmiş leksik vahidlərin lüğət məqalələrinin təhlili göstərir ki, nisbi temporal lokallaşdırma funksiyası müxtəlif leksik vahidlərdə müxtəlif cür təzahür edir. Hər şeydən əvvəl, leksik vahidlərin semantik fərqləri hesablanma nöqtəsinin seçimində və onun ifadə üsulunda özünü büruzə verir. Məsələn, Azərbaycan dilində *məktəbəqədər, postsovet, tarixəqədərki, novruzqabağı, seçkiöncəsi, sinifdənxaric* kimi sifətlərdə, *əvvəl, əvvəlcədən, qabaqcadan, sonra* kimi zərflərdə, *novruzqabağı, seçkiöncəsi* kimi isimlərdə istinad və ya hesablanma nöqtəsi başqa bir hərəkət və ya hadisə olduğu halda, *tez, gec, erkən, ertədən* tipli zərflərdə bu, müəyyən zaman standartı, hərəkətin baş verməli olduğu güman edilən zaman müddətidir. *Hazırda, vaxtilə, çoxdan* kimi zərflərdə, *müasirləşmək, mövcud olmaq* kimi fellərdə, *müasir, çağdaş, həmyaş, həmyaşıd* kimi sifətlərdə, *həmyaş, həmyaşıd, müasirlik, sinxronluq* kimi isimlərdə şəxs, hadisə, hərəkət və ya situasiya ilə ifadə oluna bilən ümumi, qeyri-müəyyən hesablanma nöqtəsinə işarə vardır. İngilis dilində də *after, afterwards, before, beforehand, subsequently* kimi zərflərdə, *after, before, till, until* kimi sözönülərdə, *after, before, till* kimi bağlayıcılarda, *aftercare, aftershock, pre-election* kimi isimlərdə, *predynastic, post-war* kimi sifətlərdə oriyentir başqa bir hərəkət və ya hadisədir. *Late, early* kimi zərflərdə, *early, belated* kimi sifətlərdə həmin oriyentir müəyyən zaman standartı, hərəkətin baş verməli olduğu güman edilən zaman müddətidir.

Tədqiq olunan leksik vahidlərin semantik strukturunun təhlili göstərir ki, bəzi vahidlərin məna strukturunda müxtəlif mənalar təzahür edir. Məsələn, *yaxında, yaxınlarda* zərfləri nisbi temporal lokallaşdırma funksiyasına malikdir. Ümumi «nisbət, aidetmə, əlaqələndirmə» seması ilə bərabər, onların məna strukturunda «öncəgəlmə» (*az müddət bundan qabaq,*

*əvvəl*: (*Bu) yaxında bir əhvalat oldu*[1] və «sonragəlmə» (*az vaxt sonra*: *Yaxınlarda bu iki gəncin toyu olacaq*[2]). semaları da aşkar edilir.

Azərbaycan dilində *onda* zərfi, ingilis dilində *then* zərfi hərəkəti həm keçmişə, həm də gələcəyə aid edir, eləcə də hansısa hesablanma, çıxış nöqtəsindən sonragəlməyə də işarə edə bilir. *İndi* və *now* zərfləri hərəkəti indiki zamana aid edə və müəyyən situasiyadan sonragəlməni göstərə bilir.

Hər iki dilə aid faktik materialın təhlili göstərir ki, mütləq və nisbi temporal lokallaşdırma funksiyalarına malik olan sözlər arasında zərflərin xüsusi çəkisi digər söz qruplarından daha artıqdır. Başqa sözlə desək, məhz zərflər hər iki funksiyaya malik əsas söz qrupudur. Digər nitq hissələrinə aid olan sözlərin lüğət məqalələrində verilən izahlarda təyinedici qismində məhz zərflər istifadə olunur. Bu səbəbdən də zərflər temporallıq sahəsinin əsas komponentlərindən biri sayılmalıdır.

Nisbi temporal lokallaşdırma funksiyasını reallaşdırmaqda Azərbaycan dilində qoşmaların, ingilis dilində isə sözönülərin nəzərəçarpan səciyyəvi xüsusiyyəti ondan ibarətdir ki, onlar nitqdə müstəqil işlənə bilmirlər. Qoşmalar və sözönülər həmişə qoşulduğu sözlərlə birlikdə temporal lokallaşdırmanı reallaşdıra bilir. Kommunikasiya prosesində temporal lokallaşdırmanı reallaşdırmaq üçün qoşmaların və sözönülərin qoşulduğu sözlərin əksəriyyəti temporal məzmunlu leksik vahidlərdir.

Hər iki dildə tədqiq edilən düzəltmə və ya mürəkkəb temporal leksik vahidlərin semantik strukturunda iki məna çaları ayırd edilə bilir. Onlardan biri «hərəkət, hadisə, proses və ya işin adı»dır və o özünü söz köklərində (kök-morfemlərdə)

---

[1] Azərbaycan dilinin izahlı lüğəti. II c., Bakı, 1999, s. 89.
[2] Yenə orada, s. 89.

göstərir. Digər çalar isə «aidlik, nisbət, əlaqələndirmə» çalarıdır. O da özünü önşəkilçilərdə və ya mürəkkəb sözlərin ikinci komponentində büruzə verir. Bu səbəbdən Azərbaycan dilində nisbi temporal lokallaşdırma funksiyalı aşağıdakı sözyaratma vasitələrini fərqləndirmək olar: *həm-, post-* önşəkilçiləri və mürəkkəb sözlərin **...***qabağı, ...öncəsi, ...sonrakı, ...qədərki* komponentləri. *Həm-* önşəkilçisi «eynizamanlılıq» mənası daşıyır, isim (*həməsr, həmyaş, həmyaşlıq, həmyaşıd, həmyaşıdlıq, həmzaman*) və sifət (*həmvaxt, həmyaş, həmyaşıd*) əmələ gətirir. *Post-* önşəkilçisi «sonragəlmə» mənasına malikdir. Bu önşəkilçi də isim (*postimpressionizm, postmodernizm*) və sifətlərin (*postsovet, postmodernist*) əmələ gəlməsində iştirak edir. Qeyd etmək lazımdır ki, *post-* önşəkilçisi Azərbaycan dilində hələ tam vətəndaşlıq hüququ qazanmamışdır. Son dövrlərdə Qərbi Avropa dillərindən bizim dilimizə keçən sözlərin tərkibində özünü göstərən bu şəkilçinin hələlik Azərbaycan mənşəli sözlərlə birləşərək söz yaratması müşahidə olunmur. Sonragəlmə mənası **...***sonrakı* komponentinin iştirak etdiyi mürəkkəb sözlərdə özünü göstərir. Mürəkkəb sözlərdə **...***qabağı, ...öncəsi,...qədərki* komponentləri öncəgəlmə mənası yaradır.

Bu sahədə ingilis dilində önşəkilçilər kəmiyyət etibarilə üstünlük təşkil edir. İngilis dilində nisbi temporal lokallaşdırma funksiyalı sözyaratma vasitələrinə *after-, ante-, fore-, co- (con-, com-), post-, pre-* önşəkilçilərini nümunə göstərmək olar. Onlardan *ante-, fore-, pre-* önşəkilçiləri öncəgəlmə, *co- (con-, com-)* önşəkilçisi eynizamanlılıq, *after-, post-* önşəkilçiləri isə sonragəlmə ifadə edir.

Azərbaycan və ingilis dilləri üçün temporallıq sahəsi konstituentlərinin sadə genişləndirilmiş cümlə və mürəkkəb cümlə səviyyələrində reallaşdırdığı semantik funksiyaları da eyni üsulla tədqiq etmək olar. Bununla belə, ümumi nəticə çıxarmaq olar ki, temporallıq sahəsi konstituentlərinin reallaş-

dırdığı xüsusi semantik funksiyalar arasında mütləq temporal lokallaşdırma funksiyası digər funksiyalardan fərqli olaraq cümlədə müstəqil şəkildə gerçəkləşə bilir. Məhz bu xüsusiyyətinə görə mütləq temporal lokallaşdırma funksiyası üstünlük qazanır. Yuxarıda ayrı-ayrı nümunələr əsasında haqqında bəhs etdiyimiz digər iki xüsusi semantik funksiya isə nitqdə yalnız mütləq temporal lokallaşdırma funksiyası ilə birlikdə reallaşa bilir.

### 2.4. İkinci fəslə dair nəticələr

Temporallıq makrosahəsi çoxcəhətli, rəngarəng ifadə vasitələrinə malik olan dinamik funksional struktur olub, gerçəkliyin perseptual zaman vasitəsilə inikasını əks etdirir. Temporallıq sahəsi həm üfüqi, həm də şaquli strukturuna görə müqayisə edilən dillərdə müəyyən oxşarlıq nümayiş etdirir. Temporallıq sahəsinin Azərbaycan və ingilis dillərinin materialları əsasında öyrənilməsi obyektiv gerçəkliyin zaman strukturunun müəyyən cəhətlərini üzə çıxarmağa imkan verir. Tədqiq edilən dillərdə üfüqi struktur üzrə nəzərdən keçirdiyimiz indiki, keçmiş və gələcək zaman mikrosahələri arasında müşahidə edilən fərqlər obyektiv zaman anlayışlarının dərk edilib anlanması prinsiplərində və onların nitqdə ifadə mexanizmlərində olan fərqlərdən irəli gəlir. Belə ki, hər iki dildə keçmiş zaman mikrosahəsi daha çox morfoloji yönümü və sahənin leksik periferiyasının məhdudluğu ilə seçilir. Azərbaycan dilində bütün morfoloji ifadə vasitələri sintetik, ingilis dilində isə həm sintetik, həm də analitik üsulla yaranır. Azərbaycan dilindən fərqli olaraq, ingilis dilində keçmiş zaman sahəsi morfoloji vasitələr hesabına daha güclü detallaşma səviyyəsinə malikdir. Azərbaycan dilində morfoloji ifadə vasitələrinin sayının azlığına baxmayaraq, həmin ifadə vasitələrinin potensiyası imkan verir

ki, keçmişlə bağlı olan bütün semantik çalarları büruzə verə bilsin.

İndiki zaman mikrosahəsi tədqiq edilən dillərdə digər mikrosahələr arasındakı dominantlığı ilə seçilir. Burada Azərbaycan dilindəki özəllik xüsusi vurğulanmalıdır. İngilis dilində indiki zaman mikrosahəsinin dörd morfoloji ifadə vasitəsinə qarşı Azərbaycan dilində bir indiki zaman forması dayanır. Semantik çalarların hamısı bir indiki zaman vasitəsilə ifadə olunur. Hər iki dildə indiki zaman formaları digər mikrosahələrə aid olan semantikanı ifadə edə bilər.

Gələcək zaman mikrosahəsi hər iki dildə modal xarakteri ilə seçilir. Bu mikrosahə ingilis dilində digər mikrosahələrlə müqayisədə amorfluğu, nüvə və leksik periferiya arasında dəqiq sərhədlərin olmaması ilə xarakterizə edilə bilər. İngilis dilində bu mikrosahənin dörd morfoloji ifadə vasitəsi olmasına baxmayaraq, az qrammatikləşmişdir. Hətta morfoloji ifadə vasitələrindən birinin (*Future Perfect Cotinuous*) kommunikasiya prosesində istifadə edilmə işləkliyi həddən artıq aşağıdır. İngilis dilində bu mikrosahədə morfoloji vasitələrin rolunun az olması faktı «gələcək və modallıq anlayışlaının üzvi şəkildə bir-birinə çulğaşmasını əks etdirir və bu funksional planda zaman və modal vahidlərin rəqabətində təzahür edir»[1]. O da vurğulanmalıdır ki, qrammatikləşmə səviyyəsi az olsa da, bu cəhət leksik vahidlər hesabına kompensasiya olunur. Azərbaycan dilində qrammatikləşmə səviyyəsi digər mikrosahələrlə müqayisədə ciddi fərqlər göstərmir.

Temporallıq sahəsi konstituentlərinin semantik funksiyaları baxımından araşdırılması tədqiq edilən dillərdə fərqlərin olmadığını üzə çıxarır. Hər iki dildə mütləq temporal lokallaşdırma funksiyası digər funksiyalardan fərqli olaraq cümlədə

---

[1] Тарасова Е.В. Языковое поле темпоральности в синхронии и диахронии, Автореф. дисс. ... докт. филол. наук. Краснодар, 1993, с. 26

müstəqil şəkildə gerçəkləşə bilir. Digər semantik funksiyalar isə nitqdə yalnız mütləq temporal lokallaşdırma funksiyası ilə birlikdə reallaşır.

# III FƏSİL

# LEKSİK TEMPORALLIQ SAHƏSİ

## 3.0. Temporal leksikanın tədqiqinə dair

Funksional-semantik temporallıq sahəsinin tərkib hissələrindən biri əsasında universal zaman kateqoriyasının dayandığı leksik temporallıq sahəsidir. Leksik temporallıq sahəsinə zaman anlayışlı və ya temporal sözlər daxildir. Müxtəlif dövrlərdə, xüsusən də XX yüzilliyin ikinci yarısından başlayaraq bir çox dilçilər temporal mənalı sözləri tədqiqata cəlb etmişlər. Temporal leksikanın sistemli şəkildə öyrənildiyi rus və ingilis dillərini bu cəhətdən xüsusi qeyd etmək lazımdır. Temporal leksika həmin dillərin, eləcə də başqa dillərin materialları əsasında və ya müqayisəli şəkildə həm sinxron, həm də diaxron planda öyrənilmişdir.

Bu və ya digər səpkidə aparılan tədqiqat işlərində əsasən ayrılıqda götürülmüş bir dilin materialları tədqiq edilir[1] və ya iki, yaxud daha çox dilin müqayisəli, tipoloji təhlili verilir[2].

---

[1] Всеволодова М.В. Способы выражения временных отношений в современном русском языке. М., 1975; Каращук В.А. Темпоральные прилагательные в современном русском языке. АКД, Ташкент, 1978; Клименко А.П. Существительные со значением времени в русском языке, Автореф. дисс. ... канд. филол. наук. Минск, 1965; Морковкин В.В. Опыт идеографического описания лексики (Анализ слов со значением времени в русском языке). М., 1977; Рудометкина М. И. Слова категории времени (на материале английского языка), АКД, Киев, 1972; Василенко О.В. Функционирование наречий времени современного английского языка в текстах различных стилей. Автореф. дисс. ... канд. филол. наук. Киев, 1998; Атаева А. Лексические средства выражения времени в туркменском языке. Автореф. дисс. ... канд. филол. наук, Ашгабат, 1993.

[2] Волянская И.В. Лексико-семантические особенности существительных, обозначающих единицы измерения времени в английском и русском языках. Автореф. дисс. ... канд. филол. наук. М., 1973; Аскарова А.Х. Се-

Bu tədqiqatlar biri-birindən araşdırılan materialın həcminə görə də seçilir. Onlarda tədqiqat spektri ayrıca temporal leksemin, kök-sözün təhlilindən tutmuş[1], leksik-semantik və leksik-qrammatik sistemə qədər genişlənir[2].

Bu sahədə aparılmış bir sıra işlərdə zaman kateqoriyasının ekstralinqvistik və linqvistik reallıqları, zaman anlayışları və onların dildə ifadəsinin nisbəti kimi məsələlər təhlil olunur, zamana tarixi, kulturoloji hadisə olaraq yanaşılır. Belə tədqiqatlar artıq dar linqvistik çərçivədən çıxır, fəlsəfə, kulturologiya, psixologiya və dilçilik kimi elm sahələrinin qovşağında baş verən hadisələri araşdırır[3].

Yuxarıda qeyd etdiyimiz tədqiqatlar arasında temporal mənalı sözləri əhatəetmə baxımından V.V.Morkovkinin rus dilində zaman mənalı leksikanın ideoqrafik təsvirinə həsr olunmuş tədqiqatı xüsusi seçilir. Tədqiqatda leksik zaman sahəsi nisbi və qeyri-nisbi zaman olmaqla ikişaxəli semantik

---

мантические процессы в рамках лексико-семантического макрополя времени (на материале русского, английского и немецкого языков). Автореф. дисс. ... канд. филол. наук. Саратов, 1992.

[1] Балясникова Л.А. Лексико-семантическое развитие слов с этимологическим корнем *доб-* (из истории корнеслова русского языка). Автореф. дисс. ... канд. филол. наук. Л., 1974.

[2] Шепин А.Г. Лексико-грамматичесое поле времени в современном русском языке (Время в поэтической речи), Иркутск, 1974; Щербин В.К. Общее и специфическое в лексико-семантических системах близкородсвенных языков (На материалах русской и белорусской пространственной и временной лексики). Автореф. дисс. ... канд. филол. наук. Минск, 1983.

[3] Караулов Ю.Н. Языковое время и языковое пространство // Вестник МГУ. М., 1970, № 1, с.61-73; Маковский М.М. «Картина мира» и миры образов (Лингвокультурологические этюды) // Вопросы языкознания, М., 1992, № 6, с.36-53; Юрченко В.С. Реальное время и структура языка // Вопросы языкознания, М., 1993, № 3, с.36-47

ağac şəklində təsəvvür edilir. Burada hər bir qrupa daxil edilmiş zaman anlayışlı sözlər 23 əlamət üzrə təsnif edilir[1].

Zaman leksikasının təhlilində A.X.Askarovanın tətbiq etdiyi yanaşma tərzi də maraq doğurur. İngilis, rus və alman dillərinin materialları üzrə leksik-semantik zaman makrosahəsindəki semantik prosesləri izləyən tədqiqatçı zamanın obyektiv rəngarəngliyinin əks olunmasında müxtəlif səviyyəli mücərrədləşmə prinsipindən çıxış edərək birlikdə leksik-semantik zaman makrosahəsini əmələ gətirən beş müstəqil heterogen leksik-semantik sahə (LSS) fərqləndirir: LSS I «təbii şəraitin hissi qavranılan konkret siklləri» (təbiət zamanı); LSS II «insanın həyat vəziyyətinin siklləri» (insan zamanı); LSS III «zamanın konkret ölçülməsi» (sosial zaman); LSS IV «ümumi(ləşdirilmiş) zaman» («обобщенное время»); LSS V «relyativ zaman»[2].

Həmin əsərdə zaman kateqoriyasının dərin konseptual təhlili verilmişdir. LSS-dəki semantik proseslər orada sinxron və diaxron planda nəzərdən keçirilir. Bunlarla bərabər, müəllifin bəzi müddəaları ilə razılaşmaq çətindir. Məsələn, tədqiqatçıya görə, LSS I və LSS II makrosahənin nüvəsini təşkil edir, digər LSS-lər isə onlarla növ münasibətində qalır: «Makrosahənin nüvəsi denotativ oriyentasiyalı sahələrdir: LSS I ...(təbiət zamanı) və LSS II ... (insan zamanı). Zamanın kəmiyyət aspekti və zamanın mücərrəd dərk olunması ilə bağlı olan sahələr LSS I və LSS II əsasında meydana çıxmışdır və onlarla növ münasibətindədir...»[3]. Genetik baxımdan bu mülahizə-

---

[1] Морковкин В.В. Опыт идеографического описания лексики (Анализ слов со значением времени в русском языке). М., 1977 с. 86-92

[2] Аскарова А.Х. Семантические процессы в рамках лексико-семантического макрополя времени (на материале русского, английского и немецкого языков). Автореф. дисс. ... канд. филол. наук. Саратов, 1992, с. 9-14.

[3] Yenə orada, s. 9.

nin doğruluğuna şübhə edilmir. Lakin müasir semantik sahə nəzəriyyəsinə görə, sahənin nüvəsini ən mücərrəd leksemlər təşkil edir. Bu mücərrəd mənalı leksemlər daha konkret mənalı digər vahidlərin müvafiq sahəyə aid edilib-edilməməsində identifikator rolunu oynayır. Biz öz tədqiqatımızda Azərbaycan və ingilis dillərində leksik temporallıq sahəsinin modelini qurarkən, sahənin nüvəsini təşkil edən elementləri üzə çıxararkən məhz bu prinsipə əsaslanmışıq (bax: 3.1.1.-ci bölmə).

Azərbaycan dilçiliyində temporal leksikanın araşdırılmasına həsr olunmuş xüsusi tədqiqat işləri yoxdur. Lakin həmin məsələyə ötəri nəzər salınması, temporal leksikaya aid müəyyən nümunələrin sadalanması hallarına rast gəlmək olar.

Belə tədqiqatlardan biri Azərbaycan dilinin leksik-semantik sisteminin araşdırılmasına həsr olunmuşdur[1]. Elmi-nəzəri sanbalı ilə seçilən bu tədqiqatda Azərbaycan dilinin leksik-semantik sisteminin öyrənilməsinin nəzəri əsasları nəzərdən keçirilir, bu sahədə aparılan tədqiqatların metodikası və onların yekunlarına müəllif baxışı ortaya qoyulur. Müəllifin dillərin leksik sisteminin sinxron planda öyrənilməsinin perspektivləri barəsində mülahizələri də maraq doğurur. Əsərin müəyyən hissəsi zaman adlarının semantik sisteminə həsr olunmuşdur. Burada müəllif zaman vahidlərini, gün, ay, fəsil, il adlarını araşdırmış, zaman adlarından törəmə tematik söz qruplarını üzə çıxarmışdır.

### 3.1. Leksik temporallıq sahəsinin semantik strukturu

Temporallıq makrosahəsinin şaquli strukturunda özünəməxsus mövqeyi və rolu olan elementlərdən biri temporal leksika sahəsidir. Temporal leksika hər bir dildə mühüm seman-

[1] Cəfərov Q. Azərbaycan dilinin leksik-semantik sistemi. Bakı, Elm, 1984.

tik funksiyalar daşıyır. Temporal leksikanın leksik-semantik temporallıq sahəsini əmələ gətirməsi barədə yuxarıda bəhs edilmişdi. Leksik-semantik temporallıq sahəsini əmələ gətirən vahidlər yekcinslik nümayiş etdirmir. Onların arasında elə vahidlər vardır ki, həm sintaqmatik, həm də paradiqmatik planda temporallıq ifadə edir. Bir sıra digər vahidlər isə sintaqmatik planda, başqa leksik vahidlərlə birləşmədə temporallıq mənasını nümayiş etdirsələr də, paradiqmatik planda bu mənaya malik olmurlar. Bəzi vahidlər hadisələri zaman çərçivəsində lokallaşdırır, bəziləri isə belə funksiya yerinə yetirə bilmirlər. Lokallaşdırma funksiyasında çıxış edən vahidlərin bir qrupu nitq momentinə görə zamanı ifadə edir, bir qrupu zaman münasibəti, digərləri isə müddət və ya uzunluq bildirir. Aparılan müşahidələr belə bir qənaətə gəlməyə əsas verir ki, temporal leksika bir-biri ilə sistemli qarşılıqlı əlaqəli qruplar şəklində strukturlaşmışdır. Həmin qrupların müəyyən hissəsi sabit vahidlərdən təşkil olunmuşdur və belə qruplara başqa vahidlərin daxil edilməsi qeyri-mümkündür. Başqa sözlə desək, onlar qapalı sistem əmələ gətirir. Məsələn, ay, gün, günün hissələri və fəsil adlarının daxil olduğu qruplar qapalı sistemə nümunə ola bilər. Saat, dəqiqə, həftə və ayın günlərinin miqdarı da qapalı sistemə aid edilə bilər. Digər qruplar açıq sistem əmələ gətirir.

### 3.1.1. Leksik temporallıq sahəsinin struktur-semantik modeli

Zaman anlayışının bir konseptual kateqoriya kimi əhatəli, dürüst, adekvat tərifinin verilməsi probleminin çətinliyi, mürəkkəbliyi bu problemin biliklərin aksiomatik səviyyəsində araşdırılması tələbi ilə şərtləşir. Bəllidir ki, zaman (məkanla bərabər) materiyanın mövcudluq forması olub obyektiv mahiyyət daşıyır və həm kəmiyyət, həm də keyfiyyət xassələrinə malikdir. Zamanın, eləcə də məkanın ölçülməsi və hesablan-

ması onun kəmiyyət xassələrindən asılıdırsa, zaman və məkan etibarilə daim hərəkətdə olan materiyanın subyektiv qavranması, dərk edilməsi zamanın, həmçinin məkanın keyfiyyət xassələri ilə bağlıdır. Burada biz temporallıq leksik-semantik sahəsinin struktur-semantik modelinin qurulması əməliyyatında zaman anlayışının «intuitiv cəhətdən gerçək və təcrübədə təsdiqlənmiş modelinə»[1] əsaslanacağıq.

Hər hansı bir dildə zaman anlayışının bütün leksik ifadə vasitələrinin toplusunu zaman və ya temporallıq leksik-semantik sahəsi (LSS) kimi təsəvvür etmək olar. Temporallıq LSS-nin vahidləri isə bizi əhatə edən gerçəkliyin ümumi konseptual modelindəki mücərrəd zaman modelini əmələ gətirən temporal anlayışların sözlər şəklində verilməsi, təqdim edilməsi vasitəsidir.

Temporallıq LSS vahidlərinin, yaxud temporal leksikanın bir sıra xüsusiyyətləri onları konstruktiv tədqiqat obyektinə çevirməyə imkan verir. Belə bir tədqiqat obyekti isə ilk növbədə zaman anlayışını ifadə edən dil vasitələrinin ümumi sistemində həmin leksik vahidlərin yerinin müəyyənləşdirilməsi, temporal leksikanın obyektiv şəkildə mövcud olan dilxarici aləmlə əlaqə və münasibətlərinin xarakterinin aydınlaşdırılması kimi bir çox məsələlərin işıqlandırılmasını tələb edir.

Temporal leksikanı qrammatik zaman kateqoriyasının tədqiqindən təcrid olunmuş şəkildə öyrənmək mümkün deyildir, çünki temporallıq anlayışının ifadəsində leksik və qrammatik vasitələr qarşılıqlı şəkildə əlaqəlidir. Əgər felin zaman formalarının vəzifəsi cümlədəki hadisələrin və proseslərin zaman əlaqəsini göstərmək, onları zaman daxilində lokallaşdırmaqdırsa, müvafiq rolu başqa dil vasitələri də yerinə yetirə bi-

[1] Морковкин В.В. Опыт идеографического описания лексики ( Анализ слов со значением времени в русском языке). М., 1977, с. 51.

lir[1]. Həqiqətən, müxtəlif cümlə strukturlarında felin zaman formalarının köməyi olmadan da nəql olunan hadisələrin zaman daxilində lokallaşdırılmasının mümkünlüyünün şahidi oluruq. Bundan əlavə, fel formaları ilə reallaşan zaman planının çox vaxt temporal leksik ünsürlərlə tamamlanmasına rast gəlirik və bu yolla da temporal leksikanın təsriflənən felin aparıcı qrammatik kateqoriyasına təsir etdiyini görürük .

İngilis və Azərbaycan dillərinin izahlı lüğətlərində qeydə alınmış temporal leksikanın lüğət definisiyalarını nəzərdən keçirdikdə, onların leksik mənalarında aşağıdakıların öz əksini tapdığını aşkar edirik:

1) temporal leksika leksik məna etibarilə daim hərəkətdə olan, dəyişən ümumi mücərrəd zaman anlayışı ifadə edir;

2) bu sözlərin leksik mənasında müxtəlif uzunluğa malik zaman kəsiklərinə bölünmə və onların ölçülmə xüsusiyyətləri ifadə olunur;

3) həmin sözlərin leksik mənasında hər hansı bir hesablama və ya çıxış nöqtəsi, yəni nitq momenti, başqa bir hərəkət və hadisə ilə əlaqəli zamanın keçmiş, indiki və gələcək sferalarına bölgüsü təzahür edir;

4) temporal leksika iş, hal və ya hərəkətin zaman daxilində uzunluğa, intensivliyə, təkrarlığa, ardıcıllığa və s. xüsusiyyətlərə görə başvermə səciyyəsini bildirir;

5) temporal leksikanın mənasında ümumi zaman nizamı açıq-aşkar görünür.

Bunları ümumiləşdirərək demək olar ki, temporal sözlərin leksik mənalarında dünyanın zaman xassələri konseptual və perseptual zaman anlayışları vasitəsilə təmsil və ifadə olunur. Qeyd etmək lazımdır ki, daha geniş planda yanaşsaq, yuxarıda sadaladıqlarımız təkcə ingilis və Azərbaycan dilləri

---

[1] Бондарко А.В. Грамматическая категория и контекст. М.-Л., 1971, с. 8-11.

üçün deyil, həm də başqa dillərdəki temporal sözlər üçün xarakterikdir.

Struktur nöqteyi-nəzərindən yanaşsaq, temporallıq leksik-semantik sahəsi mürəkkəb struktur-semantik bütöv olub, ümumi temporal məna ilə birləşmiş, bir-biri ilə qarşılıqlı əlaqədə olan mikrosahələrin, qrup və yarımqrupların iyerarxik şəkildə təşkil olunmuş sistemidir.

Temporallıq leksik-semantik sahəsinin struktur-semantik modelini qurmaq üçün tədqiqata ingilis və Azərbaycan dillərinin izahlı və tərcümə lüğətlərində qeydə alınmış temporal leksika cəlb edilmişdir. İngilis dilinin sanballı leksikoqrafik mənbələri olan A.S.Hornby. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. 1-11, 1982, Большой англо-русский словарь və Cambridge Advanced Learner's Dictionary elektron lüğətindən müxtəlif nitq hissələrinə aid olan, zaman anlayışının dominant olduğu sözlər seçilmişdir. Leksemlərin mənalarının izahında *time* sözü və həmin sözün ideoqrafik sinonimlərinin işlənməsi seçmə meyarı kimi qəbul edilmişdir. Qeyd olunmuş mənbələrdən leksik mənalarının izahında *time* sözünün və onun ideoqrafik sinonimlərinin işləndiyi temporal anlayışlı 427 söz seçilmişdir. Onlardan 140-ı isim, 114-ü sifət, 85-i zərf, 35-i fel, 28-i bağlayıcı, 25-i isə sözönüdür.

Eyni əməliyyat Azərbaycan dili üçün də yerinə yetirilmişdir. Temporallıq leksik-semantik sahəsinin struktur-semantik modelini qurmaq üçün Azərbaycan dilinin izahlı lüğətlərində, azərbaycanca-ingiliscə və azərbaycanca-rusca lüğətlərdə qeydə alınmış, müxtəlif nitq hissələrinə aid olan, mənasında zaman anlayışının dominant olduğu sözlər seçilmişdir. İngilis dili üçün olduğu kimi, Azərbaycan dilində də mənalarının izahında «zaman» sözü və onun ideoqrafik sinonimlərinin işlənməsi seçmə meyarı qəbul edilmişdir. Beləliklə, temporal anlayışlı 473 söz seçilmişdir. Onlardan 159-u isim, 153-ü sifət, 137-si zərf, 17-si fel, 2-si qoşma, 1-i bağlamadır.

Hər iki dildə temporal leksikanın seçilməsində bütün sadə, düzəltmə və mürəkkəb sözlər nəzərə alınmışdır. Yalnız sadə temporal leksikanın seçildiyi və törəmə sözlərin nəzərə alınmadığı halda onların miqdarı hər bir dildə 130-150 arasında dəyişir.

İngilis dilində leksik-semantik sahənin adı kimi çıxış edən *time* sözü sözyaratmada ən çox iştirak edən leksik vahiddir. Bu sözün törəmələri arasında 67 isim, 17 sifət, 4 zərf, 4 fel, 1 nida və 1 şəkilçi vardır[1]. Bütün bunlar temporal mənasına görə struktur-semantik modelini verməyə çalışdığımız temporallıq leksik sahəsinə daxildir.

Qarşılaşdırdığımız dillərin hər biri üçün seçilmiş temporal leksikanı iki hissəyə ayırmaq olar. Birinci qrupa əsasən temporal isimlər və zərflər, eləcə də sifətlər daxildir. Bu sıradan olan isimlər zamanı real obyekt kimi, zaman müddəti kimi, zaman kəsikləri olaraq adlandırır. Zərflər isə hərəkət, hadisə və proseslərin zaman daxilindəki təkrarlığını, onların müddətini, davametmə uzunluğunu ifadə edir. İkinci qrupa müxtəlif nitq hissələrinə aid olan, «keçmiş-indiki-gələcək» planında ifadə olunan hərəkət, hadisə və proseslərin zaman əlaqəsi və münasibətlərini ifadə edən sözləri daxil etmək olar. Bu qrupların hər birini ayrıca mikrosahə hesab etmək olar.

Beləliklə, ingilis və Azərbaycan dillərində temporallıq LSS özündə iki leksik-semantik mikrosahəni (LSmS) ehtiva edir: Birinci LSmS və İkinci LSmS. Birinci LSmS qeyri-nisbi zamanı, İkinci LSmS isə nisbi zamanı ifadə edən sözləri əhatə edir.

İndi isə qarşılaşdırılan dillər üçün hər iki mikrosahəni təşkil edən vahidləri nəzərdən keçirək.

---

[1] Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk.

Birinci LSmS-ni təşkil edən sözləri aşağıdakı leksik-semantik qruplara (LSQ) bölmək olar:

**I LSQ** müəyyən müddətli zaman kəsiklərinin adlarını əhatə edir ki, bunlar da zamanın ölçü və hesablanma vahidləridir:

***Azərbaycan dilində:*** *saniyə, dəqiqə, saat, gün, həftə, ay, il, qərinə, əsr, yüzillik, minillik.*

***İingilis dilində***: *second, minute, hour, day, week, fortnight, month, year, decade, century, millenium.*

Hər iki dildə bu leksik-semantik qrupa daxil olan isimlərin hər biri iyerarxiya cəhətdən biri özündə o birini ehtiva edir. Məsələn, *miniillik* on *yüzillik*dən, *il* 12 *ay*dan, *ay* 4 *həftə* və ya 28-31 *gün*dən, *həftə* 7 *gün*dən, *gün* 24 *saat*dan, *saat* 60 *dəqiqə*dən, *dəqiqə* 60 *saniyə*dən ibarətdir. Bunların hər biri qəbul edilmiş beynəlxalq zaman vahidləridir.

**II LSQ** qeyri-müəyyən müddətli zaman kəsiklərinin adlarından ibarət üç yarımqrupu əhatə edir:

1) zaman, vaxt müddətlərini ifadə edən ümumi sözlər – **azərb**.: *dövr, interval, mərhələ, müddət, ara*; **ing.**: *period, interval, space, spell, stage, term, tide, while*;

2) böyük zaman kəsiklərini ifadə edən sözlər – **azərb**.: *era, epoxa, əbədiyyət*; **ing**.: *age, epoch, era, eternity*;

3) ən qısa zaman kəsiklərini ifadə edən sözlər – **azərb**.: *an, moment, qırpım, ləhzə, dəm*; **ing.**: *moment, instant, trice, wink.*

**III LSQ** müddəti əsasən müəyyən olan zaman kəsiklərini əhatə edir. Bura zaman kəsiklərinin mənası etibarilə daha konkret olan və dövri xarakter daşıyan sözlər daxildir. Onlar iki yarımqrup əmələ gətirir:

1) ilin fəsillərinin adları – **azərb**.: *yaz, yay, payız, qış*; **ing**.: *spring, summer, autumn (fall), winter*;

2) günün hissələrinin adları. Bu yarımqrupu da iki yerə bölmək olar:

a) günün əsas hissələrinin adları – **azərb.**: *gündüz, səhər, axşam, gecə*; **ing**.: *day, morning, afternoon, evening, night*;

b) günəşin vəziyyətinə görə günün hissələrinin adları – **azərb**.: *sübh, günçıxan, şəfəq, sabah, günorta, günbatan, qürub, toran, gecəyarı*; **ing**.: *midday, even, midnight, dawn, sunrise, sunset, evenfall, evenlight, twilight, forenoon, noon, noonday, forenight, daybreak, daytime, dusk.*;

**IV LSQ** iki yarımqrupdan ibarətdir:

1) ay adları – **azərb**.: *yanvar, fevral, mart, aprel, may, iyun, iyul, avqust, sentyabr, oktyabr, noyabr, dekabr*; **ing**.: *January, February, March, April, May, June, July, August, September, October, November, December*;

2) həftənin günlərinin adları – **azərb**.: *bazar ertəsi, çərşənbə axşamı, çərşənbə, cümə axşamı, cümə, şənbə, bazar*; **ing**.: *Monday, Tuesday, Wednesday, Thursday, Friday, Saturday, Sunday*;

Diqqət yetirildikdə III və IV LSQ-lərin həm müəyyən müddətli zaman kəsiklərini ifadə etmək, həm də dövri xarakter daşıması cəhətdən bir-biri ilə əlaqəli olduğu aşkarlanır.

**V LSQ** hərəkətin zaman daxilində müddətinə və ya uzunluğuna görə baş verməsini xarakterizə edən sözlərdən təşkil olunur: – **azərb**.: *uzun, daima, daimi, həmişə, davamlı, ardıcıl, əbədi, əbədiyyən* və s. **ing**.: *long, always, constant, constantly, continuos, continuously, eternal, forever, permanent, still, permanently* və s.

**VI LSQ** hərəkət, prosess və hadisələrin zaman daxilində təkrarlılığını ifadə edən sözləri əhatə edir: – **azərb**.: *yenə (də), təkrar, təkrarən, adətən, tez-tez, gündəlik, bəzən, dövri* və s.; **ing**.: *again, frequently, repeatedly, usually, often, once, twice, houly, dayly, seldom, sometimes, rare, rarely, regularly, regular, periodical, periodically* və s.

Seçilmiş sözlər arasında elələrinə rast gəlmək olur ki, onlar müəyyən situasiyalarda bu sahəyə aid olan isimlərin funk-

siyalarına ekvivalent olan funksiyalarda işlənir. Belə isimlərin temporal mənası birbaşa yox, dolayısı ilə başa düşülür. Onlardakı zaman mənası implisit tərzdə onların ilkin leksik-semantik variantlarında mövcud ola bilər. Belə sözləri ayrıca – **VII LSQ** şəklində ayırmaqla aşağıdakı yarımqruplara bölə bilərik:

1. İnsanın yaş dövrlərinin adlarını bildirən sözlər – **azərb**.: *uşaqlıq, gənclik, qocalıq, ahıllıq*; **ing**.: *adolesence, adulthood, childhood, infancy, maturity, schooldays, youth* və s.; Buraya *ömür, ölüm, yaş* və *life, death, age* sözlərini də əlavə etmək olar;

2. Yemək adlarını bildirən leksik vahidlər – **azərb**.: *səhər (yeməyi), nahar, günorta (yeməyi) şam(yeməyi)* və s.; **ing**.: *breakfast, lunch, dinner, luncheon, supper, tea, high tea* və s.;

3. İnsanın təhsil, iş, istirahət və s. fəaliyyəti ilə əlaqədar olan dövrlərin adlarını bildirən sözlər – **azərb**.: *sessiya, tətil, məzuniyyət* və s.**;** **ing**.: *session, holidays, vacation* və s.

4. Təqvim anlayışlarını, bayramların adlarını bildirən leksik vahidlər – **azərb**.: *təqvim, Novruz Bayramı, Yeni il, Milad bayramı, Ordu Günü, Bilik Günü* və s.**;** **ing**.: *calendar, weekday, weekend, Ascension (Day), April Fool's Day, May Day, Boxing Day, Thanksgiving Day, Christmas Day, Xmas Day, New Year's Day* və s.

5. Təbiət və cəmiyyətin inkişaf tarixindəki dövrlərin adlarını bildirən leksik vahidlər – **azərb**.: *paleolit, neolit,feodalizm, Renessans* və s.; **ing**.: *paleolith, The Stone Age, The Bronze Age, The Iron Age, feudalism, capitalism, The Norman Conquest, the Renaissance* və s.

6. Cəmiyyətin həyatında baş verən hadisələrin, inqilabların, müharibələrin adlarını bildirən sözlər – **azərb**.: *Yüzillik müharibə, I Dünya müharibəsi, II Dünya müharibəsi* və s.; **ing**.: *The Great War, The First World War, World War II* və s.

Yarımqrupların sayını artırmaq da olar. Bundan əlavə, hər bir yarımqrupa daxil olan vahidləri daha da ətraflı öyrənmək məqsədilə yarımqrupların özlərini də ayrı-ayrı hissələrə ayırmaq mümkündür. Lakin bunu etmədən də Birinci LSmS-nin struktur-semantik modelinin konturları artıq göz önündədir. Ümumiləşdirmə aparmaq olar.

Beləliklə, ingilis və Azərbaycan dillərində temporallıq LSS-nin təşkil olunduğu iki mikrosahədən birincisinin, yəni qeyri-nisbi zamanı ifadə edən Birinci LSmS-nin struktur-semantik modelini aşağıdakı kimi təsəvvür etmək olar:

- ingilis dili üçün «time» sözü gerçəklikdə cərəyan edən hadisə, proses və hərəkətlərin «əsrlər, illər, saatlar, dəqiqələr və saniyələrlə ölçülən davam müddəti, uzunluğu» mənasında bu mikrosahənin adı kimi çıxış edir;

- Azərbaycan dili üçün gerçəklikdə cərəyan edən hadisə, proses və hərəkətlərin «əsrlər, illər, saatlar, dəqiqələr və saniyələrlə ölçülən davam müddəti, uzunluğu» mənasında «zaman» sözü bu mikrosahənin adı olaraq çıxış edir;

- hər iki dildə mikrosahənin əsasını və ya nüvəsini I və II LSQ-lər təşkil edir, çünki zaman mənasının ən çox konsentrasiya olunduğu vahidlər burada cəmləşmişdir;

- müqayisə edilən dillərdə mikrosahənin nüvəətrafı zonasını III və IV LSQ-lər təşkil edir. Bu leksemlər zaman semasının maksimal konsentrasiyası baxımından I və II LSQ-lərdəki sözlərə yaxınlaşsalar da, onlar qədər deyildir. Diqqət yetirildikdə, IV LSQ-ni təşkil edən sözlərin temporal məna etibarilə III LSQ-dəki vahidlərdən «gücsüs» olduğu məlum olur. Zaman mənasının mövcudluğu, varlığı baxımından onları nüvəətrafı zona ilə periferiya arasındakı keçid zonasında yerləşdirmək daha məqsədəuyğun olardı.

- mirkrosahənin periferiyasını təşkil edən V və VI LSQ-lərin vahidlərində artıq temporal mənadan daha çox hərəkətin zaman daxilində müddətə, uzunluğa, təkrarlılığa görə cərəya-

netmə xarakteristikası öz əksini tapır. VII LSQ-nin vahidlərində temporal məna daha arxa plandadır: bu məna o qədər zəifləmişdir ki, onu bərpa etmək üçün həmin vahidlərin ilkin leksik-semantik variantlarına müraciət etmək lazım gəlir. Bunlardan çıxış edərək belə qənaətə gəlmək olar ki, V və VI LSQ-lər mikrosahənin yaxın, VII LSQ isə uzaq periferiyalarını təşkil edir.

İndi isə temporallıq LSS-nin təşkil olunduğu İkinci LSmS-nin vahidlərini nəzərdən keçirək. Yuxarıda qeyd edildiyi kimi, bu mikrosahəni əmələ gətirən sözlər keçmiş – indiki – gələcək planında hərəkətin temporal cəhətdən reprezentasiyası ilə bağlı olub, nisbi zamanı ifadə edən LSQ-lərdə birləşir. Onlar aşağıdakı bölgülərdə öz əksini tapır:

1. Nitq momentinə və ya istinad nöqtəsi kimi götürülən hər hansı hadisəyə nəzərən gerçəklikdəki hadisə, proses və hərəkətlərin keçmiş – indiki – gələcək planında paylaşdırıldığını bildirən sözlər – **azərb**.: *keçmiş, iniki, gələcək, dünən, bu gün, sabah, əvvəl, öncə, indi, sonra və s.*; **ing**.: *past, present, future, yesterday, today, tomorrow, yesternight, tonight, now, nowadays, current, currently, simultaneous, anterior, eve, prior, previos, former, last, next* və s.

2. Bir hərəkət, hadisə və prosesin digərinə nəzərən zamanını ifadə edən sözlər – **azərb**.: *əvvəl, qabaq, qabaqcadan, eynivaxtlı, eynizamanlı, sonra* və s.; **ing**.: *before, ago, beforehand, previously, formerly,simultaneously, contemporarily, while, recently, after, afterwards, later, lately, last, next, presently, then* və s.

3. Zaman daxilində hərəkətin baş verməsini, cərəyan etməsini göstərən sözlər. Bu qrupa varlıq, mövcudluq bildirən fellər və mərhələ, faza bildirən fellər daxildir – **azərb**.: *olmaq, mövcud olmaq, başlamaq, qurtarmaq, sona çatmaq, bitmək* və s.; **ing**.: *to be, to become, to grow, to get, to begin, to commence, to start, to end, to finish, to break* və s.

4. Hərəkət, hadisə və prosesin zaman hüdudlarını, mərhələlərini bildirən sözlər – **azərb**.: *başlanğıc, başlanış, son, finiş, qədər* və s.; **ing**.: *beginning, end, ending, till, until* və s.

5. Zamanın ümumi ardıcıllığını ifadə edən sözlər – **azərb**.: *əvvələn, əvvəl, öncə, nəhayət, sonda* və s.; **ing**.: *firstly, (at) first, at last, beginning, commencement, middle, midst, end, ending* və s.

6. İmplisit temporal mənalı sözlər – **azərb**.: *artıq, hələ, bəri* və s.; **ing**.: *already, still, yet, as, as….as, since, scarcely….when, no sooner ... than, in, at, on* və s.

İkinci LSmS-ni təşkil edən vahidlərə dair bəzi ümumiləşdirmələr aparaq. Altı LSQ-də birləşən vahidləri nəzərdən keçirdikdə hamısının nisbi zamanı ifadə etdiyi aşkar olur. Nisbi zaman, məlum olduğu kimi, hansısa hesablanma və ya çıxış nöqtəsinin olmasını zəruri edir. Belə bir hesablanma və ya çıxış nöqtəsi isə ya nitq momenti, ya da istinad nöqtəsi kimi götürülə bilən hərəkət, hadisə və ya proses ola bilər. Məhz belə istinad nöqtəsi kimi götürülə bilən hərəkət, hadisə və ya prosesə nəzərən digər hərəkət, hadisə və ya proses keçmiş – indiki – gələcək zaman planında paylaşdırılır. Beləliklə:

- ingilis dili üçün «time» sözü «bir hadisənin, prosesin və hərəkətin digərinə nəzərən baş verdiyi, baş verməkdə olduğu, yaxud baş verməli olduğu, yaxud ardıcıl surətdə bir-birini əvəzləməsi anı, momenti» mənasında bu mikrosahənin adı kimi çıxış edir.

- Azərbaycan dili üçün «zaman» sözü «bir hadisənin, prosesin və hərəkətin digərinə nəzərən baş verdiyi, baş verməkdə olduğu, yaxud baş verməli olduğu, yaxud ardıcıl surətdə bir-birini əvəzləməsi anı, momenti» mənasında bu mikrosahənin adı kimi çıxış edir;

- mikrosahənin nüvəsini hər iki dildə I və II LSQ-lər təşkil edir, bu qruplara daxil olan vahidlər dildə çox böyük işlənmə tezliyinə malikdir.

- mikrosahəni əmələ gətirən qruplar açıqdır, qrupların vahidləri müxtəlif leksik-semantik variantlarda müxtəlif qruplara daxil olur.

Beləliklə, qarşılaşdırılan dillərdə temporallıq leksik-semantik sahəsini iki mikrosahə təşkil edir. Birinin nisbi, digərinin isə qeyri-nisbi zamanı ifadə etdiyi mikrosahələri bir-birindən təcrid olunmuş şəkildə təsəvvür etmək olmaz. Onların arasındakı sərhədləri dəqiq müəyyənləşdirmək çətinlik törədir. Mikrosahələrin vahidləri bir-biri ilə qarşılıqlı şəkildə əlaqəlidir və bu əlaqə nitq prosesində təzahür edir. Məsələn, ingilis dilində «müəyyən müddətli zaman kəsiyi» mənasında *day, moment, minute* və s. sözlər Birinci LSmS-nin vahidləri kimi çıxış edərək qeyri-nisbi zamanı, lakin *for the moment* «1. hazırda, bizim dövrümüzdə; 2. yaxın gələcəkdə», *one of these days* «yaxın günlərdə» və s. sabit birləşmələrdə İkinci LSmS-nin vahidləri kimi nisbi zaman ifadə edir.

Hər bir dildə olduğu kimi, müasir ingilis və Azərbaycan dillərinin leksik-semantik sistemində də temporallıq sahəsinin əsasını ictimai şüurda mövcud olan, dünyanın konseptual modelinə daxil olub ən mühüm zaman anlayışlarını ifadə edən sözlər təşkil edir. Bu baxımdan yanaşdıqda, qeyri-nisbi zamanı ifadə edən, obyektiv real zamanın ingilis və azərbaycanlı şüurunda inikas olunmaqla onların dillərində zaman modelinin daşıyıcıları olan sözlərdən təşkil olunmuş Birinci LSmS həmin dillərin temporallıq LSS-nin nüvəsini yaradır. Məhz bu mikrosahənin vahidləri özlərinin rəngarəng leksik-semantik variantları ilə temporallığın sosial-etnik, məişət, bədii-təsviri və terminoloji refleksiyasını əks etdirir. Gerçəkliyin zaman münasibətlərinin qarşılaşdırdığımız dillərdə ifadə olunmasında təkcə leksik temporal vasitələr deyil, bütün səviyyələrin dil vasitələri iştirak edir. Leksik temporal vasitələrlə birgə morfoloji, sintaktik və frazeoloji temporal vasitələr hər bir dil üçün vahid və bütöv bir temporallıq sahəsini əmələ gətirir.

### 3.2.1. Sahənin semantik strukturunda əsas sözlərin seçilməsi

Temporallıq leksik-semantik sahəsinin tərkibində əsas sözlərin seçilməsi bir neçə əlamətə görə aparılır. Həmin əlamətlər əsas sözləri aşağıdakı cəhətdən xarakterizə edir.

1. Əsas sözlər leksik sistemin semantik strukturunun təşkilində iştirak etməklə sahənin nüvəsinə daxil olur;

2. Əsas sözlər yüksək işlənmə tezliyi ilə xarakterizə olunur, dilin aktiv lüğət tərkibinə daxil olur və bütövlükdə leksik sistemin mərkəzi komponentlərindən sayılır;

3. Əsas sözlərin yüksək işləklik səviyyəsi və leksik sistemdə mərkəzi mövqedə dayanması hər şeydən əvvəl dil sistemi üçün mənşə etibarilə qədimliyi və əslliyi, yaxud alınma termin olaraq tam mənimsənməsi və adaptasiya olunması ilə bağlıdır.

Temporallıq leksik-semantik sahəsinin nisbi və qeyri-nisbi zaman anlayışlarını bildirməklə iki mikrosahəyə bölünməsi (bax: 3.1.1.) iki qrup əsas sözlərdən danışmağa imkan verir. Birinci qrupa aid əsas sözlər Birinci LSmS-nin nüvəsinə, ikinci qrupa aid əsas sözlər isə İkinci LSmS-nin nüvəsinə daxildir. Birinci LSmS bütövlükdə temporallıq leksik-semantik sahəsində mərkəzi mövqedə dayandığı üçün bu qrupa daxil olan əsas sözlər də ümumilikdə leksik-semantik makrosahənin semantik strukturunun təşkilində fəal iştirak edir.

### 3.2.2. «Time» sözünün semantik təhlili və Azərbaycan dilində qarşılığı

İngilis dilində temporallıq leksik-semantik sahəsini (LSS) təşkil edən sözlər arasında «time» sözünün seçilməsi təsadüfi deyildir. Bu söz ingilis dilində sahənin adı kimi çıxış edir, sahənin bir sıra digər vahidləri ilə birgə həmin sahənin

nüvəsini əmələ gətirir, sahənin semantik strukturunun təşkilində iştirak edir, yəni onun mənaları ətrafında temporal leksik vahidlər qruplaşır, qrup və yarımqruplar əmələ gəlir. «Time» sözü ingilis dilində yüksək işlənmə tezliyinə malik olmaqla, fəal lüğət tərkibinə daxildir və bu dilin leksik temporallıq sistemində mərkəzi komponentlərindən biridir.

İngilis dilində zaman mənalı bütün isimlər arasında «time» leksemi çox qədim dövrlərdən ən böyük çoxmənalılığa malik söz olmuşdur. İndi bu söz ingilis dilində «zaman» mənasını ən ümumi və geniş şəkildə ifadə etməklə bərabər, həm də zaman sahəsinin adı kimi çıxış edir. Ona görə də sahəyə daxil olan sözlərin məna ümumiliyini müəyyən etmək üçün «time» sözünün özünün hansı məna komponentlərindən ibarət olduğunu üzə çıxarmaq lazımdır. A.S.Hornby. Oxford Advanced Learner’s Dictionary of Current English, Vol. I-II, 1982, Большой англо-русский словарь, Oxford English Dictionary, The American Heritage Dictionary of the English Language, The Random House Dictionary of the English Language, Cambridge Advanced Learner’s Dictionary, Linqvo elektron lüğətlərində və b. leksikoqrafik mənbələrdə «time» sözü çoxmənalı söz kimi qeydə alınmışdır. Lüğətlərdə «time» sözünün 14[1], 16[2], 17[3], 28[4], 52[5], 67[1] məna və məna çalarının olduğu

---

[1] Hornby A.S. Oxford Advanced Learner’s Dictionary of Current English, Vol. II, Moscow - Oxford , 1982, pp. 401-402.

[2] The American Heritage Dictionary of the English Language, William Morris, Editor, Published by American Heritage Publishing Co., Inc. and Haughton Mifflin Company, Boston, p. 1346

[3] Merriam-Webster’s Collegiate Dictionary, 10-th edition, Merriam - Webster, Incorporated Springfield, Massachusetts, U.S.A., 2000, p. 1235

[4] Webster’s New International Dictionary of the English Language, Second Edition, Unabridged, London: G. Bell & Sons, Ltd, Springfield, Mass.: G & C. Merriam Co. (1934), Volume II, Letters M-Z, with Appendices, p. 2648.

[5] The Oxford English Dictionary, Volume X1, T-U, Oxford, At the Clarendon Press, pp. 37-42.

göstərilir. Onları diqqətlə nəzərdən keçirdikdə, məlum olur ki, göstərilənlər «time» sözünün kontekst və ya situasiya ilə bağlı işlənməsindən irəli gələn məna çalarlarıdır. Başqa sözlə desək, onların işlənməsi kontekstlə şərtlənir. Onların hamısını aşağıdakı mənalarda birləşdirmək olar:

1. «İş, hal və hərəkətin keçmişdən indiyə və indidən gələcəyə doğru geridönməz ardıcıllıqla cərəyan etdiyi, baş verdiyi qeyri-məkani bir bütövlük, tamlıq (continuum)»[2] şəklində ümümfəlsəfi məna;

2. Həmin qeyri-məkani bütövlükdə və ya continuumda hansısa zaman nöqtələri arasında zamanın cərəyan etməsini müəyyənləşdirən mənalar, yəni «interval, ara, dövr, period»: Onları aşağıdakı şəkildə daha da konkretləşdirmək olar:

2.1. sözügedən qeyri-məkani bütövlüyün iki nöqtəsini birləşdirən və ya ayıran interval, ara, dövr, period, uzunluq. Məsələn: *a long time since the last war.*

*There has been* ***a long time since*** *- I do not say it lasted long, but it has been - when I have asked myself the question* (Ch.Dickens);

2.2. oxşar iş, hal və hərəkətlərlə müşahidə edilən, nəzərə çarpan, qeyd olunan, xüsusilə bir neçə illik interval, ara, dövr, period: *hard time, hard times, heavy times, a time of troubles* və s.

*He begged Captain Bonneville, therefore, to travel very slowly, so as to keep the horses in strength and spirit for the* ***hard times*** *they would have to encounter* (W.Irving); *I think it was a day or two before, but I am conscious of confusion in*

---

[1] The Random House Dictionary of the English Language, The Unabridged Edition, Jess Stein, Editor in Chief, Random House / New York, , p. 1485.

[2] The American Heritage Dictionary of the English Language, William Morris, Editor, Published by American Heritage Publishing Co., Inc. and Haughton Mifflin Company, Boston, p . 1346

*my mind about that* ***heavy times*** (Ch.Dickens). *He had* ***a hard time*** *of it, but did not know it* (M.Twain).

2.3. Konkret fəaliyyətlə müşahidə edilən, nəzərə çarpan dövr, period; gərgin fəaliyyət dövrü; ənənəvi iş dövrü, məsələn: *harvest time, time for bed, hired for full time, part-time*.

*I felt it was a* ***time for conversation*** *and confidence* (Ch.Dickens). *Whether you are seeking a* ***part-time*** *job to earn extra cash throughout the school year, or a* ***full-time*** *job upon graduation our job lists will help you* (LingvoUniversal (En-Ru).

3. «Zaman anı, zaman momenti» anlayışı ətrafında cəmləşən mənalar:

3.1. mümkün olan an, moment və ya mövsüm: *at any time, for the only time.*

*There never had yet been* ***a time when*** *man in bulk was more courageous* (Ch.Dickens). *Little Emily came and sat beside me on the locker* ***for the only time*** *in all that visit; and it was altogether a wonderful close to a wonderful day* (Ch.Dickens). *The little intercourse I have* ***at any time*** *with those around me cannot be termed conversation* (W.Irving).

3.2. ölüm və ya doğuluşla bağlı qeyd olunan an, moment və ya nöqtə: *a later time of life; before one's time****.***

*I am sure I loved that baby quite as truly, quite as tenderly, with greater purity and more disinterestedness, than can enter into the best love of* ***a later time of life****, high and ennobling as it is* (Ch.Dickens). *He died* ***before his time****;* ***His time*** *is near. Do you remember a French master with a squeaky voice? Or perhaps he was* ***before your time****?* (LingvoUniversal (En-Ru)

3.3. bir neçə andan, momentdən biri: *the last time, three times, for the second times.*

*The **last time** he saw Scott, he told him he believed him* (W.Irving). *I'd **ten times** rather do this work myself than ask him to do it* (LingvoUniversal (En-Ru).

4. Musiqi ritminin zərbəsi; musiqi parçasının ifa edildiyi sürət səviyyəsi; temp kimi mənalar ayrıca göstərilir.

Beləliklə, lüğət məqalələrinin təhlili göstərir ki, mahiyyət etibarilə «time» sözü ümumfəlsəfi məna ilə birgə, «interval, ara, dövr, period», «an, moment, nöqtə» və «ritm» mənalarına malikdir.

«Time» sözünün əsas mənası – «gerçəklikdə cərəyan edən hadisə, proses və hərəkətlərin «əsrlər, illər, saatlar, dəqiqələr və saniyələrlə ölçülən davam müddəti, uzunluğu»[1] - zaman kəsiklərinin adlandırılmasında onun ümumi söz olduğunu göstərir.

Bu sözün fəlsəfədə işlənən leksik-semantik variantı isə, yəni «*sonsuz inkişaf edən materiyanın obyektiv mövcudluq formalarından biri*» özünün ifadə etdiyi məna həcmi baxımından xeyli dərəcədə genişdir və bu səbəbdən də müəyyən anlayışların qurulmasında istifadə olunur.

İngiliscə-azərbaycanca lüğətdə «time» sözünün aşağıdakı mənaları göstərilmişdir: 1. vaxt, zaman, çağ; 2. müddət, vaxt; vədə, möhlət; 3. dövr, zaman; 4. iş vaxtı; 5. həyat, ömür; əsr; 6. dəfə[2].

Qeyd etmək lazımdır ki, ümumiləşdirici termin olaraq «time» lekseminin bütün komponentlərini özündə ehtiva edərək Azərbaycan dilində tam ifadə edən ekvivalent olmasa da, belə bir qarşılığı «zaman» sözündə tapırıq. Bununla belə, o da qeyd edilməlidir ki, ingilis dilindəki *time* sözünə Azərbaycan dilində lüğətdə göstərildiyindən də artıq miqdarda leksemlər uyğun gəlir. Bunu yəqin etmək üçün «time» komponentini

---

[1] Hornby A.S. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. II, Moscow - Oxford , 1982, pp. 401-402.

[2] İngiliscə-azərbaycanca lüğət , Bakı, «Qismət», 2003, s.1438

müxtəlif situasiya və kontekstlərdə, çeşidli birləşmələrin tərkibində təhlilə cəlb etmək kifayətdir, məsələn: ***for all time*** *– bütün zamanlarda // vaxtlarda // dövrlərdə // çağlarda // əyyamlarda;* ***from the beginning of time*** *– qədim zamanlardan // vaxtlardan // dövrlərdən // çağlardan // əyyamlardan,* ***time flies*** *– vaxt // zaman uçur,* ***kill time*** *– vaxt öldürmək,* ***time is running out*** *– möhlət // vaxt // zaman bitir//qurtarır,* ***time is on our side*** *– zaman // vaxt bizə işləyir,* ***time will tell*** *– zaman //vaxt göstərəcək // göstərər,* ***test of time*** *– zamanın // dövrün // vaxtın sınağı,* ***time waits for no man*** *– zaman // vaxt (heç kəsi) gözləmir,* ***after a time*** *– müəyyən zamandan // vaxtdan // müddətdən // dövrdən sonra,* ***to gain time*** *– vaxt // zaman qazanmaq,* ***to have (no) time*** *– vaxtı // zamanı ol(ma)maq ,* ***in no time at all*** *– bir anda,* ***spare time*** *– asudə vaxt // zaman,* ***to last one's time (out)*** *– (kiminsə) ömrünə bəs etmək // çatmaq,* ***it is time for bed*** *– yatmaq vaxtıdır // zamanıdır,* ***there's no time like present*** *= fürsəti // məqamı əldən vermək,* ***in time*** *– vaxtında // zamanında // məqamında,* ***on time*** *– təyin olunmuş vaxtda // zamanda,* ***every time*** *– hər dəfə // vaxt // zaman,* ***many a time*** // ***many times*** *– çox dəfə // dəfələrlə,* ***in the time of smb*** *– (kiminsə) zamanında // vaxtında // dövründə,* ***in olden times*** *– qədim zamanlarda // vaxtlarda // dövrlərdə,* ***to be ahead of one's time*** *– zəmanəsini // dövrünü qabaqlamaq,* ***good and bad times*** *– yaxşı və pis vaxtlar // dövrlər // zamanlar,* ***hard times*** *– ağır dövrlər // zamanlar // vaxtlar,* ***from*** // ***since time immemorial*** = ***from*** // ***since time out of mind*** *– çox qədim zamanlardan // vaxtlardan // dövrlərdən // əyyamlardan .*

Sonuncu birləşmələrə diqqət yetirək. «Time» komponenti *since time immemorial* və *from // since time out of mind* tipli birləşmələrin tərkibində «keçmişdən indiyə qədər qeyri-müəyyən müddət, uzunluq» kimi orijinal məna çalarına malikdir. Azərbaycan dilində həmin birləşmələr həm yuxarıda verilən

şəkildə, həm də *illərdən bəri, ata-babadan (bəri) // (bu yana), dədə-babadan (bəri) // (bu yana), dünya yaranandan bəri* və s. kimi orijinal birləşmələr şəklində ifadə olunur. Müq. et: ingilis dilində – *Her family had farmed that land* ***since time immemorial.***[1] *(Onun ailəsi* ***illərdən bəri*** (***ata-babadan bəri*** ) *o yeri (torpağı) bejərmişdi),* Azərbaycan dilində – *Mollalı güneyini* ***dədə-babadan*** *Zenqaranlılar əkib-biçirlər* (Dan.).

Beləliklə, ingilis dilindəki *time* sözünə Azərbaycan dilində bir neçə leksemin uyğun gəldiyi göz önündədir. Ən çox uyğunluq «zaman» və «vaxt» sözlərində özünü göstərir.Verilmiş nümunələrin əksəriyyətində «vaxt» və «zaman» leksemləri bir-birini əvəzləyə bilir. Bu sözlərin bir-birini əvəzləməsinə baxmayaraq, işlənmə yeri, üslubu və semantik yükünə görə *zaman* sözünə üstünlük vermək olar. Bu üstünlüyü aşağıdakı arqumentlərlə əsaslandırmaq mümkündür:

Birinci, *zaman* leksemi *vaxta* nisbətən daha geniş şərh oluna bilər, lakin Azərbaycan dilinin izahlı lüğətində bunun tam əksini görürük[2]. *Vaxt* sözü üçün qeydə alınmış mənaların hamısı *zaman* sözü üçün də keçərlidir.

İkinci, söhbət mücərrəd fəlsəfi anlayışlardan getdikdə, daha çox «zaman» sözü işlədilir. Məsələn: *zamanın həqiqətləri, tarixi zaman*. Burada R.Hüseynovun «Vaxtdan uca» əsərini xatırlamaq yerinə düşər. Bizə elə gəlir ki, əsərin adındakı «vaxt» sözü «zaman» sözü ilə əvəzlənsə, üslubi cəhətdən daha yerində işlənmiş olardı.

Üçüncü, dilçilikdə morfoloji və sintaktik kateqoriyaların ifadə olunmasında da *zaman* termini istifadə olunur: *indiki za-*

---

[1] Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk.
[2] Azərbaycan dilinin izahlı lüğəti. I cild, Bakı, «Çıraq», 1997, s. 184-185; 431-432.

*man, keçmiş zaman, gələcək zaman, zaman zərfi, zaman zərfliyi, zaman budaq cümləsi.*

Dördüncü, fəlsəfi mənada materiyanın obyektiv mövcudluq formalarından biri kimi (məkanla bərabər) zamanın malik olduğu məna yükünə «vaxt» sözü malik deyildir. Məsələn, ***time and space*** – *zaman və məkan* artıq fəlsəfi termin kimi qəbul edilmişdir, amma *vaxt və məkan* ifadəsi məqbul deyildir. Danışıq dilində isə *vaxt və yer* birləşməsi işlənir.

Beləliklə, ingilis dilindəki *time* sözü və onun Azərbaycan dilindəki qarşılıqları ilə bağlı müqayisəli təhlil göstərir ki, *time* sözünə aşağıdakı sözlər uyğun gəlir:




### 3.2. Temporal leksikanın semantik təsnifatı

Temporal leksikaya dilçilik ədəbiyyatında müxtəlif yanaşma üsulları vardır. Məsələn, müxtəlif dillərin materialları üzrə aparılan tədqiqatlarda temporal leksika struktur-semantik, ideoqrafik, derivativ, distributiv, transformativ parametrlər ba-

xımından araşdırılmışdır[1]. Hətta temporal leksikaya dair müxtəlif tədqiqatların nəticələrini ümumiləşdirən işlərə də rast gəlmək olar[2].

Temporal leksikanın (isimlərin, sifətlərin, zərflərin) ifadə etdiyi zaman mənalarının təfsilatlı diferensiasiyasına həsr olunmuş tədqiqatlardan biri M.Rudometkinaya məxsusdur. O, tədqiqatını ingilis dilinin materialları üzrə aparmışdır. Mənasında zaman anlayışı olan sözləri tədqiqatçı semantik baxımdan *lokalizatorlar, korrelyatorlar* və *modifikatorlar* adı altında üç qrupa ayırır və hər bir qrupu yarımqruplara bölür. Məsələn, *Lokalizatorlar* qrupu *zaman ölçüləri* və *triada* (üçlük) yarımqruplarına ayırılır; *Korrelyatorlar* qrupunda *öncəgəlmə*, *eynizamanlılıq*, *sonragəlmə* və *aralıq* nisbətli yarımqruplar fərqləndirilir; *Modifikatorlar* qrupunda *uzunluq*, *təkrarlıq* və (*son*) *hədd* bildirən yarımqruplar özünə yer almışdır.

Biz ingilis və Azərbaycan dillərində temporal leksikanın semantik təsnifatında əsas kimi onların felin zaman formaları ilə əlaqəsi əlamətini götürürük. Əlaqəlilik və ya nisbət mənasının mövcudluğu dilin müxtəlif səviyyəli vahidləri olan fel zamanları ilə temporal leksikanın semantik cəhətdən uzlaşmasına kömək edir. Zamanın leksik ifadə vasitələri olan temporal leksikanın differensial mənaları cümlədə fellə ifadə olunan hərəkəti dəqiqləşdirir, konkretləşdirir. Müxtəlif səviyyələrə aid olan bu vahidlərin funksional cəhədtən qarşılıqlı əlaqəsi bununla qurtarmır. Temporal leksika kontekst daxilində felin za-

---

[1] Петрушинина О.В. К семантической характеристике наречий времени (по материалам словарей) // Материалы 8-й конференции по преп. рус. яз. пед. ин-тов, Вып. 2, ч.1, М., 1973 с. 85-89; Рудометкина М.И. Слова категории времени (на материале англ. языка), АКД, Киев, 1972; Каращук В.А. Темпоральные прилагательные в современном русском языке, АКД, Ташкент, 1978.

[2] Потаенко Н.А. Темпоральная лексика как объект лингвистического изучения // Известия АН СССР, Сер. лит. и яз. 1979, Т. 38, № 3, с. 243-248.

man formasının mənası ilə ziddiyyət təşkil edərək, cümlədəki felin göstərdiyi zamanla uyğun gəlməyən zaman mənası verə bilər. Məsələn, leksik mənasında «sonragəlmə, konkretlik, dəqiqlik, məhdudiyyət» seması olan azərb. *sabah* və ing. *tomorrow* zərfləri felin indiki zaman forması ilə işlənməklə zaman münasibətini dəyişdirir, yəni leksik göstəricinin semantikası fel formasının mənasına təsir edərək, bir növ üstünlük qazanaraq onu gələcək zaman sferasına keçirir. Müq. et: -*Bunları da* ***sabah*** *gəlib aparasıdırlar* (Anar). *Nümayəndə heyəti* ***sabah*** *vətənə yola düşür* («Xalq qəzeti»). *Müxalifət* ***sabah*** *öz aksiyalarını təklif olunan ünvanlarda keçirir* («Şərq» qəzeti). *«You come to work* ***tomorrow****, and in the middle of the day I'll advance you enough for your dinner* (J.London). *They have found out that he starts for Fort Clayton* ***tomorrow****, with one of his scouts* (M.Twain); *Suppose we take a sail on the lake to-day, and go up into the mountains* ***tomorrow*** *morning?»* (E.Voynich)

Digər temporal leksemləri də buna oxşar şəkildə təhlil etmək olar. Məsələn, Azərbaycan dilində *vaxtında* zərfinin kontekstual təhlili onun semantikasında bir sıra temporal mənaların cəmləşdiyini göstərir. Çoxmənalı temporal vahid olan bu söz müxtəlif leksik-semantik qruplara daxil olur, qrup daxilində digər vahidlərlə sinonimlik və antonimlik münasibətlərinə girir. Məhz belə münasibətlər sayəsində *vaxtında* zərfi hərəkəti həm keçmiş, həm indiki, həm də gələcək zaman sferasında lokallaşdıra bilir:

***Vaxtında*** *yazsaydın, ... nə sənin qəlbinə dəyərdilər, nə də Yevlaxda o cür sərrast bir həyasızlıqla səni təhqir eliyərdilər* (S.Səxavət). *Axı Cahandar ağa* ***vaxtında*** *ona xəbər vermişdi* (İ.Şıxlı). *Bunlardan biri İran şahı Kir olub. Onun* ***vaxtında*** *da zülm ərşə dayanmışdı* (S.Səxavət). *Əgər respublikamızın təhlükəsizliyini düşünürsünüzsə, bizi rüsvay edənlərə* ***vaxtında***

*cavab verilməsinə siz də kömək göstərməlisiniz* (S.Rüstəmxanlı).

İngilis və Azərbaycan dillərində temporal leksikanın lüğəvi mənalarının təhlili prosesi göstərir ki, bir qrup sözlər özündə zaman və tərz mənalarını birləşdirir. Belə sözlər hərəkəti eyni zamanda keyfiyyət və kəmiyyət baxımından səciyyələndirir. Bununla bərabər, həmin sözlər hərəkətin zaman etibarilə lokallaşmasını ifadə etmir. Bu qrupa azərb. *həmişə, bütün gün(ü),daim, daima, gecə-gündüz,* ing. *always, whole day, all day ( long)* və s. sözləri daxil etmək olar. Həmin sözlərdə «zamanca lokallaşdırma» semasının olmaması felin zaman forması ilə işlənməsində onların qeyri-sabitlik nümayiş etdirməsi ilə də təsdiqlənir.

Azərbaycan və ingilis dillərində temporal leksika «zamanca lokallaşdırma» semasının varlığı və yoxluğu əlamətinə görə iki semantik qrupa bölünə bilər: 1) Felin zaman kateqoriyasının mənası ilə əlaqəli olan temporal leksika; 2) Felin zaman kateqoriyasının mənası ilə əlaqəli olmayan temporal leksika.

Birinci semantik qrupa felin zaman kateqoriyasının mənası ilə əlaqəli olan temporal leksika daxildir. Onlar tərkib etibarilə qeyri-yekcinslik nümayiş etdirir. Bu, onların müxtəlif zaman çalarları ilə müəyyənləşir. Burada üç sıranı fərqləndirmək olar:

I. İndiki zaman sferasına aid temporal leksika;

II. Keçmiş zaman sferasına aid temporal leksika;

III. Gələcək zaman sferasına aid temporal leksika.

I. ***İndiki zaman sferasına aid temporal leksika*** üçün invariant əlamət hərəkətin nitq momenti ilə «eynizamanlılıq» mənasıdır.

**Azərbaycan dilində:** *indi, indiki vaxtda, hazırda, hazırkı vaxtda, cari zamanda, bu gün* və s. **İngilis dilində:**

*present, now, presently, current, currently, today, nowadays, tonight.*

Zaman kəsiyini əhatə etməyindən asılı olaraq bu leksik vahidlər müəyyən yarımqruplara bölünə bilər.

1. Məsələn, azərb. *hazırda, bu gün, hazırkı vaxtda*, ing. *at present, now, presently, today* nitq momenti ilə birbaşa əlaqəlilik ifadə edə bilir. Müq. et:

***İndi** özün görürsən ki, necə ağ yalan olur* (Anar). ***Hazırda** Şirazda ailəsiylə birlikdə yaşayır* (Ə.Cəfərzadə). *Həsən keçmişin əsgəri idisə, Sevindik **hazırda** ordudadır* (S.Əhmədli). ***Hazırda** isə 60 ailə birlikdə reabilitasiya kursu keçir* («Şərq» qəzeti).

*So true are these avowals **at the present day**, that I can now only take the reader into one confidence more* (Ch.Dickens). *'But I bear those monotonous walls no ill-will **now*** (J.F.Cooper). *"Just go on with what you're doing **now*** (A.Cristie). *I leave your house **today**; I cease to be your ward **today*** (Ch.Dickens).

2. İndiki zaman sferasına aid sözlərin bəziləri keçmiş zaman kəsiyini əhatə etməklə nitq momenti ilə əlaqəlilik ifadə edə bilir. Müq. et:

*Düz yüz manat* ***indiyədək*** *zərərim var* (M.F.Axundov). Axı ***hələ indiyə kimi*** onun bir sözünü iki eləyən olmayıb (Anar). *Bütün bu səfərlər **hələ ki**, birinin - ruhların imkanları ilə baş tutur* (S.Əhmədli). ***Until now** this personage had escaped the observation of the travelers* (W.Irving).

Göründüyü kimi, bu temporal leksemlərin semantik strukturunda «öncəgəlmə» seması intişar tapır.

3. İndiki zaman sferasına aid sözlər nitq momenti ilə əlaqəlilik nümayiş etdirməklə eyni zamanda gələcəyə yönümlük göstərir. Belə sözlər «sonragəlmə» məna çaları daşıyır.

II. ***Keçmiş zaman sferasına aid temporal leksikanı*** hərəkətin nitq momentindən «öncəgəlmə» kimi invariant məna əlaməti birləşdirir.

**Azərbaycan dilində:** *keçmiş, dünən, srağagün, bir zamanlar, bir vaxtlar, bir gün, onda, qədimdə, qədim zamanlarda, Nuh əyyamında, dədə-babadan* və s; **İngilis dilində:** *past, yester-morning, yester-evening, yestreen, yesterday, yesternight, yester-year, the other day, in the day of old, the good old days, from time immemorial, since Adam was a boy, time out of mind.*

Hər iki dildə keçmiş zaman sferasına aid olan temporal leksika keçmişdə qeyri-müəyyən zaman, ən yaxın keçmiş, yaxın keçmiş və s. məna çalarlarını ifadə etməyə xidmət edir:

***Bu yaxında*** *Bolqarıstandan qayıtmışıq* (Anar). ***Yaxınlarda*** *Bakıya getmişdi, evlərinə, ata-anasəna baş çəkib gəlmişdi* (Anar). ***Bu yaxınlarda*** *belə bir hadisə baş vermişdi* (S.Əhmədli). ***Onda*** *Sənubərin xırdası olmamışdı qutabsatana versin, qutabsatan da Sənubərin manatlığını xırdalamırdı, xırdası yox idi* (Elçin). ***Dünən*** *səhər yeməkxanada oturub ertə çörəyini yeyəndə Güləndam nənə Cavanşirdən soruşdu* (Elçin). *Səhəri gün məktəbdə uşaqlar ona dedi ki, İzrail Solomonoviç* ***dünən*** *birinci dərsdə sizi görübmüş - səni də, Vovanı da - bildi ki, dərsdən qaçmısınız* (Elçin). *Bibim deyir ki,* ***dünən*** *səhərin ala toranında gördüm ki, camış nəsə yeyir* (İ.Şıxlı). *-Ay Ruzigar bacı, vallah,* ***qədimdə*** *də qız seçənlər qəribə şeylərə fikir verərmişlər ey* (Ə.Cəfərzadə).

*You heard me say* ***yesterday*** *that I proposed to live by my wits* (A.Cristie). ***Time out of mind*** *strength and courage have been the theme of bards...* (W. Thackeray). Politicians are promoting their interests, and ***since time immemorial*** they have used conscience as a device (The New York Times).

III. ***Gələcək zaman sferasına aid temporal leksika*** nitq momentindən «sonragəlmə» semantik invariant əlaməti ilə fərqləndirilir.

**Azərbaycan dilində:** *sabah, səhər, gələcək, gələcəkdə, gec-tez, yaxında, yaxınlarda, onda, bir vaxt, bir gün , günlərin bir günü, o gün* və s. **İngilis dilində:** *tomorrow, morrow, future, hereafter, hereupon, next, oncoming, for the moment, one of these days, in (the) future, early or late, soon or late.*

Qeyd etdiyimiz temporal leksika gələcək zaman sferasında hərəkəti müxtəlif müddətli zaman kəsikləri etibarilə səciyyələndirir. Məsələn, nitq momentinə və ya başqa hesablanma nöqtəsinə münasibətdə yaxın və ya uzaq gələcək, ümumi gələcək bildirir. Nümunələr:

*O heç ağlına gətirə bilməzdi ki, **bir vaxt** gələcək və bu qutab alan qız onun ilk məhəbbəti olacaq* (Elçin). ***Bir zaman** Tolikin oğlunun oğlu da heç avar çəkməyəcək və bəlkə o, heç mənim adımı da bilməyəcək* (Elçin). *İşğal edilmiş rayonlarımız **yaxın vaxtda** azad ediləcək. Baləmi indi kəndə gedəcək, hər halda yaxın zamanda oğlunun itdiyindən duyuq düşəcək, axtarıb gec-tez meyiti tapacaqlar* (Anar). *Könlünün nəvazizini, istisini insanlarla bölüşəcək, mehribanlığıyla sevindirəcək, etinasızlığıyla qussələndirəcəkdir və **haçansa** məclisin şirin yerində bir neçə dəqiqə qonaqlardan, rəqslərdən, tostlardan, komplimentlərdən ayrılacaq, televizora qapılacaq, verilişə baxacaqdır* (Anar).

*My poor friend, **one of these days** you'll be so dreadfully sorry you said this to me* (W. Maugham). *It is bad enough going away owing you rent, but I'll be paying, you'll see, **one of these fine days**, just when you've given me up...* (A. Wilson). *You'll have to tell him **sooner or later*** (W. Maugham).

İkinci semantik qrupa felin zaman formalarının mənası ilə əlaqəli olmayan temporal leksika daxildir. Bu qrupa daxil

olan temporal leksika felin zaman formalarına münasibətdə neytrallıq nümayiş etdirir və obyektivlik baxımından bir hərəkəti digər bir hərəkətlə əlaqələndirir. Temporal leksikaya belə yanaşma nəticəsində aşağıdakı yarımqruplar fərqləndirilir.

1. Hərəkəti eynizamanlılığa görə əlaqələndirən leksik vahidlər.

2. Hərəkəti ardıcıllığa görə əlaqələndirən leksik vahidlər.

3. Müddət və təkrarlılıq mənalı leksik vahidlər.

Birinci yarımqrupa daxil olan temporal leksikanın semantik strukturunda hər hansı bir hərəkətlə «eynizamanlılıq» əlaməti seçilir. Azərbaycan dilində bu növ leksik vahidlərə *birdən, dərhal, həmin vaxt* və s. daxildir:

*Yaşmağını yuxarı qaldırdı, baş örtüsünü üst tərəfdən alnına çəkdi və həyətdəki balaca dükana bənzər bir şey var idi, qapısını açdı,* ***dərhal*** *geri qayıtdı* (Ə.Cəfərzadə). *Abdulla* ***birdən*** *on beş qoyununu bazara sürüb satıb, voyenkom Talıbovun köməyi ilə oğlunu hərbi xəstəxanadan çıxarıb gətirmişdi* (İ.Hüseynov). *Sütül ləkəsini elə* ***həmin vaxt*** *sulanan qora ilə yumaq, təmizləmək olurdu* (S.Əhmədli).

İngilis dilində isə bu yarımqrupa *immediately, simultaneously, at the same time* kimi sözləri daxil etmək olar:

*The men had been paid off in Australia, and Martin had* ***immediately*** *shipped on a deep-water vessel for San Francisco* (J.London). ***At the same time****, however, he caused a strict watch to be maintained on all their movements* (W. Irving). *It was remarked that the clock began to strike, and I began to cry,* ***simultaneously*** (Ch.Dickens).

Hərəkəti eynizamanlılığa görə səciyyələndirən leksik vahidlər bir və ya bir neçə subyekt tərəfindən icra edilən hərəkətlərin eynizamanlılığını ifadə edə bilər. Məsələn:

*Ona görə belə köntöy-köntöy cavab verdi,* ***eyni zamanda*** *hiss etdi ki, gicgahlarındakı damarlar şişməyə, əlləri əsməyə başlayır* (İ.Şıxlı). *Bu giziltidən qolları, qılçaları gərildi,* ***bir-***

***dən*** *süstləşib boşaldı* (İ.Şıxlı). *Qabaq ayaqlarının üstündə, xəzəli xışıldada-xışıldada meyidin bərabərinə qədər süründü, onu imsilədi,* ***birdən*** *dik atılıb geri sıçradı* (İ.Şıxlı). *Salatın anasını - öz günüsünün başını sinəsinə sıxıb hönkürtü ilə ağladığını gördü, yalnız* ***bu vaxt*** *Mələk bayaqdan güclə saxladığı göz yaşlarını axıtmağa başladı* (İ.Şıxlı).

İkinci yarımqrupa daxil olan temporal leksikanın semantik strukturunda «ardıcıllıq, sonragəlmə» semantik əlaməti seçilir. Azərbaycan dilində *birdən, onda, ardınca, sonra, sonralar* və s. sözlər bu qrupdan sayıla bilər. İngilis dilində isə buraya *shortly, directly, straightway, soon, subsequently, then* tipli sözlər daxildir.

Bu növ leksik vahidlərin işləndiyi kontekstlərdə bir hərəkət ardıcıllığa görə a) dərhal, heç bir zaman müddəti, fasiləsi olmadan və ya b) fasilə, ara, müddət ilə digərindən sonra baş verir.

Müq. et: ***Birdən*** *kimsə onun qolundan dartdı* (S.Əhmədli). *Söhbətin elə bir nöqtəsi yetişdi ki, Zəlimxan daha dözə bilməyib* ***birdən*** *ayaq saxladı* (İ.Hüseynov). *Dəmir parçası əvvəlcə qızardı,* ***sonra*** *tədricən ağardı* (İ.Hüseynov). *Kərim kişi dirsəyi ilə əvvəlcə sağ yanındakı meşəçiyə toxunub qapıya işarə etdi,* ***sonra*** *böyük oğluna sarı döndü* (İ.Hüseynov).

*We kissed one another over and over again, and I* ***soon*** *fell fast asleep* (Ch.Dickens). *Denton seemed to be reading her, and* ***then*** *still retaining Joan's hand she turned to Madge with a smile* (Jerome K. Jerome). *And I came out* ***immediately****, for I trembled at the idea of being dragged forth by the said Jack, for, all at once, without speaking, he struck suddenly and strongly* (Ch.Bronte). *The sun cannot get* ***directly*** *at the deeper portions of the snow* (Jerome K. Jerome).

Üçüncü yarımqrupa zaman və tərz mənalarını eyni vaxtda reallaşdıran leksik vahidlər daxildir. Bu yarımqrupda aşağıdakı cərgələr fərqləndirilə bilər:

a) hərəkətin məhdud və ya qeyri-məhdud zaman müddətini, başlanğıc və ya son həddini ifadə edən söz və söz birləşmələri:

Azərbaycan dilində *ömürboyu, ömürlük, ömründə, xeyli vaxt, həmişə, günlərlə, həftələrlə, aylarla, bir neçə vaxt, səhərdən, gecəyarıdan, dünəndən bəri, çoxdan, hər zaman, hər vaxt, daim, daima, daimi, fasiləsiz, davamlı, əbədilik, əbədiyyən, həmişəlik, birdən, qəfildən, qəfil, ani, dərhal* tipli sözlər bu yarımqrupa aiddir.

*Çevir balalarının başına, **ömürlük** qaravaşın ollam* (İ.Şıxlı). *Hətta **günlərlə** zənənə üçün açılan hamamı da nəzarət altında saxladı* (Ə.Cəfərzadə).***Xeyli vaxt** uzaqdan-uzağa qızın qarasıyla gəzib izini izinə qatmışdı* (İ.Şıxlı). *O yaşıl çinar **çoxdan** arxada qalmışdı və görünmürdü* (Elçin). ***Dünən axşamdan** qulağı çalmışdı ki, Əsma bu səhər şikara çıxacaq* (Ə.Cəfərzadə). *Ələlxüsus da **axşamdan** yatıb **gecə yarısı qəflətən** oyananda, **səhərəcən** yata bilməyib yataqda qurcuxa-qurcuxa qalanda halı yaman olurdu* (Anar). ***Çoxdan** idi bu şəkli görmürdüm, bir az baxıb şəkli yazı masamın siyirtməsinə qoydum* (Elçin).

İngilis dilində buraya *long, always, constant, constantly, continually, continuously, eternal, ever, forever, never, overnight, overtime, perennial, perennially, permanent, permanently, still* və s. sözlər daxil edilə bilər.

*"You're right, Tommy, it is a bit of a poser." "After all, you know, you can't bluff him **forever*** (A.Cristie). *They do not **always** agree with us* (Jerome K.Jerome). *They were on the alert **constantly**, and found their office no child's play* (M. Twain). *The lips were **still** always a trifle parted, and she still seemed to be looking out for what was coming, like a little Madonna, or Venus, in a Botticelli picture* (J.Galsworthy).

b) Hərəkətin təkrarlılığını bildirən leksik vahidlər. Təkrarlılıq özü iki formada baş verə bilir.

1. Ardıcıl, müntəzəm təkrarlılıq ifadə edən leksik vahidlər: **Azərbaycan dilində** – *ardıcıl, mütəmadi, dövri, periodik, dəqiqəbədəqiqə, saatbasaat, günbəgün, həftəbəhəftə, ilbəil, illik, adətən*; **İngilis dilində** – *regularly, regular, periodical, periodically, once, twice, thrice, minutely, hourly, daily, weekly, fortnightly, monthly, yearly, annual, annually, usually*.

*Aleksey Osipoviç görürdü ki, arvadı içəridən qovrulur, günü nə qədər xoş keçsə də sarsılır, **aybaay**, **günbəgün** qocalır* (İ.Şıxlı). *Fira heç zaman məni sevə bilməzdi, çünki mən eyni bir adamla, lap xoşlamadığım bir adamla, ... bir il **mütəmadi** nərd, ya «Duraki» oynaya bilərəm; uduzsam da yandırmaz, udsam da sevindirməz* (Elçin).

*From the very first I took a firm and rooted dislike to him, and I flatter myself that my first judgments are **usually** fairly shrewd* (A.Cristie). *Every night, **regularly**, at nine, at twelve, at three, they lifted a nocturnal song, a weird and eerie chant, in which it was Buck's delight to join* (J.London).

2. Qeyri-ardıcıl, qeyri-requlyar, təkbir, ara-sıra təkrarlılıq ifadə edən leksik vahidlər: **Azərbaycan dilində** – *Təkbir halda, nadir halda, ara-sıra, bəzən*; **İngilis dilində** – *seldom, rear, rarely, sometimes* və s.

*Hüsən özü bilirdi ki, o, bir az dillidi, qılıqsızdı, köntöydü, **bəzən** hər nöqsana hirslənəndi* (S.Əhmədli). ***Bəzən** də qəssab dükanından ucuz qiymətə aldıqları sür-sümüyü qaynadıb suyunda arpa unu bişirərdilər* (S.Səxavət). *... Lillənmiş yaddaşının bulanıq sularında **ara-sıra** balıq kimi batıb çıxan iki insan sifətini ... bir-birindən ayırmağa cəhd göstərirdi* (Ə.Əylisli).

*Reed surveyed me at times with a severe eye, but **seldom** addressed me...* (Ch.Bronte). ***Sometimes** I fancied that Peggotty perhaps objected to my mother's wearing all the pretty dresses she had in her drawers,...* (Ch.Dickens). *Her mother, since she could remember, had been an invalid, **rarely***

*leaving her bedroom till the afternoon ... Even as a child she had* ***rarely*** *cried* (Jerome K.Jerome).

Zaman və tərz mənalarına malik olan leksik vahidlər əksər hallarda felin bütün zaman formaları ilə əlaqəli işlənirlər. Hərəkətin zaman müddətinin uzunluğunu ifadə edən leksik vasitələr onu kəmiyyət tərəfindən səciyyələndirir. Məsələn: *Hətta* ***günlərlə*** *zənənə üçün açılan hamamı da nəzarət altında saxladı* (Ə.Cəfərzadə).

Təsriflənən fel formalarının işlənmədiyi cümlələrdə temporal leksika cümlənin zaman-tərz səciyyəsini ortaya çıxaran yeganə vasitə kimi çıxış edir:

***Həmişə*** *üstü insanla dolu olan kəhriz kimsəsizdi* (S.Əhmədli). *Xəncər-bıçağı, çəngəl-qarmağı* ***həmişə*** *tərtəmiz, passız-pussuzdu* (S.Əhmədli).

Ardıcıllıq, müntəzəmlik ifadə edən temporal leksik vahidlər müxtəlif fel zamanları ilə işlənə bilmək imkanlarına malikdir.

*Xoşuma gəlmədi, vəssalam, bir dəfə* ***gəlmədi*** *və* ***həmişə, daima gəlmirdi****...*(Anar). *Uşaqlıqdan biz* ***daima*** *nə isə* ***itiririk*** (Anar). *Həyatdə* ***daima*** *daman kranın altındakı daş suyun təsirindən qurbağa çəni kimi sürüşkən və yaşılımtıl* ***olmuşdu*** (Anar). *Əbədi göylə, onun heç bir vaxt qayıtmayacağı əbədi göylə - yer arasında, Mədinənin onu* ***daim gözləyəcəyi*** *yer arasındakı məsafə* (Anar).

Qeyri-müntəzəmlik ifadə edən temporal leksik vahidlər Azərbaycan dilində *-dı*$^4$ şəkilçili keçmiş zaman formaları ilə birbaşa işlənmir. Əldə olan nümunələrin əksəriyyətində onların işlənməsi zaman və sıra kateqoriyalarının təzahür etdiyi formalarda müşahidə olunur.

*Həmzə Mirzə* ***hərdən*** *öz çadırlarından aralanıb onu görmək istəyirdi. Uzaqdan da olsa... Təki görsün. Və döyüşlər vaxtı həmişə olmasa da,* ***ara-sıra*** *ona tərəf baxır, izləyirdi ki, qız yağıların əlinə keçməsin* (Ə.Cəfərzadə). *Qılınclar, qalxan-*

*lar, oxlar, nizələr, əmudlar kimi* ***arabir*** *«dayandoldurum» tüfənglərinin də təkbir səsi eşidilirdi* (Ə.Cəfərzadə).

İngilis dilində isə qeyri- müntəzəmlik ifadə edən temporal leksik vahidlər keçmiş zaman formaları ilə də işlənə bilir:

***Sometimes****, preoccupied with her work, she* ***sang*** *the refrain very low, very lingeringly. Bessie* ***sometimes spoke*** *of it as a place where young ladies sat in the stocks* ... (Ch. Bronte). *Herbert* ***had sometimes said*** *to me that he found it pleasant to stand at one of our windows after dark...* (Ch. Dickens).

Beləliklə, felin zaman formaları ilə əlaqə yaratmaq baxımından temporal leksikanın semantik təsnifatı dilin müxtəlif səviyyələrinə aid vahidlərin kommunikasiya prosesində qarşılıqlı münasibətlərini öyrənmək cəhətdən əhəmiyyət kəsb edir.

### 3.3. Üçüncü fəslə dair nəticələr

Temporallıq leksik-semantik sahəsi semantik strukturuna görə zaman mənası ətrafında birləşən, qarşılıqlı əlaqəli mikrosahə, qrup və yarımqrupların iyerarxik şəkildə təşkil olunmuş mürəkkəb sistemidir. Qarşılaşdırılan Azərbaycan və ingilis dillərində temporallıq leksik-semantik sahəsi tərkib etibarilə iki mikrosahədən (qeyri-nisbi zaman ifadə edən *Birinci LSmS* və nisbi zaman ifadə edən *İkinci LSmS*) təşkil olunmuşdur. Hər bir mikrosahə nüvə və periferiya elementlərindən ibarətdir. Mikrosahələrin nüvəsini təşkil edən leksik vahidlər hər bir dildə uzun inkişaf prosesində formalaşmış, gerçəkliyin zaman səciyyəsini və münasibətlərini leksik səviyyədə təmsil edən vasitələr kimi çıxış edir.

Müəyyən və qeyri-müəyyən uzunluğa malik zaman kəsiklərini bildirən leksik vahidləri özündə birləşdirən Birinci LSmS leksik temporallıq sahəsinin nüvəsini təşkil edir. Məhz bu mikrosahənin vahidləri özlərinin rəngarəng leksik-semantik

variantları ilə temporallığın sosial-etnik, məişət, bədii-təsviri və terminoloji refleksiyasını əks etdirir. İkinci LSmS-ni əmələ gətirən vahidlər keçmiş – indiki – gələcək planında hərəkətin temporal cəhətdən reprezentasiyası ilə bağlı olub, nisbi zaman ifadə edir. Müəyyən zaman daxilində baş verən prosesləri xarakterizə edən, onlara keyfiyyət səciyyəsi verən belə vahidlər leksik temporallıq sahəsinin periferiyasını təşkil edir.

Leksik temporallıq sahəsinin bütövlüklə temporallıq funksional-semantik sahəsinə daxil edilməsi dildə zamanın vahid sahə modelindən bəhs etməyə imkan verir. Bu vahid sahə modelində vahidlər, bir-biri ilə qarşılıqlı əlaqədə olan, bir-birini tamamlayan müxtəlif (leksik, morfoloji, sintaktik və s.) vasitələr ümumi semantik funksiya – gerçəkliyin zaman münasibətlərinin dildə təqdimatı funksiyası ətrafında birləşir.

# IV FƏSİL

## MORFOLOJ İ TEMPORALLIQ SAHƏSİ

### 4.0. Ümumi qeydlər

Bu fəsildə müasir Azərbaycan və ingilis dillərində temporallıq sahəsinin morfoloji ifadə vasitələrinin təsvirini verəcəyik. Məlumdur ki, temporallığın morfoloji ifadə vasitələrini felin zaman formaları sistemi təşkil edir.

Temporallığın morfoloji ifadə vasitələrini təşkil edən felin zaman formaları istər ümumi dilçilik və germanşünaslıqda, istərsə də türkologiyada, o cümlədən Azərbaycan dilçiliyində kifayət qədər geniş şəkildə tədqiq olunmuş sahələrdəndir. Aparılmış araşdırmalarda qeyd etdiyimiz məsələ ilə əlaqədar çeşidli fikir və mülahizələrə rast gəlmək olar. Bununla belə, sözügedən məsələnin hələ kifayət qədər araşdırılmamış tərəfləri də vardır. Bu, ilk növbədə, fel formaları sisteminin məna tərəfi ilə əlaqədardır. Bu məsələ sahə yanaşması və kontensiv tipologiya kimi dilçilik sahələrində daha müasir və qabaqcıl metodlar əsasında müqayisəli planda hələ də öz tədqiqini gözləyir.

Morfoloji temporallıq sahəsinin və ya temporallığın morfoloji ifadə vasitələrinin müqayisəli planda öyrənilməsi Azərbaycan və ingilis dillərində zamanın ifadəsində universal və milli meyillər arasında münasibət məsələsinin işıqlandırılmasına, onlar arasında struktur və funksional oxşarlıq və fərqlərin üzə çıxarılmasına imkan verir. Praktik cəhətdən isə Azərbacan və ingilis dillərində zaman kateqoriyasının milli və universal xüsusiyyətlərinə lazımi diqqətin verilməsi interferensiyanı «proqnozlaşdırmağa», dillərarası təmas zamanı «zəif» ola bilən yerləri müəyyənləşdirməyə imkan verir.

Yuxarıda qeyd edildiyi kimi (bax: II fəsil), morfoloji temporallıq sahəsinin konstituentləri olan qrammatik fel zamanları temporallıq makrosahəsinin nüvəsini təşkil edir. Morfoloji temporallıq sahəsinin konstituentləri qarşılaşdırdığımız dillər üçün sayca fərqlənir. Qrammatik zaman formalarının sayında özünü göstərən fərq bu dillərin spesifik morfoloji quruluşu ilə bağlıdır.

Əvvəlcə müqayisə edilən dillərdə sahəni əmələ gətirən komponentlərin nomenklaturasını müəyyən edək.

Felin zamanlar sistemi ilə əlaqədar olaraq Azərbaycan dilçiliyində fikir müxtəlifliyinin olması məlumdur. Azərbaycan dilində felin zamanlar sisteminin, yəni qrammatik zaman formalarının miqdarı barədə irəli sürülən fikirlərdə müxtəliflik olsa da, fel zamanının indiki, keçmiş və gələcək kimi üç növünün mövcud olması mübahisəsiz qəbul edilir. Bu məsələdə fikir birliyi bununla da bitir. Qrammatik zamanın türk dillərində ifadə vasitələri, keçmiş, indiki və gələcək zamanların bölgülərinin sayı məsələsi türkologiyada olduğu kimi, Azərbaycan dilçiliyində də açıq olaraq qalmaqdadır. Bu barədə dilçilik ədəbiyyatında kifayət qədər bəhs edilmişdir[1]. Məsələ təkcə za-

---

[1] Ширалиев М.И. разногласие вокруг глагольно-временной системы тюркских языков // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 191-193; Рагимов М.Ш. К вопросу о формировании категории наклонения и ее отношение к категории времени в азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках, Баку, 1968, s. 117-130; Əfəndiyeva T. Felin keçmiş zaman formaları. Bakı, 2005; Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya (ikinci nəşr). Bakı, 2002, s. 326-329; Алекперов А.К. Вступление по докладам о категории времени и наклонения // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 198-202; Будагова З.И. К вопросу о категории времени в современном азербайджанском языке языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 16-26; Ахундов А.А. Изявительное наклонения в азербайджанском языке (опыт структурного анализа) // Вопросы категорий времени и наклонения гла-

man formalarının sayı ilə məhdudlaşmır. Türkologiyada qrammatik zaman kateqoriyasının müstəqil və ya qeyri-müstəqil olması da uzun müddət mübahisə predmeti olmuşdur. Türkoloji dilçilikdə zaman kateqoriyasının mövqeyi barədə də iki münasibət vardır: «felin zaman kateqoriyası müstəqil kateqoriyadır, yoxsa felin şəkil kateqoriyasının daxilində özünü göstərən, felin bir şəklinin (xəbər şəklinin) zamanlar üzrə dəyişməsidir?»[1].

Bu məsələ ilə bağlı olaraq uzun müddət mübahisələr getmiş, nəhayət 1962-ci ildə Bakıda türk dillərində felin zaman və şəkil kateqoriyası problemlərinə həsr olunmuş müşavirə keçirilmişdir. Müşavirənin materialları ayrıca kitab şəklində nəşr olunmuşdur[2]. Buna baxmayaraq, felin zaman və şəkil kateqoriyasının bir-birinə münasibəti birmənalı olaraq həll edilməmiş qalmışdır. Digər türk dillərində olduğu kimi, Azərbaycan dilində də bu iki kateqoriya çox qarışdırılmışdır[3].

Azərbaycan dilçiliyində felin zaman kateqoriyasını felin şəkil kateqoriyası xaricində, ayrılıqda, müstəqil kateqoriya kimi ilk dəfə A. Axundov tədqiq etmişdir. Onun 1958-ci ildə müdafiə etdiyi «Felin zaman kateqoriyası» adlı namizədlik dissertasiyası[4] və 1961-ci ildə nəşr etdirdiyi «Felin zamanları»

---

гола в тюркских языках. Баку, 1968, с. 131-137; Гаджиева Т.А. Система форм прошедшего времени в современном азербайджанском языке. Автореф. дисс. ... канд. фил. наук. М., 1958.

[1] Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya (ikinci nəşr). Bakı, 2002, s. 327.

[2] Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968.

[3] Покровская Л.А. Грамматика гагаузского языка. М., 1964, с. 177- 203; Мусаев К.М. Грамматика караимского языка. М., 1964 с. 278-294; Агазаде Н. Г. Система глагольных наклонений в современном азербайджанском языке. Баку, 1967; Azərbaycan dilinin qrammatikası. Azərbaycan EA nəşri, Bakı, 1960, s. 182-200; Müasir Azərbaycan dili. II cild. Morfologiya. Bakı, 1980, s. 320-344.

[4] Ахундов А.А. Категория времени глагола (на материале азерб. языка) Автореф. дисс. ... канд. фил. наук. Баку, 1958.

adlı fundamental monoqrafiyası təkcə Azərbaycan dilçiliyində deyil, bütövlükdə türkoloji dilçilikdə qrammatik zaman kateqoriyasına yeni bir baxış idi. Alim felin zaman kateqoriyasına baxışını sonradan daha da təkmilləşdirib inkişaf etdirməklə, Azərbaycan dilində, eləcə də türk dillərində sıra kateqoriyasının mövcudluğunu əsaslandırmışdır[1].

Bütün dillərdə qrammatik zaman kateqoriyası obyektiv zaman kateqoriyası fonunda təzahür edir. Obyektiv zaman qrammatik zamanların məna əsasını təşkil edir. Obyektiv zaman üç formada – indiki, keçmiş və gələcək zamanlar kimi təzahür etsə də, dillərin quruluşundan asılı olaraq qrammatik zamanların formaları həmin saydan çox ola bilər. Azərbaycan dili üçün qrammatik zaman formalarının miqdarı müxtəlif şəkildə təqdim edildiyindən, biz temporallığın Azərbaycan dilində sahə strukturunun müəyyənləşdirilməsində dilçilər arasında mübahisə doğurmayan cəhəti – qrammatik zamanın beş formasının – nəqli keçmiş, şühudi keçmiş, indiki, qəti gələcək, qeyri-qəti gələcək zamanların mövcudluğunun bütün dilçilər tərəfindən qəbul edilməsini nəzərə alırıq.

İngilis dilində felin zaman formalarının sayı barədə gedən mübahisələr daha kəskindir. Azərbaycan dilində mübahisə qrammatik zaman formalarının sayı ilə bağlıdırsa, ingilis dilində bu məsələ bir qədər fərqli şəkildə qoyularaq, ümumiyyətlə, qrammatik zaman kateqoriyasının oppozisiya etibarilə ikiüzvlü, yoxsa üçüzvlü olmasına görə mübahisə predmeti olmuşdur. Tədqiqatçılar ingilis dilində gələcək zamanın statusu və bu dilin zamanlar sistemində onun yeri haqqında yekdil fikrə gələ bilməmişlər. Mübahisələrin başlıca səbəbi kimi modal kateqoriyalarla çarpazlaşan gələcək zaman kateqoriyasının «zəifliyi» göstərilir. Bu «zəiflik» gələcək zamanın özünəməx-

[1] Axundov A. Türk dillərində zaman və sıra kateqoriyalarının qarşılıqlı əlaqəsi // Axundov A. Dil və ədəbiyyat. 2 cilddə. I cild. Bakı, Gənclik, s. 260-266.

sus morfoloji şəkillənməsinə, yəni analitik konstruksiya ilə ifadəsinə bağlıdır. Belə şəkillənmə güclü modallıq çalarlarına malik həmin kateqoriyanın məzmun və ya məna tərəfi ilə stimullaşır. Bu səbəbdən ingilis dilində qrammatik gələcək zaman kateqoriyası, yəni *shall / will* felləri ilə düzələn analitik konstruksiyalı gələcək zaman hələ O.Yespersendən başlayaraq, dilçilər tərəfindən, ümumiyyətlə, ya inkar edilir, ya da modallığın ifadə vasitələrindən biri kimi qiymətləndirilir.

O.Yespersen hesab edir ki, «ingilis dilinin zamanlar sisteminə gələcək zamanı xüsusi forma kimi daxil etmək səhv olardı ...»[1]. Alimin fikrinə görə, bir tərəfdən, gələcək zaman mənası xüsusi fel forması olmadan (məsələn, *I start tomorrow at six* və s.) ifadə edilə bilir, digər tərəfdən, həmin məna çox vaxt birləşmələrin (phrases) köməyilə verilir. Onlar da xalis gələcək zaman mənasını deyil, əlavə modal çalarlarla ortaya çıxan gələcək zaman mənası bildirir.

Xarici dilçilərin çox böyük əksəriyyəti gələcək zamanı ifadə edən *shall / will + infinitiv* konstruksiyasını modal fellərlə eyni cərgəyə qoyur. Belə yanaşmanı F.Palmer[2], Ç. Friz[3], C. Liç[4], R.Kvirk və həmmüəlliflər[5], C.Layonz[6] və başqalarında görürük. Məsələn, *I shall, thou will, he will, we shall, you will, they will* paradiqmasını «qrammatistlərin uydurması» adlandıran F.Palmer funksional münasibətdə *shall* və *will* kö-

---

[1] Есперсен О. Философия Грамматики (Перевод с английского В. В. Пассека и С. П. Сафроновой. Под редакцией и с предисловием проф. Б. А. Ильиша) Издательство Иностранной Литературы. М., 1958, с. 51.
[2] Palmer F.R. A Linguistic Study of the English Verb. London, 1965.
[3] Fries Ch. C. The Structure of English. London, 1958.
[4] Leech G. Meaning and the English Verb. London: Longman. 1971.
[5] Quirk R., Greenbaum S., Leech G., Svartvik J. A University Grammar of English (ed. and abbrev. by I.P. Verkhovskaya), Moscow, 1982.
[6] Lyonz J. Semantics. Cambridge: Cambridge University Press, 1977.

məkçi fellərini *can* və *may* modal felləri ilə tam eyniləşdirir[1]. O, eyni zamanda «modal zamanlar» anlayış-terminini dövriyyəyə buraxır. F.Palmer modal zamanlara modal felləri və *should* / *would* birləşmələrini əhatə edən gələcək zaman və şərt şəklini daxil edir[2].

İngilis dilini xüsusi səriştə ilə tədqiq edən rus dilçilərindən A.İ.Smirnitski[3], Q.A.Vorontsova[4], B.S.İliş[5], L.S.Barxudadarov[6], V.N.Yartseva, Y.Q.Birenbaum, N.A.Slüsareva və başbaşqaları bu dildə qrammatik zaman kateqoriyasının ikiüzvlü oppozisiyadan ibarət olduğunun tərəfdarı olsalar da, onların baxışı Amerika və Qərbi Avropa alimlərinin fikirlərindən müəyyən dərəcədə fərqlənir. İngilis dilində gələcək zamanın mövcudluğu və ya yoxluğu haqqında rus dilçilərinin baxışları əsasən belə bir fakta söykənir ki, *shall* və *will* felləri gələcəklik mənasından əlavə, həm də başqa kateqoriyaları ifadə edir.

Biz ingilis dilində qrammatik zaman kateqoriyasının üçüzvlü oppozisiyadan ibarət olması qənaətindəyik[7]. Analoji fikir F.Cahangirovun tədqiqatında da irəli sürülür[8].

İngilis dilində gələcək zaman məsələsi dilçilik ədəbiyyatında kifayət qədər araşdırıldığından onun üzərində dayanmayacağıq, amma bu sahədə bəzi ümumiləşdirmələr aparmağa ehtiyac vardır. İstər ingilis- və ya rusdilli ədəbiyyatda, istərsə

---

[1] Palmer F.R. A Linguistic Study of the English Verb. London: Longman. 1965, p. 169.
[2] Palmer F.R. The English Verb. London: Longman. 1974.
[3] Смирницкий А.И. Морфология английского языка. М., 1959.
[4] Воронцова Г.Н. Очерки по грамматике английского языка. М., 1960.
[5] Ilysh B.A. The Structure of Modern English. Leningrad, 1971.
[6] Бархударов Л.С. Очерки по морфологии современного английского языка. М., 1975.
[7] Tahirov İ. İngilis dilində gələcək zaman məsələsinə dair // Özəl tədris müəssisələrində elmi, elmi-metodiki işlərin təşkili. «Problem» Milli Təhsil Mərkəzi, Bakı, 1996, s. 56-59.
[8] Cahangirov F. Perfekt zamanlar. Bakı, Elm, 2000.

də Azərbaycan tədqiqatçılarının əsərlərində bu məsələdən danışılarkən, daha çox hansı alimlərin həmin fikri qəbul edib-etməməsi sadalanır. Dilçilik ədəbiyyatını nəzərdən keçirdikdə, ingilis dilində zaman sisteminin ikiüzvlü oppozisiyadan ibarət olduğu fikrinin əsasən iki mülahizəyə söykəndiyinin şahidi oluruq: 1) indiki və keçmiş zaman morfoloji cəhətdən şəkillənə bildiyi üçün oppozisiya əmələ gətirir, başqa zamanlar (buraya davamedici, perfekt və perfekt-davamedici zaman formaları aid edilir) köməkçi fellərlə qurulduğuna görə oppozisiya yaratmır; 2) ingilis dilində zamanların uzlaşması qaydasının şamil edildiyi və edilmədiyi hallara uyğun olaraq bu dildə yalnız iki temporal sfera vardır.

Göründüyü kimi, ingilis dilində zaman formalarının sayı barədəki mübahisədə bir şey – zaman formalarının müəyyənləşdirilməsində formaya, yoxsa məzmuna üstünlük verilməsi nəzərə alınmır. Dixotomik zamanların tərəfdarları tərz-zaman sisteminin formal simmetriyasından çıxış edirlər. Trixotomik zamanların ardıcılları psixoloji yaşanan zamanın keçmiş, indiki və gələcək olmaqla üç məna və ya məzmun sferasına bölgüsündən çıxış edirlər. Perseptual zamanın subyektin psixikasında inikas edən üçüzvlü «keçmiş – indiki – gələcək» sistemi bütün dil vasitələri ilə nitqdə adekvat şəkildə təmsil olunur.

Dil və nitq kateqoriyalarına sahə metodu ilə yanaşma, yəni funksional-semantik yanaşma çərçivəsində bu və ya digər dildə qrammatik gələcək zaman kateqoriyasının mövcudluğu və ya yoxluğu prinsip etibarilə əhəmiyyət daşımır, qarşıya qoyulan həlli vacib məsələlər içərisində əhəmiyyətlilik etibarilə ikinci plana keçir. Sahə yanaşmasında birinci plana dildəki gələcək zamanın koqnitiv semantik səciyyəsinin və konkret dilin daşıyıcısı tərəfindən onun nitqdə realizə edilməsi spesifikasının öyrənilməsi keçir. Koqnitiv planda indiki, keçmiş və gələcək bərabərhüquqlu üzv götürüldüyü kimi, sahə yanaşmasında da həmin sistemin bərabərhüquqlu üzvləri olan keçmiş və in-

diki zamanlar sırasından gələcəyin çıxarılması reallıqdan kənar olardı.

Beləliklə, Azərbaycan və ingilis dillərinin materialları əsasında morfoloji temporallıq sahəsinin tədqiqində Azərbaycan dilində 5, ingilis dilində isə 12 zaman forması nəzərə alınır.

### 4.1. Keçmiş zaman mikrosahəsi

Başqa zaman anlayışları kimi, kesmiş zaman da universal xarakter daşıyır və bütün dillərdə mövcuddur. Universal xarakter daşıdığına görə keçmiş zamanın mikrosahə şəklində təqdimatı da  eyni bir universal sxemin variantları kimi təsəvvür oluna bilər. Morfoloji keçmiş zaman mikrosahəsini təşkil edən konstituentlər üçün vahid invariant əlamət – hərəkətin keçmişə aid edilməsi – həmin konstituentlərin funksional cəhətdən qarşılıqlı əlaqəsinin semantik əsası kimi çıxış edir. Bütövlükdə götürülən həmin məzmun Azərbaycan və ingilis dillərində mikrosahəni təşkil edən oxşar komponentlər arasında müxtəlif şəkildə paylanır.

Morfoloji keçmiş zaman mikrosahəsinin modelinin qurulması üçün nümunələr hər iki dildə müasir yazıçıların roman, hekayə, dram əsərlərindən və qəzet materiallarından toplanmışdır. Tədqiqata pesonajların həm monoloji, həm dialoji nitqi, həm də nağıllamadakı müəllif nitqi və s. cəlb edilmişdir. Tədqiqata ona görə bu materiallar cəlb edilmişdir ki, bədii əsərlər dil kollektivinin canlı nitq fəaliyyətini az-çox dərəcədə təmsil edir, müəyyənləşmiş ədəbi dil normativliyini təzahür etdirir, canlı xalq danışıq dilini təcəssüm etdirir.

### 4.1.1. Keçmiş zaman mikrosahəsinin əsas morfoloji komponentləri

Azərbaycan dilində morfoloji keçmiş zaman mikrosahəsi iki zaman forması ilə təmsil olunur. Bunlar *-dı*[4] şəkilçisi ilə düzələn şühudi keçmiş zaman, *-mış*[4] və *-ıb*[4] şəkilçiləri ilə əmələ gələn nəqli keçmiş zaman formalarıdır. Bu zaman formaları qrammatik zaman kateqoriyasının və ya, başqa sözlə desək, morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edir.

Morfoloji nüvənin təhlili göstərir ki, Azərbaycan dilində qrammatik keçmiş zaman iki standart formada təzahür edir. Əlbəttə, ingilis dili ilə müqayisədə Azərbaycan dilində keçmişlik məzmununun ifadəsində müəyyən dərəcədə sıxılma olduğu aşkara çıxır. İki standart forma indiki zamana münasibətdə «yaxın» və «uzaq», «əlaqəli» və «əlaqəsiz» zonalara ayrılmamaqla keçmiş zaman sferasını təmsil edir. Başqa şəkildə ifadə etsək, ingilis dilində keçmiş zaman sferasında aşkar olunan laylar Azərbaycan dilinin keçmiş zaman sferasında da vardır. Bəllidir ki, ingilis dilindəki semantik keçmiş zaman zonası müəyyən laylara bölünür və bu laylar indiki zamana nisbətdə müxtəlif uzaqlıqları əks etdirir. Yaxın və uzaq keçmişi, keçmişi və keçmişdən əvvəlkini fərqləndirmək üçün ingilis dilində dörd morfoloji formadan istifadə edilir: *The Past Indefinite, The Past Continuous, The Past Perfect, The Past Perfect Continuous*. Bunların arasında üç analitik zaman forması vardır.

Nəticədə Azərbaycan dilindəki morfoloji keçmiş zaman ifadə edilən iş, hal və hərəkətin əsasən təsvirinə və təsnifatına yönəlirsə, ingilis dilindəki morfoloji keçmiş zaman formaları həmin iş, hal və hərəkətə münasibətdə müxtəlif hesablanma və ya çıxış nöqtələrinə istinad edir, yəni qarşılaşdırılan dillərdə morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edən

komponentlər öz mənalarında keçmiş hərəkətlərin müxtəlif xüsusiyyətlərini əks etdirir.

Bütün bu müxtəlifliklərlə bərabər, qarşılaşdırılan dillərdə morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edən komponentlərin heç də hamısı nitqdə eyni dərəcədə «yüklənmiş» olmur. İngilis dili üçün morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edən dörd formadan biri – *The Past Indefinite Tense* digər üç analitik formadan fərqli olaraq keçmişlik mənasının ifadə ediilməsində dominant rola malikdir. Davamedici zaman formaları olan *The Past Continuous* və *the Past Perfect Continuous* kommunikasiya prosesində az işlənir. Bu isə onu göstərir ki, ingilis dilində morfoloji keçmiş zaman mikrosahəsinin nüvə komponentləri arasında analitik keçmiş zaman formaları kəmiyyət etibarilə çoxluq təşkil etsə də, nitq prosesində aparıcı mövqe sintetik fel forması olan *The Past Indefinite* formasına məxsusdur.

Funksional münasibətdə *The Past Indefinite* zaman formasının işlənməsi Azərbaycan dilindəki *-dı*$^{4}$ şəkilçili keçmiş zaman formasının işlənməsilə təqribən eynidir. Azərbaycan dilində morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edən şühudi və nəqli keçmiş qrammemlərindən biri – *-dı*$^{4}$ şəkilçili keçmiş zaman forması daha işləkdir və yüksək kommunikativ yük daşıyır. Bu forma iki şəkli əlamətlə (*-mış*$^{4}$ və *-ıb*$^{4}$) çıxış edən nəqli keçmiş zaman forması ilə müqayisədə daha işləkdir və dominant rol oynayır.

Azərbaycan dilində keçmiş zaman mikrosahəsinin nüvə strukturunda dominantlıq edən şühudi keçmiş zaman formasının əsas komponentlər arasında ümumi çəkisi 62, 31 %-dir (Əlavələrə bax). Bədii üslubda bu formanın işlənməsi 65,59 %, qəzet dilində isə 42,05 % təşkil edir. Bununla belə, nəqli keçmiş zaman formasının da funksional baxımdan qeyd edilməli cəhətləri vardır. Keçmiş zaman mikrosahəsinin əsas morfoloji komponenti kimi çıxış edən *-mış*$^{4}$ və *-ıb*$^{4}$ şəkilçili for-

malar keçmiş zaman anlayışının ifadəsində mühüm rol oynayır. Araşdırma zamanı məlum olmuşdur ki, *-mış*$^{4}$ forması daha işlək olmaqla bədii üslubda 11,94 %, qəzet dilində 18,1 % təşkil edir. *-Ib*$^{4}$ formasının ümumi çəkisi bədii dildə 6,36 %-ə, qəzet dilində 35,55 %-ə bərabərdir. *-Mış*$^{4}$ formasının bədii dildə işləkliyi *-ıb*$^{4}$ formasından faiz etibarilə təxminən iki dəfə çoxdursa, qəzet dilində bu fərq elə o qədər *-ıb*$^{4}$ formasının xeyrinə dəyişir. Ümumiyyətlə, mikrosahə üzrə götürdükdə, keçmiş zaman anlayışının ifadə edilməsində əsas komponentlərin ümumi çəkisi 85,67 % təşkil edir.

Azərbaycan dilində keçmiş zaman formalarının müqayisəli tədqiqi onların bir sıra semantik xüsusiyyətlərini ortaya çıxarmağa imkan verir. Bu formalar formal morfoloji əlamətləri ilə fərqləndiyi kimi, zəngin məna xüsusiyyətləri ilə də biri-birindən seçilir.

*-Dı*$^{4}$ şəkilçili formanın məna xüsusiyyətləri arasında nəzəri o cəlb edir ki, bu forma ilə iş, hal və ya hərəkətin keçmişdə qəti icra olunub bitdiyini bildirilir. Məsələn:

*Oğlan uşağı* ***dünyaya gəldi****, adını Sadıq* ***qoydular*** (S.Səxavət). *Niftalı koxanın sifətini soyuq tər basdı, üz-gözünü* ***qırışdırdı****, sonra bu ağrı və iztirabların əvəzində çöhrəsində təbəssümə bənzər bir ifadə* ***sezildi*** (İ.Şıxlı). Əjdərin Bakıda olduğunu Sərvər çayxanada ***öyrəndi*** (Ə.Əylisli). *Tüfəngini ağaca* ***söykədi****, çəkmələrini* ***soyundu****, yaxası qaytanlı köynəyinin düymələrini* ***boşaltdı*** *və palazın üstünə uzanıb mütəkkəyə* ***dirsəkləndi*** (İ.Şıxlı).

*-Dı*$^{4}$ şəkilçili formanın geniş yayılan məna xüsusiyyətləri arasında şahidlik xüsusi yer tutur, yəni bu zaman forması ilə ifadə olunan hərəkətin subyekti keçmişdə baş verən iş, hal və hərəkətə bilavasitə şahidlik edir. Başqa cür ifadə etsək, bu şəkilçi ilə işlənən forma keçmiş hal və ya hərəkətin icrasında danışanın bilavasitə şahidliyini göstərir. Danışan elə hərəkətlər haqqında məlumat verir ki, həmin hərəkətləri o ya gözləri ilə

görmüş, ya baş verənləri özü eşitmiş, ya da həmin hərəkətlərin icra olunmasında bilavasitə iştirak etmişdir. Nümunələrin təhlili göstərir ki, bu məna daha çox subyektin özü ilə, birinci şəxslə bağlı olur. Tədqiqatçılar keçmiş zamanın bu məna xüsusiyyətindən çıxış edərək bəzən onu yaxın keçmiş adlandırırlar[1]. Nümunələrə diqqət yetirək:

*Mən mükafatımı **aldım*** (Ə.Cəfərzadə). *-Ürəyim **darıxdı**, bir az hava almaq üçün Cıdır düzünə **qalxdım*** (İ.Əfəndiyev). *Mən «Dəli Kür» romanını yazdıqdan sonra Azərbaycanda 20-ci illərdə baş verən inqilab tariximizdən yazmaq **qərarına gəldim**, müəyyən materiallar **topladım**, hətta əsərin adını da oxuculara **çatdırdım*** (İ.Şıxlı). *Əlbəttə ki, mən onlara Mürsəlin adını verə bilməzdim və məni tutmasınlar deyə **qaçdım*** (Ə. Əylisli).

*-Dı*[4] şəkilçili forma ilə ifadə olunan hərəkətlərdə nitq momentinin mütləq xarakter daşıdığı müşahidə olunur, yəni həmin forma ilə verilən hərəkətlər müəyyən zaman çərçivəsində ardıcıl surətdə bir-birini əvəz edir. Məsələn:

*Zəng **çalındı**, məktəbin qapıları taybatay **açıldı** və balacalar hay-küylə həyətə **cumdular*** (R.İbrahimbəyov). *Kişi hasara **yaxınlaşdı**, küçəyə **boylandı** və oğlanın yanına **qayıdıb oturdu*** (R.İbrahimbəyov). *Tüfəngini ağaca **söykədi**, çəkmələrini **soyundu**, yaxası qaytanlı köynəyinin düymələrini **boşaltdı** və palazın üstünə uzanıb mütəkkəyə **dirsəkləndi*** (İ.Şıxlı).

Bu tipli hərəkətlərin ardıcıl, bir-birini izləyən olması, hərəkətin dinamikliyini bildirməsi barədə qrammatika kitablarında çox yazılmışdır. Müşahidələr onu deməyə əsas verir ki, bu hərəkətlər real həyatda baş verənlərin zaman etibarilə bir-birini izləməsidir. Belə bir ardıcıllıqla baş verən hərəkətlər ümumi dinamikaya malikdir və onlardan biri digəri üçün səbəb və ya nəticə bildirir.

---

[1] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 55.

-*Mış*$^4$ şəkilçili forma üçün səciyyəvi cəhət keçmişə aid iş, hal və ya hərəkətin nitq momentinə münasibətdə nəticəsini bildirməkdir. Bu cəhət özünü üstün xüsusiyyət kimi göstərir və çox zaman bu formanın digər semantik xüsusiyyətləri ilə paralel şəkildə təzahür edir.

*Mən ki, hökumətin pulunu* ***qaçırtmamışam*** (Ə.Əylisli). *Parisdə də, mən heç vaxt* ***olmamışam*** (Anar). *Oranı qanımızla* ***azad etmişik*** (S.Əhmədli). *Bu səhnədə* ***saç ağartmışam*** (Anar). *Səfalı dağlarımızı, saf sularımızı, min hektarlarla münbit, məhsuldar torpaqlarımızı* ***vermişik*** (S.Əhmədli). *Mən bu saat ən yaxın bir yoldaşımın toyundan* ***çıxmışam*** (Anar).

-*Mış*$^4$ şəkilçili forma keçmiş zamanda icra olunmuş iş və ya hərəkətin, mövcud olmuş halın qeyri-müəyyən keçmişə aid olunduğunu bildirir.

*Çox butləri dağılan, yeksan olan* ***görmüşük****. Çox mərmər heykəlləri, Biz ucalan* ***görmüşük*** (B.Vahabzadə). *Biz sənin dostluğunu düşmənlərimizə verdiyin cavablardan* ***görmüşük****, səni bərkdə-boşda* ***sınamışıq****, əziz Qara Kepka, belə sözlər nəyə lazım?* (Elçin)

-*Mış*$^4$ şəkilçili formanın semantik xüsusiyyətlərindən biri subyektin iş, hal və ya hərəkətin icrasına şahid olmasını bildirməkdir. -*Dı*$^4$ şəkilçili forma ilə müqayisədə -*mış*$^4$ formasının ifadə etdiyi hərəkətlərdə subyektin hərəkətin icrası ilə bağlı şahidliyi az hiss edilir[1].

-*Ib*$^4$ şəkilçili formanın ifadə etdiyi iş, hal və hərəkətlərin semantik xüsusiyyətləri -*mış*$^4$ şəkilçili formanın ifadə etdiyi hərəkətlərin semantik xüsusiyyətləri ilə eynidir. Bu barədə Azərbaycan dilinin qrammatika kitablarında xeyli bəhs edilmişdir[2]. Araşdırdığımız faktik material da bunu təsdiq edir:

---

[1] Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980, s. 329.
[2] Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980, s. 328.

*Bu gün, indicə baş vermiş hadisəni dörd gün bundan qabaq belə aydınca, əyani şəkildə* ***görüb, yaşayıb*** (Anar). *-Bütün qabaqcıl bəşəriyyət, bütün düşünən insanlar da bununla* ***mübarizə aparıb...*** (Ə.Cəfərzadə). *Evlərinə gedəndə* ***göz qoymuşam*** (İ.Əfəndiyev). *Üç gün irəli tayfa başçıları qurultaya* ***toplaşıb*** (Ə.Cəfərzadə). *Və Lətif müəllim gözünü bircə saniyəliyə o qapıdan çəkən kimi bir də baxıb gördü ki, yanındakı şeylər azalmaqdansa* ***artıb, çoxalıb*** (Ə.Əylisli). *Baxdı ki, məktəbdən bir qədər yuxarıda, Şahvələdlidən bəri - enişə, rayon mərkəzinin başına yaxın yerdə bir darvaza* ***ucalıb*** (S,Əhmədli). *O, NATO ilə əməkdaşlığın bundan sonra daha da genişlənəcəyinə əminliyini* ***vurğulayıb*** («Azərbaycan» qəzeti). *İqtisadi inkişaf dinamikasına görə Azərbaycan dünya dövlətləri arasında öncül mövqeyə* ***çıxıb*** («Şərq» qəzeti). *Bu əl, bu barmaqlar klassik poeziyamızda «şanə barmaqlar, şümşad əllər»* ***adlanıb*** (Ə.Cəfərzadə).

Göründüyü kimi, misallarda fel formalarındakı şəkilçilərin bir-biri ilə əvəzlənməsi onun məzmununa heç bir dəyişilik gətirmir.

İngilis dilində morfoloji keçmiş zaman formalarının müqayisəli təhlili onların bir çox funksional-semantik xüsusiyyətlərini ortaya çıxarmağa imkan verir. Yuxarıda qeyd edildiyi kimi, ingilis dilində keçmiş zaman zonası yüksək detallaşdırma dərəcəsinə malikdir. İngilis dilində keçmişdə baş vermiş hərəkətlərin ifadəsi üçün bir neçə morfoloji forma mövcuddur. Onların köməyi ilə yaxın, uzaq, nitq momenti ilə əlaqəli və ya əlaqəsiz, diskret və ya qeyri-diskret və s. keçmiş hərəkətlər ifadə edilir. Həmin hərəkətlər *The Past Indefinite, The Past Continuous, The Past Perfect, The Past Perfect Continuous* kimi morfoloji formalar vasitəsilə reallaşır. Müasir ingilis ədəbiyyatı nümunələri əsasında aparılmış araşdırmalar belə nəticəyə gəlməyə imkan verir ki, mikrosahənin əsas morfoloji komponentləri olan formaların heç də hamısı nitq prosesində

işlək deyildir. Əsas yük *The Past Indefinite* zaman formasının üzərinə düşür. Bu formanın nitq prosesində kommunikativ yükü, işləklik dərəcəsi digər üç komponentin birlikdə götürülən göstəricilərindən daha çoxdur. Məsələn, bədii üslubda *The Past Indefinite* formasının işləkliyi keçmiş zaman mikrosahəsi üzrə ümumilikdə 56,79 % (bədii üslubda 58,62 % , qəzet dilində isə 45,86 % ) təşkil edir. Göründüyü kimi, *The Past Indefinite* forması hər iki üslubda işləklik səviyyəsinə, kommunikativ yük daşıma dərəcəsinə görə daha üstündür.

Davamedici formalar – *The Past Continuous* və *The Past Perfect Continuous* müasir ingilis dilində aşağı işləklik səviyyəsi ilə səciyyələnir. Məsələn, mikrosahə üzrə həmin zaman formalarının işləkliyi müvafiq olaraq 4,02 % və 1,47 % təşkil edir. Bədii üslubda *The Past Continuous* formasının işləkliyi 3,62 %, qəzet dilində 6,4 % təşkil edir. *The Past Perfect Continuous* forması bədii üslubda 1,52 %, qəzet dilində isə 1,2 % işlənir.

Davamedici zaman formaları ilə müqayisədə *The Past Perfect* formasının kommunikativ yükü daha çoxdur. Bütövlükdə mikrosahə üzrə *The Past Perfect* formasının işləkliyi 15,86 % təşkil edir. Üslublar üzrə müqayisə etdikdə, *The Past Perfect* formasının işlənmə tezliyi bədii üslubda 14,86 %, qəzet dilində 21,73 % təşkil edir. *The Past Perfect* formasının qəzet dilində daha çox işləndiyi diqqəti cəlb edir.

Hesablamalar göstərir ki, ingilis dilində keçmiş zaman anlayışının ifadə edilməsində əsas morfoloji komponentlərin mikrosahə üzrə ümumi çəkisi 78,14 % təşkil edir.

Araşdırılan material belə bir qənaətə gəlməyə əsas verir ki, ingilis dilində keçmiş zaman mikrosahəsinin morfoloji komponentləri sırasında analitik formalar çoxluq təşkil etsə də, nitq prosesində aparıcı mövqeni yeganə sintetik forma olan *The Past Indefinite* forması tutur. Mikrosahənin dominantı olan bu zaman forması birmənalılığı ilə, digər zaman formala-

rını üslubi baxımdan əvəzetmə ehtimalının olmaması ilə səciyyələnir. Bu forma, demək olar ki, həmişə keçmişdə baş verən konkret iş və ya hərəkəti, mövcud olmuş halı ifadə etməyə xidmət edir. Buna görə də *The Past Indefinite* forması tam qrammatikləşmə nəticəsində felin leksik mənası ilə məhdudlaşmayan birləşmə əmələ gətirmək qabiliyyətini təmin edir.

Qarşılaşdırdığımız dillərdə morfoloji keçmiş zaman mikrosahəsinin nuvə strukturunda müşahidə olunan müxtəliflik bir daha göstərir ki, ingilis dilində felin zaman kateqoriyası zaman nisbəti kateqoriyası ilə də sıx bağlıdır. Məlumdur ki, ingilis dilində felin təsriflənən formaları sistemində nisbi zaman müstəqil kateqoriya kimi ifadə olunur. Məsələn, indiki, keçmiş və gələcək zamanların əsas oppozisiyaları ilə yanaşı, həm də nisbi zaman oppozisiyası, öncəgəlmə, eynizamanlılıq və sonragəlmə mövcuddur. Bu fakt *The Past Continuous, The Past Perfect* və *The Past Perfect Continuous* zaman formalarının da nüvə komponentləri kimi fəaliyyət göstərməsini şərtləndirir. Məlumdur ki, həmin zaman formaları keçmişdə bir hərəkətin digərinə görə öncəgəlməsini xarakterizə edir

*Arrowhead **intimated** his intention to go towards the fire, and ascertain who **had lighted** it; while he **advised** his wife and the two others to return to a canoe, which they **had left** in the adjacent stream, and await his return* (J.F.Cooper). *And thereat she **began** to talk quickly and easily upon the subject he **had suggested*** (J. London). *One day, when reports **had been coming** in relating to the bass and perch, he **announced** his intention of making a two or three days' visit to the lakes* (O.Henry).

Azərbaycan dilində felin zaman formalarında nisbilik səciyyəsi ingilis dili ilə müqayisədə çox zəifdir. Bu dildə nisbi zamanın ifadə edilməsi üçün xüsusi qrammatik formalar yoxdur. Azərbaycan dilində zaman nisbəti və ya aidiyyəti mütləq zamanların ikinci funksiyası kimi təqdim edilir. Məsələn, ey-

nizamanlılıq mənası adətən indiki zaman forması, öncəgəlmə isə keçmiş zaman formaları ilə ifadə edilir:

*Sadıqgili bir yerə toplayıb* ***dedilər*** *ki, bu gündən* ***səfərbərliyə alınırsınız*** (S.Səxavət). *Ekspert* ***bildirdi*** *ki, bu dəfə jurnalistlər hərbi problemlərə etik qaydada, konstruktiv baxımdan* ***yanaşıblar*** («Ayna» qəzeti, 13.11.2006). ***Deyirlər****, Xəzərin suyu qalxmağa* ***başlayıb*** (Ə.Cəfərzadə). *Cavanşir bunu dedi və bu sözlərin mənasızlığından və köməksizliyindən yenə* ***hiss elədi*** *ki, qulaqlarının dibinə kimi qıpqırmızı* ***qızarıb*** (Elçin). *Səhərisi də* ***eşitdi*** *ki, başını götürüb evdən* ***qaçıb****...* (İ.Şıxlı).

Qeyd etmək lazımdır ki, zaman nisbəti və ya aidiyyəti münasibətləri Azərbaycan dilində prinsip etibarilə digər, morfoloji olmayan vasitələrlə, məsələn, leksik və ya sintaktik temporallıq vasitələri, kontekst və s. ilə ifadə oluna bilər.

Burada bir məsələ xüsusi qeyd edilməlidir. Azərbaycan və ingilis dillərində hansısa zaman formasının olmasından və ya olmamasından, hansısa mikrosahənin qrammatik zonasının detallaşdırma, laylara bölünmə, stratifikasiya zəifliyindən danışarkən, biz bir dilin digər dil üzərində üstünlüyünü göstərmək, birinin zəif, digərinin güclü inkişaf səviyyəsində olmasını göstərmək məqsədi güdmürük. Zaman formalarının komponent təhlili və onların nitqdə işlənmə xüsusiyyətlərinin araşdırılması göstərir ki, qarşılaşdırılan Azərbaycan və ingilis dillərində zaman formalarının potensial və praktik cəhətdən ifadə etdiyi və ifadə edə biləcəyi mənaların ümumi sahəsi təxminən üst-üstə düşür. Fərq həmin semantik sahənin bölünmə və ya üzvlənmə üsullarındadır və bu fərq dillərin tipoloji xüsusiyyətlərini təmsil edir. Bu, dilin daşıyıcısı olan xalqların gerçəkliyi dərketmə xüsusiyyətləri ilə bağlı olub kulturoloji əhəmiyyət daşıyır. Dildəki ifadə vasitə və üsullarının qrammatik tərtibat xarakteri texniki cəhətdən işlənib hazırlanmış olan, vərdiş halını almış və məcburi dil formalarında hansı dəyərlərin tətbiq

edildiyini, hansılarının isə danışanın şəxsi təşəbbüsündən asılı olduğunu göstərir. Belə fərqlər Azərbaycan və ingilis dillərinin tipoloji özünəməxsusluqlarını göstərir.

### 4.1.2. Keçmiş zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri

Qarşılaşdırılan dillərdə keçmiş və indiki zaman mikrosahələrinin funksional baxımdan müəyyən qarşılıqlı əlaqə zonası göz önündədər. İngilis dilində həmin qarşılıqlı əlaqə zonası Azərbaycan dilində olduğundan daha genişdir. Faktik dil materiallarının təhlili göstərir ki, ingilis dilində keçmiş zaman ideyasının ikinci dərəcəli morfoloji ifadə vasitələri arasında fel zamanlarından *The Present Indefinite, The Present Continuous, The Present Perfect* və *The Present Perfect Continuous* formaları təmsil olunur. Göründüyü kimi bu formaların hamısı indiki zamanla bağlıdır. Onlar morfoloji keçmiş zaman mikrosahəsinin nüvəətrafı zonasına daxildir. Azərbaycan dilindəki mikrosahənin analoji zonasının təhlili göstərir ki, kəmiyyətcə daha az olan ikinci dərəcəli morfoloji ifadə vasitələri funksional cəhətdən keçmiş zaman mənasını ifadə etməyə qabildir. Məsələn, ikinci dərəcəli morfoloji vasitələr sırasına indiki və qeyri-qəti gələcək zaman formaları daxildir. Bunların arasında üstünlük indiki zamana məxsusdur. Bu baxımdan qarşılaşdırılan dillərdə oxşarlıq aydın görünür. Müqayisə üçün deyək ki, ingilis dilində indiki zamanın qeyri-müəyyən, davamedici, perfekt və perfekt davamedici formaları keçmiş zamanı üslubi cəhətdən əvəz edə bilir.

İngilis dilində bu zaman formaları arasında əsas funksional yük indiki qeyri-müəyyən zaman formasının (*The Present Indefinite*) üzərinə düşür. Bu zaman formasının keçmiş zaman anlayışının ifadə olunmasında iştirak payı ümumilikdə 6,33 % (bədii üslubda 6,42 %, qəzet dilində 5,8 %) təşkil edir. Keçmiş

zaman mənasında işlənən indiki qeyri-müəyyən zaman forması (*The Present Indefinite*) üçün əsas xüsusiyyət ondan ibarətdir ki, o, müəyyən üslubi şəraitdə işlənir, yəni onun kateqorial zaman mənası ilə bütövlükdə kontekstin temporallığı arasında ziddiyyət olur: kontekst keçmişi göstərsə də, fel forması indiki zamanı göstərir. Məsələn:

*This morning ... she **has no chance**. The will **disappears**, and she **takes** its secret with her to her grave* (A.Cristie). *She **arrives** full of life and spirit. And about a quarter of an hour later she **sits** down in a chair, **says** she **doesn't feel well, gasps** a bit and **dies*** (S.Maugham). *Another day, he **says** he **has** very important business, and knowing Your Eminence to be an early riser* (E.Voynich). *At that moment, in **comes** a policeman* (E.Voynich).

Göründüyü kimi, belə hallarda biz indiki indiki qeyri-müəyyən zaman formasının (*The Present Indefinite*) keçmiş zaman sferasında *praesens historicum* (tarixi və ya təsviri indiki zaman) kimi işləndiyini müşahidə edirik. Bu daha çox xatırlama ilə bağlı olur və bu halda keçmişdəki hadisələr haqqındakı fikir indiki zaman vasitəsilə canlandırılır.

İngilis dilində «*John tells me* **...**», «*Our correspondent writes…*», «*Ten o'clock news says…*» tipli birləşmələrdə işlənən «ünsiyyət felləri» ilə (*verbs of communicating*)[1] işlənən formalar keçmişdə baş verən hərəkətlərin ifadəsində ayrıca növ təşkil edir. *The Present Indefinite* formasının işləndiyi belə cümlələrdə məlumatın kommunikasiya mərkəzi danışan tərəfindən söyləmin son hissəsinə keçirilir, çünki verilən məlumat onun qəbul edildiyi anda qüvvəsində qalır. Məsələn:

*John **tells** me that there was a car accident last night. "Germans know how dangerous a madman at the helm can be," Gert Weisskirchen, a foreign policy expert for the Social*

---

[1] Quirk R. et al. A University Grammar of English. M., 1982, p. 43.

*Democrats*, ***tells*** *der Spiegel magazine* (The Washington Times. 13.07. 2006 ). *"The United States which claims herself to be the mother of democracy, must respect the election results and the will of the Palestinian people,"* ***says*** *the Hamas spokesman for its leader Mushir al Masri* (The Washington Times. 20, 2006).

İngilis dilində keçmiş zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri arasında *The Present Perfect* forması xüsusi yer tutur. O, keçmişlik ideyasını ifadə edən komponentlər arasında *The Present Indefinite* forması ilə funksional cəhətdən təxminən eyni mövqe tutur. Hesablamalar göstərir ki, bu zaman formasından bədii üslubda 4,84 %, qəzet dilində isə 6,4 % istifadə olunmuşdur. Keçmişlik məzmununun ifadə edilməsində indiki bitmiş zaman formasının işləkliyi ümumilikdə 5,06 % təşkil etmişdir.

*The Present Perfect* formasının təbiətindəki ziddiyyət, hər şeydən öncə, onun semantikası ilə bağlıdır. Nitq momentindən öncəgəlmə bildirdiyinə görə daha çox keçmişlə bağlı olan bu forma özünə indiki zaman formaları arasında yer tutur. Bu formanın kontekstdən asılı olmayan əsas temporal mənası, yəni keçmişdəki situasiyanı bildirməsi adətən kontekstdən asılı olan nəticəlilik və nisbət mənaları ilə tamamlanır. Məlumdur ki, *The Past Indefinite* və *The Present Perfect* formaları obyektiv keçmiş zamanı ifadə edə bilir. *The Past Indefinite* forması ilə eyni denotativ funksiya daşısa da, *The Present Perfect* ondan keçmişdə baş verən hərəkəti təqdim etmə üsuluna görə fərqlənir. Fərq özünü hadisələr arasındakı zaman münasibətlərini göstərməkdə təzahür etdirir. Məsələn:

-*You* ***have got*** *a visitor, I left him at the house.*

-*You* ***have left*** *someone in the house? Alone?* (S. Maugham).

Beləliklə, *The Present Perfect* formasının mənasını əmələ gətirən əsas çalarlar, yəni semalar öncəgəlmə və nisbət se-

malarıdır. Bunlardan birincisi *The Present Perfect* formasını keçmiş zaman mikrosahəsinə daxil etməyə imkan verir, ikinci sema isə keçmişdəki hadisəni indiki zamanla bağlamağa kömək edir. Həmin bağlanma onunla şərtlənir ki, o, bir tərəfdən, keçmişdə başlamış olsa da, indiki zamanı da əhatə edən hərəkətin davam müddətini, digər tərəfdən, keçmiş hadisənin indiki zamanda nəticəsini bildirir.

Hərəkəti keçmiş zaman sferasına aidetmə üsulu kimi *The Present Perfect* forması *The Past Indefinite* formasından bir neçə əlamətə görə fərqlənir. *The Present Perfect* forması keçmiş hərəkəti 1) indiki momentə qədər davam edən hərəkət kimi, 2) indiki zamanda nəticəni göstərən hərəkət kimi və 3) keçmiş zamanda lokallaşmayan hərəkət kimi xarakterizə edir. Məsələn:

*"It is not strange that I* ***have had*** *sympathy for him," he said at last* (S. Maugham). *It's strange how often I'****ve longed for*** *a tea like this* (E.Voynich).

*The Past Indefinite* forması nitqdə işləndiyi bütün hallarda iki semantik elementin olmasını nəzərdə tutur. Başqa sözlə desək, *The Past Indefinite* forması hərəkəti ya indiki zamana qədər icra olunmuş, bitmiş şəkildə təqdim edir, ya da hərəkəti keçmiş zaman sferasında kifayət qədər dəqiq şəkildə lokallaşdırır.

*The Present Continuous* və *The Present Perfect Continuous* formaları keçmiş zaman kontekstində kifayət qədər az işləkliyi ilə səciyyələnir. Bizim hesablamalara görə, *The Present Continuous* zaman formasının keçmiş zaman kontekstində işləkliyi bütövlükdə 1,25 % (bədii üslubda 1,42 %, qəzet dilində 0,13 %) təşkil etmişdir. *The Present Perfect Continuous* forması isə bədii üslubda 0,24 % təşkil etmiş, qəzet dilində ümumiyyətlə işlənməmişdir. Bu zaman formalarının hər ikisi müəyyən zaman kəsiyində davam edən hərəkəti nitq momenti vasiəsilə indiki zamana keçən şəkildə təqdim edir, lakin onu

da nəzərdə tutur ki, hərəkət başlanğıcı və qismən davam müddəti etibarilə keçmiş zaman sferasına keçir:

*If you **are being followed**, you **are wasting** time here* (B.Shaw). *Yes, I **am keeping** them till my daughter is of marriageable age…* (S.Maugham). *Who's **trying** to deceive you?* (B.Shaw). *I **have been thinking** about it for a long time* (J. London).

Azərbaycan dilində keçmiş zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri sırasına indiki və qeyri-qəti gələcək zaman formaları daxildir.

-(*Y*)*ır*[4] şəkilçili indiki zaman forması ikinci dərəcəli morfoloji ifadə vasitələri arasında dominant olmaqla hərəkətin keçmişdə baş verməsinin müxtəlif çalarlarını ifadə edə bilir.

-(*Y*)*ır*[4] şəkilçili indiki zaman formasının hərəkəti keçmiş zaman sferasına keçirməsi müəyyən funksional-semantik məqamlarla bağlıdır. Belə hallarda biz yuxarıda ingilis dili üçün nəzərdən keçirdiyimiz *praesens historicum* (tarixi və ya təsviri indiki zaman) hadisəsinin şahidi oluruq. *Praesens historicum* (tarixi və ya təsviri indiki zaman), yəni indiki zamanın keçmiş sferasına transpozisiyası Azərbaycan dili üçün ingilis dili ilə müqayisədə daha tipik hadisədir.

A.Axundov yazır ki, indiki zamanın keçmiş zaman yerində işlənməsi xüsusən geniş yayılmışdır. Buna istər bədii, istərsə də elmi ədəbiyyatın dilindən çoxlu misallar göstərmək olar. O, bu cəhətin canlı danışıq dilində, xüsusən, şifahi xalq yaradıcılığının müxtəlif janrlarında müşahidə edildiyini də göstərir[1].

İndiki zaman formasının keçmiş zaman mənasında işlənməsi müxtəlif semantik xüsusiyyətlər yaradır. Məsələn, bədii üslubda, canlı danışıq dilində, şifahi xalq yaradıcılığının müxtəlif janrlarında keçmiş zaman mənasında işlənmiş indiki

---

[1] Axundov A. Dilin estetikası. Bakı, Yazıçı, 1985, səh. 79.

zaman forması keçmişdə icra edilmiş iş və ya hərəkəti, mövcud olmuş halı daha canlı şəkildə vermək, oxucunu və ya dinləyəni həmin hərəkətlərin bilavasitə iştirakçısına çevirmək məqsədini güdür, bu yolla onun təsir gücünü artırır. İndiki zaman vasitəsilə bədii üslubda, canlı danışıq dilində, şifahi xalq yaradıcılığının müxtəlif janrlarında keçmiş hərəkətlərin canlandırılmasını aşağıdakı nümunələrdən görmək olar:

*Qışlaqdan qayıdanda at, inək, təzəcə doğulmuş buzov və Nəbi kişi qışın göz qamaşdıran, göz çıxardan ayazlı çağında çovğuna* ***düşürlər****. Çovğunla vuruşa-vuruşa, ölüm-zülüm gəlib evə* ***çatırlar****. Nəbi kişi nə əllərini, nə də ayaqlarını* ***hiss eləmir*** *– hamısını don vurmuşdu* (S. Səxavət); *Sadıq quşu* ***buraxır****. Quş evin içində yeddi dəfə dövrə vurandan sonra gəlib Sadığın sinəsinə* ***qonur****, xeyli onunla üzbəüz* ***dayanır*** *və birdən dimdiyi ilə onun burnuna* ***vurur****, Sadıq da yuxudan* ***ayılır****. Yuxu gördüyünə inansa da, çox* ***təəssüflənir*** (S. Səxavət), *Bir kişinin bağına  bir molla, bir də bir öküz* ***girir****. Oğlu qaçıb atasına* ***xəbər verir****. Atası tez* ***deyir****: - Oğul, qaç, mollanı qov, öküzə dəymə!* (Lətifə) *Dərviş* ***görür*** *ki, bir kişi tirmə* ***toxuyur*** *və toxuduqca öz-özünə* ***deyir****: «Ya rəbb, məni dilimin bəlasından saxla!» Dərviş toxucunun sözündən heyrətlənib bir neçə gün onu* ***güdür*** (Lətifə). *Padşah əhvalatı ona söyləyərək, oğlu ilə bərabər öz çadırına* ***qayıdır****. Bir az sonra köçüb şəhərə* ***gedirlər****. Bu əhvalatdan bir neçə gün sonra, padşahın arvadı bərk* ***naxoşluyur****. Oğlunu yanına çağırıb, ona belə bir* ***vəsiyyət edir*** («Taxta qaşıq» nağılından).

Elmi üslubda keçmişdə icra edilmiş iş və ya hərəkətin, mövcud olmuş halın indiki zaman forması ilə verilməsini aşağakı nümunələrdə görmək olar:

*Görkəmli Azərbaycan dilçisi mərhum professor Ə.Dəmirçizadə ədəbi dil sahəsindəki mülahizələri ümumiləşdirmişdir. O* ***yazır****: «Bəziləri ədəbi dil dedikdə, ancaq yazılı dili*

*anlamışlar...»*[1]. *«Feli söz birləşmələrinin tipoloji təhlili» adlanan I fəsildə söz birləşmələrinin, o cümlədən feli birləşmələrin tədqiqi tarixi* ***şərh edilir****. .... fəsildə ... asılı komponentlərin əsas növləri* ***üzə çıxarılır****, ... birləşmələrin tərəfləri arasında semantik münasibətlərin başlıca tipləri* ***müəyyən edilir***[2].

Əldə olan faktik material fel formalarının keçmiş zaman sferasına transpozisiyasının Azərbaycan dili üçün daha tipik hadisə olmasını qeyd etməyə əsas verir. Fel formalarının keçmiş sferasına keçməsi hadisəsi qeyri-qəti gələcək zaman formasında da müşahidə olunur. Lakin qeyri-qəti gələcək zamanın keçmiş zaman yerində işlənməsi halları indiki zamanın keçmiş yerində işlənməsi halları ilə müqayisədə çox azdır. Bunu aparımış hesablamalar da təsdiq edir. Məsələn, indiki zamanın keçmiş yerində işlənməsi 3,43 %, qeyri-qəti gələcək zamanın işlənməsi isə 1,34 % təşkil edir. Keçmiş zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri arasında indiki zaman keçmiş zaman mənasında digər komponentlərin birlikdə götürülmüş cəmi qədər işlənir. Mikrosahənin ikinci dərəcəli komponentlərinin keçmiş yerində işlənməsi ümumilikdə mikrosahə üzrə 7,48 % təşkil edirsə, bunun 3,43 % indiki zamanın hesabına olur.

Qeyri-qəti gələcək zamanın keçmiş zaman sferasına transpozisiyasına dair aşağıdakı misalları göstərmək olar:

*Bir gün kişi vurub* ***ova çıxar****, onda qarğadan at* ***səksənər****, tərlan havaya* ***qalxar****, kişinin ayağı üzəngidə* ***qalar*** (S. Rəhimov). *Padşah oğlunu çox istədiyindən, tez-tez onu* ***yoxlar*** («Azərbaycan nağılları»).

Qarşılaşdırdığımız dillərdə keçmiş zaman mikrosahəsində nisbi zaman mənası olan vahidləri də müşahidə edirik. Bu vahidlərin zaman nisbəti kontekstual mənadan irəli gəlir və

---

[1] Axundov A. Dil və mədəniyyət. Bakı, Yazıçı, 1992, s. 5.
[2] Əliyeva G.A. Feli birləşmələrin tipoloji-semantik təhlili. NDA, Bakı, 2006, s. 23

nisbi xarakter daşıyır. İngilis dilində *Participle* (*I*, *II*), *Infinitive* və *Gerund* aiddir. Azərbaycan dilində isə feli sifət və feli bağlama həmin vahidlərdən hesab olunur.

Azərbaycan dilində feli sifətdə olan hərəkət mənası onu bu və ya digər zamanla bağlayır. Bu söz kateqoriyası özündə zaman mənasını saxladığına görə təyin olunanının müəyyən zamanla bağlı olan əlamətini, keyfiyyətini, vəziyyətini və s. əlamətlərini bildirir. Feli bağlamalar isə cümlədə əsas xəbərlə ifadə olunan hərəkətə qədər baş verən işin qeyri-müəyyən icra zamanını bildirir.

Müəyyən şəkilçilər vasitəsilə əmələ gəlib məna etibarilə keçmiş zamanla bağlı olan feli sifətlər və feli bağlamalar müstəqil zaman ifadə etməsə də, əsas xəbərin zaman mənasını dəqiqləşdirir və ondan asılı olur. Zaman konteksti etibarilə həmin sözlər keçmişi bildirir. Məsələn:

*O* ***partlamış*** *öd kisəsilə Süsənbər düz on gün yorğan-döşəkdə əzab çəkdi* (Ə.Əylisli). *Fatimə qəfil* ***ağarmış*** *çöhrəsindən rəfiqəsinin keçirdiyi həyəcanı hiss edərək tarzənə dedi* (İ.Əfəndiyev). *Zəncirdən* ***açılmış*** *itlər də ət iyini duymuşdular* (İ.Şıxlı). *Gülsənubər bir tərəfdən daşlara* ***dəyib əzilmiş*** *ayaqlarının ağrısından, digər tərəfdən isə əsəbilikdən yata bilmirdi* (İ.Əfəndiyev). *At da sahibi kimi* ***qəzəblənib*** *onu tapdaladı* (İ.Şıxlı). *Evin qapı-pəncərəsini, döşəmənin* ***çürümüş*** *taxtalarını* ***dəyişib*** *otaqları sahmana saldılar* (S.Əhmədli).

Misallardakı feli sifət və bağlamaların keçmiş zaman kontekstində işlənməsi göz önündədir. Bu tipli misalların kəmiyyət cəhətdən analizi göstərir ki, keçmiş zaman mikrosahəsi üzrə feli sifət və feli bağlamaların funksionallığı müvafiq olaraq 1,23 % və 1,47 % faiz təşkil edir.

Məlumdur ki, ingilis dilində *Infinitive* başlanğıc fel paradiqması forması olub hərəkətin adını bildirir. Lakin ingilis dilində *perfekt infinitiv* (bitmiş məsdər) adlanan xüsusi forma da

vardır. Bu forma öncəgəlmə bildirir. Keçmiş zaman mənasında həm sadə, həm də *perfekt infinitive* daha çox modal fellərin, eləcə də infinitivdən əvvəldə gəlməklə hərəkətin fonunu yaratmaq funksiyasını daşıyan *seem, appear* tipli fellərin müşayiəti ilə işlənir. Məsələn:

*The voyage that followed must have reached its normal successful end* (Greene). *Sorry to steal in like this. Your gate out there's locked* (Greene). *That last was the label that seemed to have been lurking for hours when it finally came to him* (Fowles).

Bəzən müstəqil infinitiv cümlələrə rast gəlmək olur. Onlar əsasən nida cümləri olub keçmişdə olan hərəkəti təsvir edir: ***To die*** *in his sleep like this* (Symons). Bu tip işlənmə ingilis dilində cerund adlanan söz kateqoriyasına da xasdır. Belə hallarda cerund funksional cəhətdən məsdərlə və ya feli isimlə müqayisə edilir: ***Lying*** *awake for hours*. Keçmiş zaman mikrosahəsində infinitiv və cerundun statistik analizi göstərir ki, infinitiv cerunddan daha işləkdir. Belə ki, mikrosahə üzrə ümumilikdə infinitiv 1,37 %, cerund isə 0,2 % işlənir.

İngilis dilində *Participle I* mənasına görə sifətə və zərfə yaxındır və əşya və ya hərəkətin əlamətini bildirir. *Participle I* və *II* felin təsriflənməyən formaları arasında ən çox kommunikativ yük daşıyan kateqoriyadır. Bu formaların kontekstdə keçmiş zaman mənasında işlənməsi halları ümumilikdə 1,74 % təşkil edir. *Participle I* və *II* formalarının işlənməsinə aşağıdakı nümunələri göstərmək olar:

*There was no sight of the room* ***having been occupied*** (A.Cristie). *I suggested a game of tennis before supper and, Cynthia* ***agreeing****, I ran upstairs to fetch my racquet* (A.Cristie). *Clogged and dulled by that* ***everapproaching*** *mist a voice had spoken to him* (Hardy).

İngilis dilində felin vasitəli şəkillərinin (*Subjunctive*) ümumi mənasını hərəkətin gümanlılığı, hipotetikliyi təşkil

edir. Felin vasitəli şəkilləri ilə zaman mənalarının ifadə edilməsi temporallıq və modallıq kateqoriyalarının sıx əlaqəli olduğunu göstərir[1]. İngilis dilində felin vasitəli şəkillərinin müxtəlif formalarının keçmiş zaman kontekstində işlənmə halları ümumilikdə 0,6 % təşkil edir. Aşağıdakı misallar bu cəhətdən xarakterikdir:

*It should be mine now by rights, if my father had only made a decent will* (A.Cristie). *He might have done a lot of damage if he pulled it of* (J. Galsworthy). *What more could she have told us, if she had had time?* (S.Maugham). *If you had been this way a few months ago, it would have been different* (J.London). *If Charles had been with me, things would have been different* (Braine). *If I'd only waited, perhaps it would have gone all right* (S.Maugham).

Qarşılaşdırdığımız dillərdə keçmiş zaman kontekstində işlənən ikinci dərəcəli morfoloji komponentlərin funksionallıq səviyyəsində müəyyən fərqlərin olduğu aşkarlanmışdır. Başlıca fərq kimi ikinci dərəcəli komponentlərin nomenklaturasını və mikrosahə üzrə ümumi funksionallığı göstərmək olar. Məsələn, Azərbaycan və ingilis dillərində keçmiş zaman mikrosahəsinin ikinci dərəcəli komponentlərinin nomenklaturası 4 : 7 nisbətində müəyyənləşdirilmişdir. İkinci dərəcəli komponentlərin mikrosahə üzrə ümumi çəkisi Azərbaycan dilində 7,48 %, ingilis dilində isə 16,76 % təşkil etmişdir.

### 4.2. İndiki zaman mikrosahəsi

İndiki zaman bütün dillərdə diqqəti əsas zaman anlayışı kimi cəlb edir. İnsanın təbiətə, digər insanlara olan münasibəti, insanın psixikası ilə bağlı spesifik xüsusiyyətlər daha çox

---

[1] Cahangirov F. İngilis və Azərbaycan dillərində modallığın struktur-semantik tədqiqi. Bakı, Elm, 2005, s. 139-162.

indiki zamanla bağlıdır. Məhz buna görə də fikrin daxili məntiqi təşkili prosesində indiki zaman birinci dərəcəli əhəmiyyət kəsb edir.

İndiki zaman anlayışı nisbi anlayışdır. İfadə formasından asılı olmayaraq bu zaman forması təkcə hazırda baş verən iş və hərəkətin icrasının, mövcud halın bildirilməsi vasitəsi deyildir. İndiki zaman forması ilə ümumi zaman anlayışına daxil olan zaman çalarları da ifadə edilə bilər. İndiki zaman anlayışı və onun ifadəsinin nisbi xarakter daşıdığını nəzərə alan tədqiqatçılar onun ifadə xüsusiyyətləri ilə bağlı apardıqları araşdırmaların xarakterinə uyğun olaraq müəyyən fikir və mülahizələr də söyləmişlər. A.Axundov göstərir ki, qrammatik indiki zaman başlanmış, lakin hələ bitməmiş və sona çatmamış hal və ya hərəkəti ifadə edir. Məktəb qrammatikalarında, hətta elmi qrammatikalarda da felin indiki zamanından danışarkən onu danışıq vaxtında davam edən hal və hərəkətin ifadəsi kimi izah edirlər. Şübhəsiz, bu, indiki zamanın çox ümumi izahıdır. Onun elmi izahı da bir sıra ümumi nəzəri cəhətləri qeyd etməyi tələb edir[1].

Qarşılaşdırdığımız dilllərdə indiki zaman mikrosahəsinin morfoloji komponentlərinin müqayisəli təhlili, onlarda indiki zaman mikrosahəsini təmsil edən qrammatik fel formalarının vahid sistem şəklində təqdim edilməsi mühüm əhəmiyyət kəsb edir. Biz vahid semantik invariant əlamət əsasında indiki zaman mikrosahəsinin morfoloji komponentlərinin məcmusunu keçmiş zaman mikrosahəsini təsvir etdiyimiz modelə uyğun olaraq təqdim etmək fikrindəyik. Həmin model üzrə əvvəlcə indiki zaman mikrosahəsinin əsas morfoloji komponentləri, sonra isə ikinci dərəcəli morfoloji komponentləri təhlil edilir.

---

[1] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 69

### 4.2.1. İndiki zaman mikrosahəsinin əsas morfoloji komponentləri

Azərbaycan və ingilis dillərində indiki zaman mikrosahəsinin nüvəsini indiki zaman anlayışının əsas morfoloji ifadə vasitələri təşkil edir. İngilis dilində mikrosahənin nüvəsində indiki zamanın dörd qrammemi dayanır: *The Present Indefinite, The Present Continuous, The Present Perfect, The Present Perfect Continuous*. Bu dörd formanın daşıdığı ümumi funksional yük mikrosahə üzrə 81,74 % təşkil edir. Azərbaycan dilində isə mikrosahənin nüvəsini *-(y)ır*$^4$ şəkilçisi ilə düzələn indiki zaman təmsil edir. Azərbaycan dilində indiki zaman mikrosahəsinin əsas morfoloji komponentinin funksionallığı ümumilikdə 83,30 % təşkil edir.

Azərbaycan dilində təkcə indiki zaman forması ingilis dilindəki dörd zaman formasının ifadə etdiyi bütün semantik çalarları ifadə etmək iqtidarındadır. Müqayisə üçün nümunələrə diqqət yetirək:

*Classes at the University* ***begin*** *at one p.m.* (*The Present Indefinite*) – *Universitetdə dərslər gündüz saat 1-də* ***başlanır***.

*They* ***are*** *constantly* ***thinking*** *of you* (E.Voynich) (*The Present Continuous*) – *Onlar daim sizin haqqınızda* ***düşünürlər***.

*We'****ve known*** *each other since we were children* (S. Maugham) (*The Present Perfect*) – *Biz bir-birimizi uşaqlıqdan* ***tanıyırıq***.

*I'****ve been waiting*** *here for half an hour* (E.Voynich) (*The Present Perfect Continuous*) – *Yarım saatdır burada sizi* ***gözləyirəm***.

İngilis dilində əsas morfoloji komponent olan *The Present Indefinite* formasının semantik potensialı ilə Azərbaycan dilində əsas və yeganə morfoloji komponent olan indiki zaman (*-ır*$^4$) formasının semantik potensialının qarşılaşdırılması gös-

tərir ki, onların funksionallığında elə bir ciddi keyfiyyət müxtəlifliyi müşahidə olunmur. Hər iki dildə üstünlük təşkil edən semantik xüsusiyyət kimi elə bir çalar çıxış edir ki, o, hərəkətin özünü deyil, daha çox zaman məhdudiyyətləri ilə bağlı olmayan münasibəti müəyyən edir, yəni subyektin hərəkətini səciyyələndirir. Məhz bu səbəbdən səciyyələndirmə, keyfiyyət əlamətinin üstünlük qazanması hesabına hər iki dildə indiki zaman formalarının (*The Present Indefinite* və (*-ır*$^4$) şəkilçili indiki zaman nəzərdə tutulur) əsas kateqorial mənası üçün «ümumi temporallıq» xarakterikdir:

*He **knows** two languages. – O, iki dil **bilir**. She **plays** the piano and **speaks** fluent English. – O, royal **çalır** və ingiliscə sərbəst **danışır**.*

İngilis dilində sadə indiki zaman (*The Present Indefinite*) formasının yüksək semantik potensialı ilə əlaqədar olaraq onun əsas ümumi kateqorial mənası ilə digər ayrı-ayrı məna çalarları arasında fərq və ziddiyyətlərin olması müşahidə olunur. Sadə indiki zamana xas olan mənalar mütəhərrikdir. Bu formanın funksional hüdudlarının müəyyənləşdirilməsində ortaya çıxan çətinliklər, hər şeydən öncə, onun daim dəyişən leksik dolğunlaşma əhatəsi və distribusiyası ilə əlaqədardır. Məlumdur ki, *The Present Indefinite* formasına əhatə dairəsinə və müddətinə görə müxtəlif iş, hal və ya hərəkəti ifadə etmək xasdır. Bunu nəzərə alan tədqiqatçılar *The Present Indefinite* formasının əsas mənalarını müxtəlif şəkildə qruplaşdırırlar.

K.V.Filina *The Present Indefinite* formasının əsas mənasını onun leksik determinantlarla bağlı olan ikinci dərəcəli, kontekstual mənalarından fərqləndirir. Onun fikrincə, *The Present Indefinite* forması üçün əsas mənalar aşağıdakılardır: 1) keyfiyyət bildirmə (kvalitativ): *He dances well. – O, yaxşı rəqs edir*; 2) ümumiləşdirmə (panxronik): *Money doesn't grow on trees. – Pul ağacda bitmir*; 3) adət halını almış hərəkəti ifadəetmə (uzual): *He gets up at seven o'clock. – O, saat*

*yeddidə durur*. Müəllif ikinci dərəcəli mənaları indiki konkret, indiki geniş, indiki perfekt, indiki futural və indiki preterit olmaqla beş növə ayırır[1].

Z.Y.Turayeva indiki zamanı semantik cəhətdən aşağıdakı növlərə bölür: aktual indiki zaman, dəfəli (кратное) indiki zaman və potensial indiki zaman[2].

A.V.Bondarko indiki zamanın təsnifatında «abstrakt indiki zaman»ı xüsusi qeyd edir və onun əsas əlaməti kimi hərəkətin zaman daxilində lokallaşmamasını göstərir[3].

Göryndüyü kimi, indiki zamanın əsas mənalarının müəyyənləşdirilməsində müxtəlif cəhətlər nəzərə alınır. Biz ingilis dilində indiki zaman mikrosahəsinin əsas morfoloji dominantı olan *The Present Indefinite* formasının funksional-semantik potensialının ortaya çıxarılmasında onun felin qrammatik mənası ilə leksik əhatəsininin xarakterini nəzərə alırıq.

Bizim müşahidələrimizə görə, *The Present Indefinite* forması üçün ən məhsuldar model *be* feli ilə olan modeldir (*be + N* (*Adj*)):

*"No. Gargery is your master now* (Ch. Dickens). *My son is mad* (M.Twain). *"Well! Joe is a dear good fellow* (Ch. Dickens). *He is a monarch and...* (J.Cooper). *"It is a quaint and marvellous thought!* (M.Twain).

Bu tip cümlələr *The Present Indefinite* formasının işləndiyi halların təxminən 20,26 %-ni təşkil edir. İngilis dilində *be* «olmaq» feli üçün invariant semantik mahiyyət varlığın (substansiyanın) zaman daxilində mövcudluğunu və varlıqlar

---

[1] Филина К.В. Исследование презенса английского глагола. (В сопоставлении с презенсом рус. глагола): Автореф. дис. ... канд. филол. наук. М., 1975.

[2] Тураева З. Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М., «Высшая школа», 1978.

[3] Бондарко А.В. Вид и время русского глагола (значение и употребление). М.: "Просвещение", 1971.

arasındakı münasibətləri bildirməkdir. *Be* «olmaq» feli varlığın zaman daxilində mövcudluğunu bəzi hallarda ümumiyyətlə onun keyfiyyət səciyyəsinə toxunmadan göstərir, yaxud bu mövcudluğu həmin varlığın keyfiyyət səciyyəsi ilə bərabər bildirir. Məsələn:

*My uncle is a captain* (O.Henry). *"Gemma, your father is a Protestant."* (E.Voynich). *Well, she is a daring little rider* (M.Twain). *Her husband is a quiet, easy-going fellow* (J.London).

Araşdırdığımız nümunələrin təxminən 13 %-ində *The Present Indefinite* forması *have* feli ilə işlənmişdir (*have + N*). Bu tip nümunələrin müəyyən qismi sahiblik və ya malikolma ifadə edir, digər hissəsi isə təsviri səciyyə daşıyır:

*He has a watch and a chain and ...* (Ch. Dickens). *"I have a sister there – a married sister."* (J.London). *But he has a historical mind and a good memory…* (M. Twain). *Have you any pennies?* (B.Shaw). *She has her mother's charm and grace and good heart and sense of justice, ...* (M.Twain). *She has blue eyes* (A.Cristie).

*The Present Indefinite* formasının işləndiyi digər hallar isə xəbəri fellərlə ifadə olunan cümlələrdir. Bu cümlələrdə əqli qabiliyyət, hiss və qavrayış, subyektiv qiymətləndirmə bildirən fellər daha işləkdir:

*I hate going out in the carriage* (Ch. Bronte). *I know nothing of days of the week ... I know nothing of weeks of the year ...* (Ch. Dickens). *'I don't understand,' retorted Clemency, shaking her head vaguely* (Ch. Dickens). *"I see only one difficulty – human nature" murmured Hilary* (J.Galsworthy).

*The Present Indefinite* forması hərəkət, iş, mərhələ bildirən fellərlə də geniş şəkildə işlənir. Məsələn:

*But the moment he begins to use his head, and from the labourer rises to the artisan, she begins to raise his wages*

(Jerome K.Jerome). *"We dance and sing about the Maypole in Cheapside; we play in the sand* (M.Twain).

Beləliklə, ingilis dilində *The Present Indefinite* formasının ifadə etdiyi semantik müxtəlifliklər arasında subyekti keyfiyyət baxımından səciyyələndirən çalar daha üstündür. Bu çaların özündə iki əsas məna xüsusiyyətini ayırmaq mümkündür. Birincisi, bu forma subyektin hərəkət və ya işi icra etməkdə bacarıq və qabiliyyətini bildirir:

*You speak my dialect like a native, but you are not a Mexican Plug, you are a gentleman, I can see that; and educated, of course."* (M.Twain). *You look like a man who daydreams* (Greene).

İkincisi, *The Present Indefinite* forması subyekti səciyyələndirən daimi xüsusiyyəti bildirir. Məsələn:

*She is asking if you paint abstracts* (J.London). *I find all boys utterly intractable, I don't know why it is* (O.Henry). *He sleeps soundly.*

Belə mənalar müəyyən mənada felin leksik əhatəsi ilə də bağlı olur və çox zaman onların mənası «mövcudluq», «eqzistensiallıq» seması ilə müəyyən edilir. Bu ən çox *have* və *be* fellərinin iştirak etdiyi modellərə aiddir. Belə modellər, sadəcə, indiki zamanda müəyyən hal və vəziyyətin mövcud olduğunu göstərir, amma həmin hal və vəziyyətin davametmə dərəcəsi barədə heç bir əlavə məlumat vermir. Görünür, məhz buna görə *The Present Indefinite* forması öz zaman mənasını keçmiş və gələcək hesabına xeyli dərəcədə genişləndirməklə, predmet və ya subyektə xas olan keyfiyyəti və xüsusiyyəti də ifadə edir.

*The Present Indefinite* formasının əqli bacarıq, qavrayış, subyektiv və emosional qiymətləndirmə bildirən fellərlə (*feel, think, appreciate, like, hate, detest, love, know* və s.) işləndiyi məqamlarda subyekt və ya predmetin keyfiyyət əlaməti daha aydın şəkildə nəzərə çarpır. Məsələn:

*He knows three foreign languages. He detests working. We don't appreciate new fashion.*

Keyfiyyəti bildirən semantik əlamət *The Present Indefinite* formasının hərəkət felləri ilə işləndiyi aşağıdakı tip cümlələrdə də aydın görünür:

*She plays the piano and speaks fluent French. My son plays football, and swims very well.*

Hərəkətin zaman daxilində lokallaşmamasını göstərən əlamətlərdən biri də *The Present Indefinite* formasının işləndiyi elə hallardır ki, burada daimi qanunauyğunluq təşkil edən hadisə və proseslərdən söhbət gedir. Söhbət bütün dövrlər üçün eyni və əbədi həqiqətlər adlandırılan hərəkət, proses və münasibətlərdən gedir. Bunu aşağıdakı nümunələr də göstərir:

*The sun rises in the East and sets in the west. Spiders have eight legs. A man feels thirsty* (Jerome K.Jerome). *Light travels more quickly than sound. Water boils at 100° Centigrade.*

Nümunələrdə *rises, sets, have, feels, travels, boils* felləri ilə ifadə olunmuş hal və hərəkətlərin bütün dövrlər üçün doğru olduğu şübhəsizdir, çünki onlar statik və ya permanent münasibətləri əks etdirir.

Bu xüsusiyyətlərlər Azərbaycan dilində indiki zaman mikrosahəsinin əsas morfoloji komponenti olan -*(y)ır*$^4$ şəkilçili indiki zaman formasının işlənməsində də müşahidə olunur. A.Axundov bunları çox geniş tədqiq etmişdir[1]. O, Azərbaycan dilində felin indiki zamanının məzmun planında iki cəhətini xüsusi fərqləndirir: «1. felin indiki zamanı danışıq vaxtı ilə bilavasitə əlaqədardır. 2. felin indiki zamanı danışıq vaxtı ilə bilavasitə əlaqədar deyil. ... Bunlardan ... ikincisi isə subyektə aid olan ümumi hal və ya hərəkəti ifadə edir»[2].

---

[1] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 69-85.
[2] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 73.

Müəllif danışıq vaxtı ilə bilavasitə əlaqədar olan indiki zamanın daxilində aşağıdakı cəhətləri qeyd edir: a) hal və ya hərəkət danışıq vaxtı ilə tam uyğunluq təşkil edir; b) hal və ya hərəkət danışıq vaxtı ilə tam uyğunluq təşkil etməklə bərabər, subyektin ümumi xüsusiyyətini əks etdirir; c) danışıq vaxtı ilə tam uyğunluq təşkil edən fel eyni zamanda uzun dövrlərə, həm keçmiş, həm də müəyyən dərəcədə gələcək zamana aid olan ümumi halları ifadə edir[1].

A.Axundov danışıq vaxtı ilə bilavasitə əlaqədar olmayan indiki zamanın aşağıdakı cəhətlərini qeyd edir: a) subyektə aid peşə və ya sənətlə, habelə vərdişlə əlaqədar olan ümumi hal və hərəkətlər; b) subyektin sürəkli xarakterdə olan vaxtaşırı hal və ya hərəkətləri; c) yalnız müəyyən zaman ərzində, müəyyən indiki zaman hüdudunda fəaliyyət göstərən hal və ya hərəkətlər; ç) danışılan vaxtdan əvvəl olmuş əhvalat və ya hadisənin hekayəsində işlənir; d) təbiət və ya müəyyən şəraitin təsvirində işlənir; e) hökm ifadə edən hərəkətlər; ə) artıq başlanmış, lakin hələ bitməmiş hal və hərəkətlər; f) danışıq vaxtı üçün real olmayan, lakin hadisələrin məntiqi nəticəsi olan hal və ya hərəkətlər – potensial xarakter daşıyan hərəkətlər[2].

Azərbaycan dilçiliyində felin indiki zamanına dair aparılan tədqiqatları[3] nəzərdən keçirdikdə, bu zaman formasının məna xüsusiyyətləri ilə bağlı olaraq, onun funksional-semantik təsnifatına bir daha diqqət yetirmək ehtiyacı ortaya çıxır. Belə bir təsnifat indiki zamana sahə yanaşması, eləcə də müxtəlifsistemli iki dilin materiallarının qarşılaşdırılması nəticəsində daha da konkretləşir.

---

[1] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 76.

[2] Yenə orada, s. 77-85.

[3] Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980; Cəfərova B. İngilis və Azərbaycan dillərində felin zamanlar sistemi.Bakı, 2004; Sadıqov R. Müxtəlifsistemli dillərdə obyektiv və qrammatik zaman əlaqələri, Bakı, 2004.

Azərbaycan dilində *-(y)ır*[4] şəkilçili indiki zamanın funksional baxımdan aşağıdakı növlərini göstərmək olar:

1. Əsl indiki zaman. Bu halda indiki zamanda işlənən felin ifadə etdiyi hal və ya hərəkət nitq momenti ilə üst-üstə düşür, başqa sözlə, burada qrammatik indiki zaman obyektiv indiki zamana uyğun gəlir.

***Deyirsən**, Tiflisə gedib, hə?.. Adam ol, ə, vicdanın olsun!.. Axı **görürəm** ki, yalan **deyirsən**, gözlərinin içindən **görürəm**!* (Ə.Əylisli). *-A-a-a! ... Nolub sənə! Noldu belə?! Niyə **ağlayırsan**?* (Elçin). - *Vur, niyə durubsan? Əlin-ayağın niyə **titrəyir**, arvadı öldürməyə nə var ki? Vur!* (İ.Şıxlı).

Nümunələrdəki *deyirsən, görürəm, ağlayırsan, titrəyir* fellərinin ifadə etdiyi hərəkət birbaşa nitq momenti ilə üst-üstə düşür, yəni hərəkətin icra zamanı ilə onun haqqında verilən məlumat eyni vaxta təsadüf edir. Bu növ indiki zaman daha çox dialoqlarda işlənir.

Nitq momenti ilə üyğun gələn indiki zaman ümumi əlamətlər də ifadə edə bilir. Belə əlamətlər məzmun etibarilə hissi qavrayış, əqli prosesləri bildirən fellərlə ifadə olunur. Onlara *sevmək, istəmək, tanımaq, bilmək, başa düşmək, anlamaq, dərk etmək, xoşlamaq, xatırlamaq, nifrət etmək* kimi felləri misal göstərmək olar: «Belə fellərin ifadə etdiyi hal və ya hərəkət müəyyən bir hadisə və ya əşyaya insanın əqli və hissi münasibətlərini əks etdirdiyindən onlar danışan tərəfindən istər kinetik, istərsə də potensial cəhətdən, yəni danışan istər onlar haqqında məlumat verərkən, istərsə də verməyərkən icra olunur»[1]. Məsələn:

*Demokratlar demokratiyaya ardıcıl dəstək verilməsinin zəruriliyini **başa düşürlər*** («Ayna» qəzeti, 13.11.2007). *Allahın bizə vəhy elədiyi bu dərin iztirabların dilini **başa düşmürəm.** Onun nəhayətinə çatmaq **istəyirəm*** (İ. Əfəndiyev). –

---

[1] Axundov A. Felin zamanları. Bakı, 1961, s. 75.

*Səfəvi sərkərdələrindən də birinin adı Avdı olub, bilirsiniz? – Düzü, tariximizi o qədər də yaxşı* ***bilmirəm*** (S.Rüstəmxanlı). *Elə* ***fikirləşirlər*** *ki, hər yerdə axırıncı sözü onlar deməlidi – yekun sözünü ...* ***İstəyirlər*** *ki, ailənin-uşağın, dostun məsuliyyəti yalnız onların boynuna düşsün –* ***xoşlayırlar*** (S.Səxavət).

2. Geniş indiki zaman. Bu növ indiki zamanda işlənən fellə ifadə olunan hal və ya hərəkətin nitq momenti ilə əlaqəsi müəyyənləşməsə də, hər halda onunla əlaqəsi vardır. Qeyd etmək lazımdır ki, geniş indiki zaman obyektiv keçmiş və gələcək zamanların müəyyən hissəsini əhatə edə bilir. Nümunələrə diqqət yetirək:

*–Bəs siz harda* ***işləyirsiniz****? – Universitetdə* ***işləyirəm*** (Elçin) *... elmi idarədə* ***işləyirəm*** (Anar). *Dürdanə universitetdə* ***oxuyur****, ...* (Elçin).

Bu cümlələrdəki *işləyirəm, işləyirsiniz, oxuyur* fellərinin nitq momenti ilə əlaqəsi müəyyənləşməmişdir. *Universitetdə* ***işləyirəm*** nitq momentində də ola bilər, yaxud bu gün, bu həftə və ya ümumiyyətlə, peşə fəaliyyəti ilə bağlı ola bilər, eləcə də peşəsinə uyğun olaraq həmin şəxs orada işləyir, amma hazırda işləmir, məsələn, məzuniyyətdədir. Eyni hal *oxuyur* hərəkətini icra edən subyekt (*Dürdanə*) üçün də mümkündür.

İndiki zamanın bu növü məzmun cəhətdən şəxsin peşə və sənəti ilə, subyekt üçün adət, vərdiş və s. ilə əlaqədar olan ümumi hal və ya hərəkətləri bildirmək üçün istifadə edilir. İndiki zamanın bu növündə işlənən fellər leksik məna etibarilə müxtəlif qruplara daxil olsalar da, onları ümumi hal və ya hərəkətləri ifadəetmə xüsusiyyəti birləşdirir.

3. Mücərrəd indiki zaman. Bu növ indiki zamanda işlənən fellə ifadə olunan hərəkət bütün zaman oxu boyu yayılır, çünki burada keçmiş zaman və gələcək zaman yoxdur. Burada nitq momenti ilə birbaşa əlaqə ola da, olmaya da bilər. Nümunələrə diqqət yetirək:

*Günəş qərbdə **batır**. Su yüz dərəcədə **qaynayır**. Avtobusda, tramvayda sərnişinlər bir–biriylə **ünsiyyətdə olur**, **danışır**, **zarafatlaşır**...* (Anar). *Sən torpaqla torpağın dilində **danışırsan**, torpaq da səninlə sənin dilində **danışır**. Sən torpağa inandığın kimi, torpaq da sənə inanmağa **başlayır** və qüdrətini, gücünü sənə **bağışlayır**, sənə **etibar edir**. Sən də torpaq kimi güclü-qüdrətli **olursan**. Sən güclü olanda hamı səni **tanıyır**, sənə **hörmət edir**, səninlə **hesablaşır** və sənə ümud yeri kimi **baxır** (S.Səxavət) Palıdın kökləri, rişələri on-on beş il torpağın dibinə **gedir**, sonra **boy atır**, beş yüz il, min il, ondan da artıq **yaşayır*** (Anar). *Beyin sönən kimi heç bir ruh-filan da **qalmır**, heç hara da uçub **getmir**, **qayıtmır**.* (Anar)

Nümunələrdə qalın kursivlə verilən fellərin ifadə etdiyi hal və hərəkətlər qrammatik indiki zamanda olsa da, bütün zamanları əhatə edir.

Bütün bu göstərilən cəhətlər fellərin leksik mənalarından asılı olaraq ortaya çıxır. Bəllidir ki, fellər leksik mənası etibarilə hərəkət, statiklik və dinamiklik ifadə edən qruplara bölünür. Bu qrupların özləri də müəyyən yarımqruplara bölünür. Bölgülərin əsasında müxtəlif meyarlar dayana bilər. Məsələn, hərəkət bildirən felləri qısamüddətli, uzunmüddətli hərəkətləri ifadəetmə, birdəfəli, çoxdəfəli hərəkəti bildirmə, hərəkəti və ya prosesi bildirmə baxımından təsnif etmək mümkündür. Lakin nəzərə almaq lazımdır ki, bölgülər şərti xarakter daşıyır. Qruplar və yarımqruplar arasında dəqiq hüdudlar müəyyənləşdirmək çətindir və eyni bir fel eyni zamanda bir və ya bir neçə qrupa aid edilə bilər.

Göründüyü kimi, Azərbaycan dilində indiki zaman mikrosahəsinin əsas morfoloji komponenti olan *-(y)ır*$^4$ şəkilçili forma ingilis dilindəki əsas morfoloji komponent olan *The Present Indefinite* forması ilə oxşarlıq nümayiş etdirir.

Azərbaycan və ingilis dillərində indiki zaman mikrosahəsinin əsas morfoloji komponentlərinin funksional baxımından

qarşılaşdırılması da maraq kəsb edir. İngilis dilində mikrosahənin dörd əsas morfoloji komponentin (*The Present Indefinite, The Present Continuous, The Present Perfect, The Present Perfect Continuous*) daşıdığı kommunikativ yük ilə Azərbaycan dilindəki yeganə morfoloji komponentin (-*(y)ır*[4] şəkilçili forma) kommunikativ yükü təxminən eynidir. İngilis dilində mikrosahə üzrə əsas morfoloji komponentlərin ümumi çəkisi 81,74 %, Azərbaycan dilində isə 83,30 % təşkil edir.

İngilis dilində dörd əsas morfoloji komponent (*The Present Indefinite, The Present Continuous, The Present Perfect, The Present Perfect Continuous*) arasındakı nisbət *The Present Indefinite* formasının daha çox kommunikativ yük daşıdığını göstərir. Bu formanın mikrosahə üzrə çəkisi ümumilikdə 57,49 % təşkil edir. *The Present Indefinite* forması həm bədii üslubda (60,48 %), həm də qəzet dilində (44,06 %) yüksək işləklik dərəcəsinə malikdir.

Əsas morfoloji komponentlər arasında *The Present Perfect* forması kommunikativ yük daşımaq baxımından ikinci yeri tutur. Bu formanın mikrosahə üzrə işləkliyi 11,62 %-dir. Onun işlənmə tezliyi bədii üslubda 7,94 %, qəzet dilində 28,13 % təşkil edir.

*The Present Continuous* forması kommunikativlik baxımından üçüncü yeri tutur. Mikrosahə üzrə işləkliyi 10,93 % təşkil edən bu formanın işlənmə tezliyi bədii üslubda 11,94 %, qəzet dilində 6,86 % -dir.

Belə bir cəhətə diqqət yetirmək lazımdır ki, mikrosahə üzrə ikinci yeri tutan *The Present Perfect* formasının bədii üslubda işlənmə dərəcəsi *The Present Continuous* formasından 2 dəfəyə yaxın az olsa da, qəzet dilində bu, 4 dəfədən də çoxdur.

Mikrosahə üzrə ən az işləkliyi *The Present Perfect Continuous* forması göstərir – 1,7 %. Bu forma bədii üslubda 1,62 %, qəzet dilində isə 2,07 % işlənir.

Azərbaycan dilində *-(y)ır*[4] şəkilçili indiki zaman forması həm bədii üslubda, həm də qəzet dilində geniş şəkildə işlənir. Bu formanın işləklik səviyyəsi bədii üslubda 83,47 %, qəzet dilində 82,96 % təşkil edir.

Tədqiqat prosesində müasir Azərbaycan dilinin qrammatikasında *davamlı indiki zaman* kimi təqdim edilən *-maqda*[2] şəkilçisi ilə düzələn formanın[1] işləklik səviyyəsinə də diqqət yetirilmişdir. Müasir Azərbaycan dilində *-maqda*[2] şəkilçisi ilə düzələn formanın işləkliyi bədii üslubda 0,22 %, qəzet dilində isə 1,44 % təşkil edir. İndiki zaman mikrosahəsi üzrə bu formanın ümumilikdə çəkisi 0,47 % olmuşdur.

### 4.2.2. İndiki zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri

İndiki zaman mikrosahəsinin nüvəətrafı zonasını təşkil edən ikinci dərəcəli morfoloji ifadə vasitələri indiki zaman mənasının ifadə edilməsində müxtəlif zaman sahələrinə aid komponentlərin qarşılıqlı əlaqəsini göstərir. Belə qarşılıqlı əlaqənin bariz formalarından biri zamanların üslubi işlənməsidir.

Azərbaycan və ingilis dillərində indiki zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentlərinin qarşılaşdırılması həmin dillərdə bir sıra fərqləri ortaya çıxarır. Məsələn, indiki zaman mikrosahəsində Azərbaycan dilində ikinci dərəcəli morfoloji komponentlər ingilis dilindəki morfoloji komponentlərdən keyfiyyət baxımından fərqlənir. Azərbaycan dilində indiki zaman kontekstində qeyri-qəti gələcək zaman forması işlənir, ingilis dilində isə indiki zaman kontekstində işlənən gələcək zaman indiki, keçmiş və gələcək mənalarını özündə birləşdirən özünəməxsus bir formadır. Bu forma ingilis dilində *Gnomic Future* («qnomik gələcək») adlanır və haqqında

[1] Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, Elm, 1980, s. 340.

məlumat verilən iş və ya hərəkətin zaman etibarilə keçmişdə, indiki zamanda və gələcəkdə qiymətləndirmə nöqteyi-nəzərindən eyni olduğunu bildirir. Məsələn:

*Men* ***will be*** *deceivers* (du Maurier) – *Kişilər aldadan olub, aldadandırlar və aldadan olacaqlar*; *Boys, they all tacitly agreed,* ***will be*** *boys* (B.Shaw) – *Oğlanlar, sözsüz ki, oğlandırlar*; *Oil* ***will float*** *on water – Neft suyun üzərində qalır. Water is the only thing in natur' that* ***will*** *thoroughly* ***wash out*** *a trail, and even water will not always do it when the scent is strong* (F. Cooper.).

Göründüyü kimi, ingilis dilindəki bu cümlələrdə *The Future Indefinite* forması işlənsə də, onun ifadə etdiyi məna qiymətləndirilmə baxımından bütün zamanlarda eynidir. Qeyd etmək lazımdır ki, bu tip nümunələrin işlənməsinə çox az təsadüf edilir. Araşdırılan faktik dil materialı göstərir ki, ingilis dilində indiki zaman kontekstində *Gnomic Future* («qnomik gələcək») formasının işlənməsi mikrosahə üzrə 0,06 % təşkil edir və ona da yalnız bədii üslubda təsadüf edilmişdir.

İngilis dilindən fərqli olaraq Azərbaycan dilində indiki zaman kontekstində işlənən qeyri-qəti gələcək zaman forması bütün zamanları əhatə edən məzmun daşımır. İndiki zaman yerində işlənən qeyri-qəti gələcək zaman forması haqqında A.Axundov yazır ki, bu hal əsasən «r» ünsürü düşmüş qeyri-qəti gələcək zaman və *istəmək* felinin qeyri-qəti gələcək zamanda olan formasında özünü göstərir[1]. Bunu aşağıdakı nümunələrdə görmək olar:

*Qonşular toplandılar, yaranın üstünə təndir külü tökdülər, hörümçək toru qoydular,* ***bilməm*** *daha nə kimi oyunlar çıxartdılar, lakin olmadı* (C.Cabbarlı). – *Çay, çay, çay istəyən varmı? Saleb, simit...Kərim başını buladı: -Təşəkkür edirəm,* ***istəməm*** (Anar). *Beləsi heç* ***istəməz*** *də sülh olsun, alınmış, ve-*

---

[1] Axundov A. Dilin estetikası. Bakı, Yazıçı, 1985, s. 82.

*rilmiş yurdlar, torpaqlar qaytarılsın* («Ayna» qəzeti). *Hamıya ərk eləyir, əslində heç kimin xətrinə dəymək* ***istəməz*** (S. Ahmadli). *–Mən pul işini* ***bilmərəm****,-dedi,-onu özünüz bilərsiniz* (Elçin).

Qeyri-qəti gələcək zamanın indiki zaman yerində işlənməsinə dair aşağıdakı misalları da nəzərdən keçirək:

- *O yerdə ki, günəş* ***gülər****, dəniz* ***gülər****, göy* ***gülər****,*
*O yerdə ki, sarı bülbül yaz gününü* ***qarşılar****,*
*O yerdə ki, quşlar oxur,* ***söylənilər*** *türkülər,*
*Aydındır ki, o torpağın zəngin təbiəti var;*
*Axşamları, səhərləri çox xoş olur o diyar* (S.Vurğun).

*İspaniyanın xəbərləri ürəyimi* ***dələr****, yenə, Deyirlər ki, çöllərində qızıl güllər* ***mələr*** *yenə* (R.Rza).

Bu cümlələrdə *gülər, qarşılar, söylənilər, dələr, mələr* hərəkətlərini ifadə edən fellər formal şəkildə qeyri-qəti gələcək zamanda olsa da, kontekstin indiki zaman olması şübhə doğurmur.

Azərbaycan dilində indiki zaman mikrosahəsində ikinci dərəcəli komponentlərdən sayılan qeyri-qəti gələcək zaman formasının nitqdə kommunikativ yük daşıması çox da yüksək deyildir. Aparılmış araşdırmalar göstərir ki, ona istər bədii üslubda, istərsə də qəzet dilində çox az təsadüf edilir. Qeyri-qəti gələcək zaman formasının indiki zaman yerində işlənməsi bədii üslubda 1,04 %, qəzet dilində 0,36 % təşkil edir. Mikrosahə üzrə bu, 1,84 %-ə bərabərdir.

Azərbaycan dilində indiki zaman mikrosahəsində *-dı*$^4$ şəkilçili keçmiş zamanın indiki zaman yerində işlənməsinə də rast gəlmək olar. *-Dı*$^4$ şəkilçili keçmiş zaman indiki zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri arasında ən çox kommunikativ yük daşıyanıdır. Onun indiki zaman yerində işlənmə yükü mikrosahə üzrə ümumilikdə 4,95 % (bədii üslubda 6,95 %, qəzet dilində 1,72 %) olmuşdur.

Keçmiş zaman formasının indiki zaman yerində işlənməsi hərəkətin icrasının qətiliyinə inam ilə bağlı olur. Bu hallarda əsasən hərəkət felləri işlənir. Aşağıdakı nümunələrə diqqət yetirək:

- ***Gəldim***, *- dedi, - sonra Mamedə tərəf döndü, - Yaxşı, Mamed, daha sənin sözündən keçə bilmirəm. Amma axı gərək hazırlaşam. Böyük roldur?* (Anar). *-Yaxşı, salamat qalın, mən* ***qaçdım***, *- dedi* (Anar). KİŞİ (özünü sakitləşdirir). *Sakit ol... Əsəbiləşmə... (Bərkdən.) Yaxşı! Mən* ***getdim***! (Elçin). QONŞU. *Alə, hara* ***qaçdın***? *Mənim sözüm var axı sənə, ...* (Elçin).

Nümunələrdəki *gəldim, qaçdım, getdim, qaçdın* felləri indiki zamanda icra olunan hərəkətləri bildirir və nitq momenti ilə birbaşa əlaqədardır.

İndiki zaman mikrosahəsinin ikinci dərəcəli komponentləri kimi ingilis dilində felin vasitəli şəkilləri, Azərbaycan dilində isə felin təsriflənməyən formalarından olan feli sifət və feli bağlama çıxış edir.

İngilis dilində ikinci dərəcəli morfoloji komponentlər arasında ən yüksək tezliyə felin vasitəli şəkilləri malikdir. Nitq prosesində onların kommunikativlik yükü mikrosahə üzrə 2,82 % təşkil edir. Bütövlükdə götürdükdə, ingilis dilində indiki zaman mikrosahəsinin ikinci dərəcəli komponentləri sayca azdır, lakin felin vasitəli şəkilləri ilə müqayisədə o biri komponentlərdən daha çox işləkdir. Vasitəli şəkillərdən *Subjunctive I* müasir ingilis nitqində çox az işlənir. Adi danışıq dilində *Subjunctive I* əvəzinə felin *Suppositional* şəkli işlədilir. Məsələn:

*He ordered that the children* ***be*** *at home* (Subjunctive I) – *He ordered that the children* ***should be*** *at home* (Suppositional)

*Subjunctive I* formasına əsasən poeziyada, rəsmi sənədlərdə habelə bəzi ifadələrdə (***be** it so! God **forbid**! God **bless** you! Success **attend** you!*) rast gəlmək olar[1].

Aşağıdakı misallar felin vasitəli şəkillərinin indiki zaman kontekstində işlənməsi baxımından diqqəti cəlb edir.

*If you people only knew how fatally easy it is to poison someone by mistake, you wouldn't joke about it* (A.Cristie). *If it weren't for the children, I wouldn't mind anything* (S.Maugham). *If I were you, I'd go to night school* (J. London).

İngilis dilində felin təsriflənməyən formalarından *Participle I* və *Cerund* indiki zaman kontekstində praktik olaraq rast gəlinmədiyinə görə onlar ikinci dərəcəli morfoloji komponentlər sırasına daxil edilməmişdir. Amma məlumdur ki, *Participle I* və *Cerund* nisbi zaman ifadə edir və həmin nisbi zamanlılıq cümlədəki əsas felin zamanından asılı olur. Ümumiyyətlə, bir neçə hərəkətin eyni zaman müstəvisində ifadə olunmasını bildirmək felin təsriflənməyən formalarının xüsusiyyətidir. İngilis dilində *Infinitive*-ə gəldikdə isə, qeyd etmək lazım gəlir ki, infinitivli cümlələrin spesifik cəhəti hər üç sintaktik zaman formasında işlənə bilməsidir. Buna baxmayaraq, eləcə də onun nadir hallarda işlənməsini nəzərə alaraq, tədqiqatçılar infinitivli cümlələrin indiki zamanın ikinci dərəcəli komponentləri sırasına daxil edilməsini məqsədəuyğun saymırlar. Lakin nəzərə almaq lazımdır ki, infinitivlə olan konstruksiyalar *seem* və *appear* tipli fellərdən sonra gələrək nisbi indiki zamanı ifadə edir. Bunu aşağıdakı nümunələrdən görmək olar:

*There **seems to be** a kind of mystical relationship between him and the mountains* (E.Voynich). *English **seems to be** the popular language for quarrelling in, among foreigners* (Jerome K.Jerome). *Your grandfather **seems to be** a man who*

[1] Musayev O. İngilis dilinin qrammatikası. Bakı, 1972, s. 149.

*is usually right* (S.Maugham). *He **seems to be thinking** of something else* (Th. Dreiser). *As he seems **to be loitering** in this direction, it may be as well, perhaps, to walk towards him, and throw ourselves in his way* (Ch.Dickens).

Azərbaycan dilində indiki zaman mikrosahəsinin ikinci dərəcəli komponentləri arasında feli sifət və feli bağlamanın, eləcə də onların əmələ gətirdikləri tərkiblərin kommunikativ yük daşımaq qabiliyyəti o qədər də yüksək deyildir. Faktik dil materiallarının araşdırılması göstərir ki, felin təsriflənməyən formaları olan feli sifət və feli bağlama, eləcə də onların əmələ gətirdikləri tərkiblərin indiki zaman kontekstində işlənməsi bədii üslubda müvafiq olaraq 1,96 və 1,44 % təşkil edir. İndiki zaman kontekstində işlənən feli sifətlər və feli sifət tərkibləri -*an*$^{2}$, *-dıq*$^{4}$, feli bağlama və onların tərkibləri isə *-arkən*$^{2}$, *-anda*$^{2}$, *-araq*$^{2}$, *-ıb*$^{4}$, *-dıqda*$^{4}$ şəkilçiləri ilə əmələ gəlir. Aşağıdakı nümunələrdə felin təsriflənməyən formaları cümlənin kontekstini ya cümlənin ümumi məzmunundan, ya da cümlənin feli xəbərindən asılı olaraq indiki zamanla bağlayır:

*(Əlindəki kağızı oxuyur.) Birinci sual - «Ən çox **sevdiyin** insan?» Cavab - «İosif Vissarionoviç Stalin!»* (Elçin). *-Elə **durduğun** yerdə səni döymək istəyir? Bəlkə sataşıb eləyirsən ona?* (Anar). *Ona görə mən siz deyiləm ki, sizin indi də **inandığınız** və **sevdiyiniz** arzular var, həqiqi arzularınız, mən isə...(*Elçin). *Öz adınızdan **söylədiyiniz** bu fikir Nitşedən götürülmüşdür* (H.Mehdi). *Əsəri **yazarkən** tarixi sənədlərin, arxiv materiallarının, ... toplanması və mənə çatdırılmasında böyük zəhmətləri olan ... dostum Tofiq Bağırova, yazıçı Anara və ... dönə-dönə minnətdar olduğumu söyləyirəm* (İ.Şıxlı). *Yadına **düşəndə** bu gün də Zəlimxanın tükü ürpəşir* (İsa Hüseynov). *-Sən elə bil məni qorxutmaq istəyirsən, Qaraxan... - Adam özü qorxuya **düşəndə** başqasını da qorxudur, qaqaş* (İ.Hüseynov). *Çarəsiz uşaqlar, çarəsiz böyüklər **çoxaldıqca** ... Dünya da on üç yaşlı Sadıq kimi yaman dərdlə üz-üzə **dayanıb** aciz qalır...*

(S.Səxavət). ...*Zövq* ***aldıqca*** *azğınlaşır, ... gözlərini qan örtür...* (S.Səxavət). *İllər* ***keçdikcə*** *onlar böyüyür və bir-bir nişanlanıb ərə verilirdi* (İ.Şıxlı).

Nümunələrdən göründüyü kimi, indiki zaman kontekstinin meydana çıxmasında felin təsriflənməyən formaları ilə cümlənin əsas feli xəbərinin birgə işlənməsinin, hər iki vahidin semantikasının mühüm rolu vardır.

Beləliklə, sahə yanaşması ilə Azərbaycan və ingilis dillərində indiki zaman mikrosahəsinin morfoloji strukturunda indiki zaman mənasının ifadə edilməsində mühüm tipoloji struktur və funksional fərqləri və oxşarlıqları aydınlaşdıra bilərik. Hər şeydən əvvəl, qeyd edilməlidir ki, indiki zaman mikrosahəsinin morfoloji strukturunda mühüm fərqlər özünü göstərir. Söhbət birinci növbədə ondan gedir ki, mikrosahənin morfoloji nüvəsindəki əsas morfoloji komponentlər sayca fərqlərinir, yəni ingilis dilində mikrosahənin dörd (bir sintetik, üç analitik) indiki zaman formasına qarşılıq olaraq Azərbaycan dilində bir sintetik indiki zaman forması dayanır.

Nüvəətrafı zona komponentlərinin funksionallığında da qarşılaşdırılan dillərdə oxşarlıq, demək olar ki, yoxdur. Burada, hər şeydən öncə, Azərbaycan dili üçün digər zaman formalarının (şühudi keçmiş və qeyri-qəti gələcək) indiki zaman sferasına keçməsində daha geniş imkanların olması, eləcə də felin təsriflənməyən formalarının funksionallığı qeyd olunmalıdır. İngilis dilində isə indiki zaman kontekstində göstərilən ifadə vasitələri praktik olaraq işlənmədiyi üçün mikrosahənin nüvəətrafı zonası çox kasıb görünür və demək olar ki, felin vasitəli şəkillərinin burada işləndiyi hallarla təmsil olunur.

### 4.3. Gələcək zaman mikrosahəsi

Qarşılaşdırılan dillərdə gələcək zaman geniş ifadə vasitələri sisteminə malikdir. Bu dillərdə gələcək zaman xəbər şəkli

daxilində işlənən formal-qrammatik kateqoriyalardan hesab olunur. Linqvistik-morfoloji kateqoriya kimi gələcək zaman ingilis və Azərbaycan dillərində müxtəlif təzahür formalarına, çoxaspektli qrammatik-semantik funksiya və vəzifələrə malikdir.

Dilin qrammatik sistemində morfoloji-qrammatik kateqoriya kimi gələcək zamanın formalaşması, inkişafı və sabitləşməsi haqqında irəli sürülmüş mülahizələrdə ümumi cəhət ondan ibarətdir ki, gələcək zaman dillərin inkişafının son dövrlərinə aiddir[1].

Dilçilik ədəbiyyatında gələcək zaman haqqında mülahizələr hərəkətin və ya hadisənin gələcək sferasına aid edilməsi üçün hər bir dilin sərəncamında olan ifadə vasitələrinin təsnifatı məsələlərinə olan baxışların rəngarəngliyi qədər müxtəlifdir. Müxtəlif dillərin materialları əsasında aparılmış tədqiqat və araşdırmalarda gələcək zamanın, ümumiyyətlə, gələcəklik ideyasının ifadə vasitələrinin sistem şəklində tam və diferensial şəkildə təsvir və təhlilinin verilməsinə edilən cəhdlər bu məsələnin nəzəri və praktik planda mühümlüyü ilə şərtlənir.

Çoxaspektli və çoxfunksiyalı olmasına baxmayaraq, gələcək zamanı səciyyələndirən ümumi invariant əlamət iş və hərəkətin icrasının, müəyyən halın nitq momentindən sonraya aid olmasıdır. Güman edilən iş, hal və ya hərəkətin hipotetikliyi gələcək zamanın digər ifadə vasitələri üçün ümumi əlamət olduğu kimi, gələcəklik anlayışının morfoloji ifadə vasitələri üçün də ümumidir.

Yuxarıda keçmiş və indiki zaman mikrosahələrinin morfoloji ifadə vasitələrinin təsvir və təhlilində istifadə etdiyimiz üsüldan gələcək zaman mikrosahəsinin təsvirində də istifadə edəcəyik, yəni burada da mikrosahənin nüvəsini təşkil edən əsas morfoloji komponentlərin və nüvəətrafı zonanı əmələ gə-

---

[1] Bu barədə bax: Axundov A. Felin zamanları, səh. 85-87.

tirən ikinci dərəcəli morfoloji komponentlərin təsvir və təhlilini verəcəyik.

### 4.3.1. Gələcək zaman mikrosahəsinin əsas morfoloji komponentləri

Birinci növbədə, qarşılaşdırılan dillərin hər biri üçün araşdırılan mikrosahənin nüvəsini təşkil edən morfoloji ifadə vasitələrininin inventarını ortaya çıxarmaq lazım gəlir. Qeyd etmək lazımdır ki, gələcək zaman mikrosahəsinin nüvəsini təşkil edən morfoloji ifadə vasitələri özlərinin məzmununda gələcəklik semasını əsas komponent kimi ehtiva edir. Məhz bunun nəticəsində onlar paradiqmatik səviyyədə zaman kateqoriyasının oppozisiya elementləri kimi çıxış edə bilir. İngilis dilində gələcək zaman mikrosahəsində onlar *The Future Indefinite, The Future Continuous, The Future Perfect, The Future Perfect Continuous* kimi zaman formaları ilə təmsil olunur. Azərbaycan dilində isə mikrosahənin nüvəsi qəti gələcək və qeyri-qəti gələcək zamanlardan təşkil olunur.

İngilis və Azərbaycan dillərində gələcək zaman mikrosahəsinin morfoloji nüvələrinin qarşılaşdırılması belə qənaətə gəlməyə əsas verir ki, bu zonaya daxil olan komponentlər bir-birindən inventar və tezlik səciyyələrinə görə əhəmiyyətli dərəcədə fərqlənsələr də, funksional-semantik baxımdan onların aralarında oxşarlıq vardır.

Morfoloji nüvəni əmələ gətirən komponentlərə gəldikdə, ingilis dilində faktik olaraq üç analitik zaman formasına (*The Future Indefinite, The Future Continuous, The Future Perfect*) Azərbaycan dilində iki sintetik zaman forması (*qəti gələcək və qeyri-qəti gələcək*) uyğun gəlir. İngilis dilində *The Future Perfect Continuous* forması isə faktik olaraq nitqdə işlənmir və faktik dil materialları üzərində müşahidələr də bunu aydın göstərir.

Mikrosahənin dominant komponentləri kimi ingilis dili üçün *The Future Indefinite*, Azərbaycan dili üçün *qəti gələcək zaman* forması müəyyənləşdirilmişdir. Dominant komponentlərin qarşılaşdırılan dillərdə mikrosahə üzrə ümumi çəkisi müvafiq olaraq 41,43 % və 46,25 % təşkil edir.

Qarşılaşdırılan dillərdə mikrosahənin dominantı olan *The Future Indefinite* və *qəti gələcək zaman* formalarının məzmununda əsas cəhət nitq momentindən sonra baş verəcək iş və ya hərəkəti, mövcud olacaq halı ifadə etməkdir. Nitq momentindən sonra baş verəcək hərəkətlər hələ icra olunmamış, gerçəkləşməmiş hərəkətlərdir. İcra olunmamış hərəkətlərin baş verib-verməməsi isə ehtimalla bağlıdır. Bunları nəzərə alan A.Axundov yazır: «gələcək zaman keçmiş və indiki zamanlarla müqayisə olunarsa, dildə nisbətən az işlənir»[1]. A.Axundovun bu mülahizəsi həm Azərbaycan, həm də ingilis dillərinin materialları ilə təsdiq olunur. Aparılmış statistik hesablamalara görə, Azərbaycan dilində temporallıq makrosahəsində gələcək zaman mikrosahəsinin ümumi çəkisi 13,11 %, ingilis dilində isə 23,3 % təşkil edir. Bu kəmiyyətin müvafiq olaraq 6,06 % və 9,66 %-i qarşılaşdırılan gələcək zaman mikrosahəsinin dominantları olan *qəti gələcək zaman* və *The Future Indefinite* formalarının payına düşür.

Azərbaycan dilində mikrosahənin dominantı olan qəti gələcək zaman forması gələcəkdə icra ediləcək iş və hərəkətin gerçəkləşməsinə inam və qətilik ifadə edir.

*Əlbəttə, tarixi əhəmiyyətə malik olan binalar* ***saxlanılacaq*** (Anar). *İki gənc şairə, iki ana səsimə* ***səs verəcək*** (Ə.Cəfərzadə). ***Kökü kəsiləcək*** *nifrətin, kinin, Loğmanlar* ***olacaq*** *onda* ***hökmran*** (B.Vahabzadə). *Mükafat hər il yanvar ayında* ***təqdim ediləcək*** (Elçin). *Mən professorla vidalaşmaq üçün mütləq onun yanına* ***gələcəyəm*** (S.Rəhimov). *Qori seminari-*

[1] Axundov A. Felin zamanları, s. 85.

*yasını bitirmiş Məmməd Əfəndiyev, riyaziyyat müəllimi Yusif Məmmədov, alman və rus dillərindən dərs deyən Mamed Aleksandroviç Aleksandrovu və başqalarını yüz il də bundan sonra* ***unutmayacaq****, həmişə onları bir müəllim-ata kimi* ***xatırlayacaq*** (S.Səxavət).

A.Axundov qəti gələcək zamanın ifadə etdiyi bu mənanın mənbəyini danışanın (subyektin) hərəkətin icrasına olan münasibəti ilə bağlamır. O göstərir ki, qəti gələcək zamanın bu mənası subyektin hərəkətin icrasına olan münasibəti zəminində ortaya çıxsaydı, bu, *-acaq* formasının gələcək zaman forması olduğunu şübhə altına alar, bəlkə də başqa bir kateqoriya, qətiyyət kateqoriyası əmələ gətirərdi. A.Axundov eyni zamanda qəti gələcək zamanda iş və ya hərəkətin icrasına olan qəti əminliyin, inamın da subyektiv xarakter daşımadığını vurğulayır, bu əminliyin «danışanın ifadəsindən kənarda obyektiv aləmdə fəaliyyət göstərən hal və hərəkətlərin mahiyyətində»[1] olduğunu göstərir.

Bu baxımdan yuxarıdakı nümunələrdə *saxlanılacaq, səs verəcək, kəsiləcək, hökmran olacaq, təqdim ediləcək, unutmayacaq, xatırlayacaq* felləri ilə ifadə olunan hal və hərəkətlərin heç biri danışanın subyektiv fikri ilə bağlı deyil, subyektin iradəsindən asılı olan hərəkətlər deyildir, yəni həmin hərəkətlər onların haqqında məlumat verilən nitq momentindən sonra hansısa şərtlər daxilində istər-istəməz, subyektin iradəsindən asılı olmayaraq baş verəcəkdir. *Əlbəttə, tarixi əhəmiyyətə malik olan binalar* ***saxlanılacaq*** cümləsində binaların *saxlanacağı* onların tarixi əhəmiyyət daşıması ilə bağlıdır. Bunu danışan subyektin iradəsi ilə bağlamaq olmaz, tarixi əhəmiyyətlilik qiymətləndirilmə baxımından bütöv cəmiyyətə məxsusdur. Ona görə də binaların saxlanılacağı qətidir, şübhəsizdir. *Mükafat hər il yanvar ayında* ***təqdim ediləcək*** cümləsində müəy-

---

[1] Axundov A. Felin zamanları, s.95.

yən mükafatın təsis edilməsi haqqında məlumat verilməsindən sonra artıq bir qaydanın ortaya qoyulması göz önündədir.

İngilis dilində gələcək zaman mikrosahəsinin dominant komponenti olan *The Future Indefinite* forması da öz məzmununda bu semantikanı ehtiva edir. Məsələn:

*"The mater **will be delighted** to see you again--after all those years," he added* (A.Cristie). *'The mid-day bells **will ring** in forty minutes* (Ch.Dickens). *The parade on Sunday 18 March **will start** at 1 p.m* (The New York Times). *Once an individual has passed this faint line on the way downward he **will get no glance** from her* (Th.Dreiser). *We **shall** frequently **have occasion** to speak of this Sublette, and always to the credit of his game qualities* (W.Irving).

Nümunələrdəki *will be delighted (sevinəcək), will ring (çalınacaq), will start (başlanacaq), will get no glance (görməyəcək), shall have occasion (imkanımız olacaq)* felləri ilə ifadə olunan hərəkətlər subyektin iradəsindən asılı olmayaraq baş verən hərəkətlərdir.

Azərbaycan dilində qəti gələcək zaman nitq momentindən sonra müəyyən zaman kəsiyində icra olunacaq hərəkətləri bildirməyə xidmət edir. İngilis dilindəki *The Future Indefinite* formasının məzmununda da eyni növ hərəkətlərin ifadəsini müşahidə etmək olur. Hər iki dildə müəyyənlik əksər hallarda hansısa şərtlər daxilində reallaşır. Həmin şərtləri meydana çıxaran vasitələr isə sadə cümlələrdə temporal zərflər (a), mürəkkəb cümlələrdə isə temporal söz birləşmələri (b) və zaman budaq cümləsidir (c). Bunu nümunələrdən də görmək olar:

a) *Qoy rahat yatsın, **sabah** onsuz da **eşidəcək*** (İ.Şıxlı). ***Sabah, cümə günü** hökmən Ofelyayla **sözləşəcək**, **şənbə** onunla bağda **görüşəcək**, **bazar günü** isə dostlarını kababa **dəvət eləyəcək*** (Anar). ***İndicə** qonaqlarımız **gələcək*** (Elçin).

***In a month** there **will be** purple stars on the clematis, and year after year the green night of its leaves will hold its*

*purple stars* (O.Wilde). *Anne* ***will bring*** *the tea* ***in a minute*** (S.Maugham). *I* ***will now request*** *the junior fellow to collect your votes... I* ***shall then read*** *them aloud...* (Snow).

b) ***Biz Kürü keçənəcən****, gün günortadan* ***əyiləcək*** (İ.Şıxlı). ***Çarəsiz uşaqlar, çarəsiz böyüklər çoxaldıqca əvvəl-axır*** *Dünya da on üç yaşlı Sadıq kimi yaman dərdlə üz-üzə dayanıb* ***aciz qalacaq...(***S.Səxavət). *Aylıq kirayə tutulan mənzil,* ***təhsil ərzində, bir neçə ildə****, eləcə bir evin xərcini* ***aparacaq*** (S.Əhmədli).

*We will wait* ***until after next year's spring-floods*** (Jerome K.Jerome). "*You will be in Chicago* ***some little time****, won't you?" he observed at one turn of the now easy conversation* (Th.Dreiser).

c) ***Nə qədər mən varam****, bu evə Telli-melli ayağı dəyməyəcək* (M.İbrahimov). ***Nə qədər ki, gözlərim görür, ayaqlarım hərəkət edir,*** *sənətimdə çalışacağam* (Ə.Vəliyev).

***Before he knows it****, those detaining fingers of his will be detained* (J. London). *Society will take me to Ober-Ammergau, will provide for all my wants on the way, and,* ***when I am there****, will show me the Passion Play*. (Jerome K. Jerome). ***As long as I live****, the personality of Dorian Gray will dominate me* (O. Wilde).

Nümunələrdə cümlənin xəbəri ilə ifadə olunan iş, hal və hərəkət qalın kursivlə verilmiş temporal zərflər, temporal birləşmələr və zaman budaq cümlələrinin bildirdiyi müəyyən gələcək zamanda baş verir. Azərbaycan dilində qəti gələcək zaman üçün müəyyənlik xarakterikdir. Bu barədə A. Axundovun fikri ilə tamamilə razılaşmaq lazım gəlir. Temporal zərflərlə işlənmək xüsusiyyəti qeyri-qəti gələcək zamanda müşahidə edilsə də, bu, həmin zaman forması üçün tipik deyildir[1].

---

[1] Axundov A. Felin zamanları, s. 97.

Əsas morfoloji komponentlər olan *qəti gələcək zaman* və *The Future Indefinite* formalarının məzmununda diqqəti cəlb edən əsas cəhətlərdən biri birdəfəli tərz mənasını ifadə etməkdir.

*- Nə darıxırsan, maşını ayağının altında, harda olsa özünu* ***yetirəcək*** (Anar). *Səhər* ***duracaqsız****, bütün dərdi-qəminiz* ***uçub gedəcək*** (Anar). *Belə getsə, bir-birlərini* ***qıracaqlar****, araya* ***qan düşəcək*** (İ.Şıxlı).

*"The mater* ***will be delighted*** *to see you again – after all those years," he added* (A.Cristie). *But by the middle of August the subdirector* ***will be back*** *from his holiday* (E.Voynich). *"I make no doubt, Master Pathfinder," he answered, when these thoughts had found time to glance through his mind, "that we* ***shall reach*** *port in safety* (J.F.Cooper). *"You come to work to-morrow, and in the middle of the day I'****ll advance*** *you enough for your dinner* (J.London).

Misallarda qalın kursivlə verilən fellər gələcəkdə icra olunacaq hərəkətlərdə birdəfəli tərzi bildirir.

Bununla bərabər, müəyyən sintaktik şəraitdə *qəti gələcək zaman* və *The Future Indefinite* formalarının məzmununda gələcəkdə baş verəcək hərəkətlərin təkrarən, bir neçə dəfə icra ediləcəyini bildirmək xüsusiyyəti də müşahidə olunur. Gələcəkdə baş verəcək hərəkətlərin təkrarən, bir neçə dəfə icrasını təmin edən sintaktik şərait temporal feli birləşmənin və zaman budaq cümləsinin hesabına mümkün olur. Məsələn:

*Allah eləməsin,* ***sən yorulub eləyəndə****, ya da* ***o tez-tez tutulduğun «kəlləmənqo» olanda*** *səni layiqincə əvəz edə biləcək* (Ə.Cəfərzadə). ***O yana-bu yana qaçdıqca*** *toz-torpaq havaya qalxacaq* (S.Əhmədli). ***Qığılcımlar qorlandıqca*** *çoxalacaq, alovlanıb ətrafa işıq saçacaq* (İ.Şıxlı). ***İmkan düşəndə də, düşməyəndə də*** *o qonşuya yaxşılıq edəcəyəm* (Ə.Cəfərzadə).

*"You will need another confessor* ***in my absence****."* (E.Voynich). ***As long as I live****, the personality of Dorian Gray will dominate me* (O.Wilde). *You will have to wait* ***until you hear from me again*** (Th.Dreiser).

Misallarda *sən yorulub eləyəndə, o tez-tez tutulduğun «kəlləmənqo» olanda, qığılcımlar qorlandıqca, imkan düşəndə də, düşməyəndə də; in my absence, until you hear from me again* birləşmələri «əvəz etmək», «havaya qalxmaq», «çoxalmaq», «işıq saçmaq», «yaxşılıq etmək», «need», «wait» felləri ilə icra ediləcək hərəkətlərin dəfələrlə yerinə yetiriləcəyi mənasını yaradır.

Əldə olan faktik dil materialından çıxış edərək deyə bilərik ki, Azərbaycan dilində gələcəkdə baş verəcək hərəkətlərin təkrarən, bir neçə dəfə icrası daha çox *-dıqca*$^4$ və *-anda*$^2$ şəkilçili feli bağlama və onun əmələ gətirdiyi tərkiblərdən ibarət temporal birləşmələrin işləndiyi cümlələrdə müşahidə olunur.

İngilis və Azərbaycan dillərində *qəti gələcək zaman* və *The Future Indefinite* formalarının qeyd edilməli cəhətlərindən biri iş, hal və ya hərəkətlərin dinamikasını bildirməkdir. Gələcək zaman formalarının bu xüsusiyyəti bir çox tədqiqatçılar tərəfindən qeyd edilir[1].

Beləliklə, ingilis və Azərbaycan dillərində gələcək zaman mikrosahəsinin dominant morfoloji komponentləri olan *qəti gələcək zaman* və *The Future Indefinite* formalarının məzmununda oxşar cəhətlər olduğunu faktlar əsasında müşahidə etdik.

Mikrosahənin dominant komponentlərinin funksional baxımdan, kommunikativ yük daşıma cəhətdən oxşarlıqları var-

---

[1] Axundov A. Felin zamanları, s. 99; Sadıqov R. Müxtəlifsistemli dillərdə obyektiv və qrammatik zaman əlaqələri, Bakı, 2004, s. 96; Müasir Azərb. dili, 1980, s. 341; Cəfərova B. İngilis və Azərbaycan dillərində felin zamanlar sistemi. Bakı, 2004, s. 181; Gordon E.M., Krylova I.P. A Grammar of Present-day English (Parts of Speech), 2nd ed., M., 1980, p. 51.

dır. *Qəti gələcək zaman* və *The Future Indefinite* formaları həm bədii üslubda, həm də qəzet dilində yüksək işlənmə tezliyinə malik qrammemlərdir. *Qəti gələcək zamanın* işləkliyi bədii üslubda 42 %, qəzet dilində 62,25 % təşkil edir. *The Future Indefinite* formasının işləkliyi isə bədii üslubda 40,07 %, qəzet dilində 41,43 % təşkil edir.

Mikrosahənin digər morfoloji komponentləri üçün də kommunikativ yük daşıma dərəcəsi müəyyənləşdirilmişdir. Məsələn, Azərbaycan dili üçün mikrosahənin əsas morfoloji komponentlərindən olan *qeyri-qəti gələcək zaman* forması qəti gələcək zamanla müqayisədə təxminən iki dəfə az kommunikativ yük daşıyır. Qeyri-qəti gələcək zaman forması bədii üslubda 24,87 %, qəzet dilində isə 4,87 % işlənir. Qeyri-qəti gələcək zaman formasının mikrosahə üzrə ümumi çəkisi 20,87 % təşkil edir. Qeyri-qəti gələcək zaman forması üçün qeyd edilməli cəhətlərdən biri ondan ibarətdir ki, bu formanın qəzet dilində işləkliyi çox aşağıdır.

İngilis dilində gələcək zaman mikrosahəsinin digər morfoloji komponentlərinin kommunikativ yük daşıma dərəcəsi də çox aşağıdır. *The Future Continuous* forması bədii üslubda 1,81 %, qəzet dilində isə 1,75 % işlənir. Mikrosahə üzrə onun ümumi çəkisi 1,8 %-dir. *The Future Perfect* forması isə ondan da az işlənir (bədii üsludda – 0,11 %, qəzet dilində – 0,5 %). Onun mikrosahə üzrə ümumi işlənmə faizi 0,2 % təşkil edir.

Gələcək zaman mikrosahəsinin əsas morfoloji komponentlərinin müqayisəsi bir cəhəti də qeyd etməyə imkan verir. Azərbaycan dilindəki əsas morfoloji komponentlərin mikrosahə üzrə ümumi çəkisi (67,1 %) ingilis dilindəki əsas morfoloji vahidlərin ümumi çəkisindən (43,43 %) artıqdır. Fikrimizcə, həmin fərq bu dillərin quruluşundakı sintetikliyin və analitikliyin nəticəsində meydana çıxmışdır. Məlum olduğu kimi, başqa dillərdə gələcək zaman anlayışının ifadəsində morfoloji ifadə vasitələrinin yerinə yetirdiyi funksiyaların bir çoxunu in-

gilis dilində leksik-qrammatik konstruksiyalar yerinə yetirir (bu barədə 2-ci fəsildə bəhs edilmişdir).

### 4.3.2. Gələcək zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri

Azərbaycan və ingilis dillərində gələcək zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri həm inventar, həm də funksional baxımdan müxtəlif şəkildə təmsil olunmuşdur. İkinci dərəcəli komponentlər hər iki dildə gələcəklik anlayışının ifadə edilməsində kommunikativ cəhətdən təxminən bərabər yük daşıyır. Azərbaycan dilində ikinci dərəcəli komponentlərin mikrosahə üzrə ümumi çəkisi 23,48 %, ingilis dilində isə 22,17 % təşkil edir. Onların təsvirini vermək məqsədəuyğun olardı.

Azərbaycan dilində ikinci dərəcəli morfoloji komponentlər -*(y)ır*$^4$ şəkilçili indiki zaman, şühudi keçmiş zaman (-dı$^4$), fel şəkilləri, feli sifət və feli bağlama ilə təmsil olunmuşdur. İngilis dilində isə ikinci dərəcəli morfoloji komponentlərə *The Present Indefinite, The Present Continuous*, *Imperative, Subjunctive* və *Infinitive* aiddir.

Qarşılaşdırılan dillərdə mikrosahənin ikinci dərəcəli komponentləri arasında -*(y)ır*$^4$ şəkilçili indiki zaman, *The Present Indefinite* və *The Present Continuous* formaları xüsusi yer tutur. Hər iki dildə gələcək zaman anlayışının ifadəsində indiki zaman formalarının işlənməsində oxşarlıq müşahidə edilir.

Həm Azərbaycan, həm də ingilis dilində gələcək zaman kontekstində indiki zamanın iki şəkildə işlənməsi müşahidə olunur. Onları aşağıdakı kimi qruplaşdırmaq olar:

1) İndiki zaman subyektin hərəkətin icra edilməsinə qətiyyətini, niyyətini, hazır olmasını nəzərdə tutan, yaxın gələcək üçün icrası planlaşdırılan və ya mütləq icra olunacaq hərəkətlərin ifadəsində işlənir. Bu halda hərəkətin gələcəyə

aidliyi gələcək zamanın leksik göstəriciləri vasitəsilə vurğulanır. Qarşılaşdırılan dillərdə indiki zamanın gələcək kontekstində bu cür işlənməsində məkan daxilində yerdəyişməni bildirən *gəlmək, getmək, yola düşmək, to go, to come, to arrive, to leave, to start* tipli fellərdən istifadə edilir. Bu növ işlənmə özünü aşağıdakı nümunələrdə göstərir:

*Poyez gecə bir tamamda* ***gedir****, pravadnikə Əjdərin adını verəcəksən...Yeddinci vaqon, yadından çıxmasın...* (Ə.Əylisli)

*-You are leaving? –We* ***go*** *to London tonight. Our plane* ***goes*** *early tomorrow morning* (A.Chrisie).

Bununla belə, qeyd edək ki, indiki zaman formalarının bu şəkildə işlənməsi təkcə məkanda yerdəyişmə felləri ilə məhdudlaşmır. Bu məqsədlə müxtəlif mənalı fellərldən istifadə edilir.

*The present contract* ***expires*** *at the end of December (The Morning Star). You'****re giving*** *Laurence the sack, Sophia, why?* (A.Christie).

*Sabah* ***başlayıram****... Hə, sabah* ***başlayıram****...* (Elçin). *Sabah getmək* ***istəyirəm*** (Anar)

2) ingilis dilində indiki zaman gələcəkdə icrası təsəvvür edilən hərəkətləri bildirir. Nümunələrə diqqət yetirək:

*I know what will happen if I struggle to escape from people who are preventing my movement. I try to escape by running away but am unable to struggle up. My legs fail to respond to the orders of the mind. The people who are threatening me come nearer. I try to push them away, but my arms are muffled in some clinging material, and I roll helplessly from side to side. It's an unpleasant dream.* (M.Reed). *Voyons. One fact leads to another – so we continue. There is something missing – a link in the chain that is not there. We examine. We search. And that little curios fact... we put here* (A.Christie).

İngilis dilində indiki zamanın gələcək kontekstində işlənməsinin daha bir məqamı tabeli mürəkkəb cümlələrdə, zaman və şərt budaq cümlələrində müşahidə olunur. *If, unless, when, as soon as, provided that, until, till, before* və s. bağlayıcılarla başlanan zaman və şərt budaq cümlələrində qeyri-qəti gələcək zaman əvəzinə indiki qeyri-müəyyən zaman forması işlənir:

*When I* ***come out*** *I shan't speak to you in case he's watching* (A.Cristie). *The moment he* ***comes back****, send him to me* (B.Shaw). *Do you want to be ashamed in front of him, when I* ***tell*** *him that you tired to strike me?* (A.Cristie). *Burn this as soon as* ***read*** (Ch.Dickens). *Wrap her up in brown paper till they* ***come*** (B.Shaw).

Azərbaycan dilində belə hallarda adətən feli bağlama və ya onların əmələ gətirdikləri tərkiblər çıxış edir. Bu halda feli bağlama ilə ifadə olunan hərəkətin gələcək zamanda icra ediləcəyi nəzərdə tutulur:

-*Gizlənib, ara* ***soyuyanda*** *yenə gedəcəyəm* (Ə.Əylisli). *Bax, o zaman bir parça çörək* ***qazananda*** *bacısına, bacısının balalarına yardım eləyə biləcək...* (Ə.Cəfərzadə). *Allah eləməsin, sən* ***yorulub eləyəndə****, ya da o tez-tez tutulduğun «kəlləmənqo»* ***olanda*** *səni layiqincə əvəz edə biləcək* (Ə.Cəfərzadə). *Bütün bunlar sonralar olacaq,* ***yay qurtaranda, payız gələndə*** (Elçin).

Bütün dillərdə olduğu kimi, Azərbaycan və ingilis dillərində də imperativ və ya əmr şəkli gələcək zaman planı ilə məhdudlaşan temporal məna verir. Bunun özü əmrin mənasından irəli gəlir, çünki əmr edilən iş və ya hərəkətin icra edilib-edilməməsi əmr edilən zamandan sonraya bağlıdır. Bu isə istər-istəməz gələcək zamandır. Azərbaycan dilindəki əmr şəkli ilə ingilis dilindəki imperativin gələcək zamanın ikinci dərəcəli komponentləri kimi funksionallığında, demək olar ki, tam uyğunluq müşahidə olunur. Müq. et:

*Sabah əlin ev işindən qurtaranda zəhmət çək, gəl, bir yerdə gedək onun yanına* (Ə.Cəfərzadə). *-Olmaz sabah içim? -Niyə sabah?* (Elçin).

*Come and see me tomorrow.* (B.Shaw). *You just here till Pastor Purdy comes back* (Caldwell).

İngilis dilində imperativ funksional baxımdan kifayət qədər geniş yayılmış strukturdur. Məsələn, gələcək zaman mikrosahəsinin ikinci dərəcəli komponentləri arasında imperativin işlənməsi mikrosahə üzrə 7,74 % təşkil edir. Üslublar üzrə götürdükdə, imperativin gələcək zaman kontekstində işlənməsi bədii üslubda daha geniş yayılmışdır. Hesablamalar göstərir ki, imperativin bədii üslubda gələcək zaman yerində işlənməsi 10,04 % olmuş, qəzet üslubunda isə o, müşahidə edilməmişdir.

İngilis dilindən fərqli olaraq Azərbaycan dilində gələcək zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri arasında felin əmr şəklindən əlavə, digər fel şəkillərinin işlənməsi də müşahidə edilmişdir. Onlara felin vacib və lazım şəkillərini misal çəkmək olar. *-Malı*$^2$, *-ası*$^2$ şəkilçili fel şəkillərində də iş və ya hərəkətin icra edilib-edilməməsi gələcək zamanla bağlıdır.

*Durub yuyunmalı, idman etməli, üzünü qırxmalı, çay içməli və işə getməlidir* (Anar). *...Bu oyundan boyun qaçırmayacaq, bu müəmmalı oyunu oynamağa hazırdır: yalnız oyunun şərtlərini və qaydalarını bilməli, oyunçuları tanımalıdır* (Anar). *Bir-iki məktub var, onları yazıb təcili yola salasıyam* (Elçin). *Toy bu günlərdə başlanasıdır* (Ə.Əylisli).

Tədqiqatda felin şəkillərinin (əmr, lazım, vacib) gələcək zaman mənasında işlənməsi ayrı-ayrı şəkillər üzrə deyil, bütövlükdə götürülmüşdür. Məlum olmuşdur ki, felin şəkillərinin gələcək zaman mənasında işlənməsi ikinci dərəcəli komponentlər arasında çox geniş yayılmışdır. Mikrosahə üzrə onların işləkliyi ümumilikdə 9,87 % təşkil etmişdir. İngilis di-

lində olduğu kimi, Azərbaycan dilində də fel şəkillərinin üslublar üzrə işlənməsində fərqlər müşahidə edilir, yəni felin şəkilləri gələcək zaman mənasında bədii üslübda 11,78 %, qəzet üslubunda isə 2,25 % işlənmişdir.

Gələcək zaman mikrosahəsinin ikinci dərəcəli komponentləri arasında ingilis dili üçün felin vasitəli şəkillərindən *Subjunctive* kontekstdən asılı olaraq bu və ya digər zaman aidiyyəti bildirə bilir. *Subjunctive* formasının ümumi gələcəklik mənası hərəkətin gümanlılığı, hipotetikliyi ilə bağlı olur. *Subjunctive* formasının gələcək zaman kontekstində işlənməsi mikrosahə üzrə 3,17 % təşkil etmişdir.

Qarşılaşdırılan dillərin gələcək zaman mikrosahəsinin inventar baxımından fərqi Azərbaycan dilində -*dı*$^4$ şəkilçili keçmiş zaman formasının gələcək kontekstində işlənməsidir. Doğrudur, keçmiş zaman gələcək kontekstində indiki zaman forması qədər işlənmir, lakin keçmiş zamanın gələcək yerində işlənməsi Azərbaycan dili üçün çox maraqlı faktdır. İngilis dilinə gəldikdə isə, qeyd etmək lazımdır ki, keçmiş zaman formalarının heç biri digər zaman kontekstində işlənmir. Azərbaycan dilində keçmiş zamanın gələcək yerində işlənməsinə daha çox bədii üslubda təsadüf olunur –2,90 %. Mikrosahə üzrə onun ümumi işləkliyi 2,4 % təşkil edir.

Gələcək zaman kontekstində işlənən -*dı*$^4$ şəkilçili keçmiş zaman forması «gələcəkdə icra ediləcək bir işi ehtimalla verir, onun artıq icra olunduğunu təsəvvürə gətirir»[1]. Keçmiş zamanın bu xüsusiyyəti daha çox şifahi xalq ədəbiyyatı janrlarında, xüsusən lətifələrin dilində təsadüf edilir[2].

Keçmiş zamanın belə işlənməsini digər tədqiqatçılar da müşahidə etmişlər. Onlar bunu üslubi vasitə kimi şərh edir və göstərirlər ki, bu, «təsvir olunan hadisələri oxucuya, ya dinlə-

---

[1] Axundov A. Dilin estetikası, Bakı, 1985, s. 83.
[2] Yenə orada, s. 83.

yiciyə daha qüvvətli, daha təsirli şəkildə çatdırmağa xidmət edir»[1].

Beləliklə, *-dı*[4] şəkilçili keçmiş zaman gələcək kontekstində yalnız Azərbaycan dilində işlənir. Keçmiş zamanın gələcək zaman yerində işlənməsi faktik olaraq gələcəyə aid olan hadisələrin artıq baş vermiş, icra olunmuş şəkildə təqdim edilmiş hərəkətlərin təsviri funksiyasını daşıyır. Misallar.

*Bu gün hələ sənə əl açır, amma* ***sabah*** *elə ki biləyi* ***bərkidi****, sənə əl açmayacaq, çıxaracaq bıçağı, nəyin varsa alacaq* («Ayna» qəzeti). *Vay o zamandan ki, çiçəklər* ***soldu****, o zaman ya mənim nəhayətimdir və yaxud mən bu dünyada yoxam* (C.Cabbarlı). *Kim bilir, bəlkə yenə də bir-birinizə* ***qismət oldunuz*** (İ.Əfəndiyev). *-Bəlkə haçansa, hardasa* ***görüşdük****» - dedi* (Anar). *Bəlkə sonradan iştaha gəldi* (İ.Şıxlı). *Bəlkə birdən atam* ***razı olmadı****? «Hələ ölməmişəm ki, malımı-dövlətimi dağıdırsan?» - deyə* ***qabağıma çıxdı****, onda necə olsun?* (İ.Şıxlı). *Bəlkə axşam qaranlıq qarışanda oğurlanıb xəlvəti sizə* ***gəldim*** (İ.Şıxlı). *-Bəlkə əliniz* ***boşa çıxdı****? -Onda gəlib apararıq* (İ.Şıxlı). *Bəlkə heç* ***gəlmədim****, nədi ki? -Gəray, tez gəlsən, gəl söhbət eliyək* (S.Səxavət). *Bəlkə heç toyunu* ***görə bilmədim*** (Anar).

Qarşılaşdırdığımız dillərdə gələcək zaman mikrosahəsinin ikinci dərəcəli morfoloji komponentləri arasında hər iki dil üçün kommunikativ yük daşıma cəhətdən az işləklik nümayiş etdirənlər felin şəxssiz formalarıdır. İngilis dilində gələcək zaman kontekstində felin şəxssiz formalarından yalnız infinitiv işlənir. Lakin onun işlənmə tezliyi çox aşağıdır. İnfinitivin gələcək zaman mikrosahəsində tutduğu yer ümumilikdə 0,2 % təşkil edir. Ona yalnız bədii üslubda təsadüf edilmişdir. Qəzet dilində infinitivin həmin funksiyada işlənməsi ümumiyyətlə müşahidə olunmamışdır.

---

[1] Əfəndiyeva T. Felin keçmiş zaman formaları. Bakı, 2005, s. 108.

Azərbaycan dilində felin təsriflənməyən formalarından feli bağlama və feli sifətlərin nisbi zaman bildirməsi haqqında yuxarıda danışılmışdı. Felin təsriflənməyən formalarının hərəkəti gələcək zamana aid etməsi əsas felin zaman referensiyası ilə müəyyən olunur. Azərbaycan dilində də feli sifət və feli bağlamanın gələcək zaman kontekstində işlənməsi çox az müşahidə olunur. Mikrosahə üzrə onların ümumi çəkisi müvafiq olaraq 0,32 və 0,42 % təşkil etmişdir.

İkinci dərəcəli morfoloji komponentlərin mikrosahə üzrə ümumi çəkisi qarşılaşdırılan dillər üzrə təxminən eyni olmuşdur: Azərbaycan dili üçün – 23,48 %, ingilis dili üçün – 22,17 %.

Beləliklə, Azərbaycan və ingilis dillərində gələcək zaman mikrosahəsinin qarşılaşdırılması göstərir ki, gələcək zaman hər iki dildə özünəməxsus cəhətlər nümayiş etdirir.

### 4.4. Dördüncü fəslə dair nəticələr

Dildə zamanın müxtəlif ifadə vasitələrinin bütün semantik zənginliyi və rəngarəngliyinə baxmayaraq, temporallıq sahəsinin əsas və başlıca ifadə vasitəsi kimi məhz morfoloji zaman və ya morfoloji temporallıq kateqoriyası hesab olunmalıdır, çünki zamanın morfoloji yolla ifadəsi temporal münasibətlərin reallaşmasında məcburiliyi, müntəzəmliyi və ümumiliyi ilə xarakterizə olunur. Gerçəkliyin zaman münasibətləri dildə ən ümumi şəkildə məhz fel formasında ifadə olunur.

Qarşılaşdırılan dillərdə morfoloji temporallıq kateqoriyası təsriflənən felin nitq momentinə münasibətdə eynizamanlılıq, öncəgəlmə və sonragəlmə kimi diferensial əlamətlərlə opozisiya əmələ gətirən qrammatik zaman sistemi ilə təmsil olunur. Semantik cəhətdən üç zonaya – keçmiş, indiki, gələcək zonasına bölünən temporallıq qrammatik (morfoloji) nöqteyi-nəzərdən qarşılaşdırılan dillərdə müxtəlif fel zamanlarına

üzvlənir. Morfoloji zaman formalarının müqayisəsi göstərir ki, hər bir mikrosahə əsas və ikinci dərəcəli morfoloji komponentlərə və dominant fel formasına malikdir. İngilis və Azərbaycan dillərində morfoloji nüvənin müqayisəsi belə qənaətə gəlməyə əsas verir ki, bu zonaya daxil olan komponentlər bir-birindən inventar və tezlik səciyyələrinə görə əhəmiyyətli dərəcədə fərqlənsələr də, funksional-semantik baxımdan oxşardırlar.

Azərbaycan dilində morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsi iki zaman forması ilə təmsil olunur. Onlar *-dı*[4] şəkilçisi ilə düzələn şühudi keçmiş zaman, *-mış*[4] və *-ıb*[4] şəkilçiləri ilə əmələ gələn nəqli keçmiş zaman formalarıdır; dominant rolu şühudi keçmiş zaman forması oynayır. İngilis dili üçün morfoloji keçmiş zaman mikrosahəsinin nüvəsini təşkil edən dörd formadan biri – *the Past Indefinite* forması digər üç analitik formadan fərqli olaraq keçmişlik mənasının ifadə ediilməsində dominant forma kimi çıxış edir.

Keçmiş zaman kontekstində işlənən ikinci dərəcəli morfoloji komponentlərin funksionallıq səviyyəsində də müəyyən fərqlərin olduğu aşkarlanmışdır. Başlıca fərq ondan ibarətdir ki, ingilis dilində ikinci dərəcəli komponentlərin inventarı Azərbaycan dilində olduğundan daha çoxdur.

Azərbaycan və ingilis dillərində indiki zaman mikrosahəsinin morfoloji strukturunda mühüm tipoloji struktur və funksional fərqlər də vardır. Mikrosahənin morfoloji nüvəsindəki əsas morfoloji komponentlər sayca fərqlənir: ingilis dilində mikrosahənin dörd (bir sintetik, üç analitik) indiki zaman formasına qarşılıq olaraq Azərbaycan dilində bir sintetik indiki zaman forması dayanır. Qarşılaşdırılan dillərdə nüvəətrafı zona komponentlərinin funksionallığında da oxşarlıq, demək olar ki, yoxdur. Burada, hər şeydən öncə, Azərbaycan dili üçün digər zaman formalarının (şühudi keçmiş və qeyri-qəti gələcək) indiki zaman sferasına keçməsində daha geniş im-

kanların olması, eləcə də felin təsriflənməyən formalarının funksionallığı müşahidə olunur. İngilis dilində isə göstərilən ifadə vasitələri indiki zaman kontekstində praktik olaraq işlənmədiyi üçün mikrosahənin nüvəətrafı zonası çox kasıb görünür və demək olar ki, burada yalnız felin vasitəli şəkillərinin işləndiyi hallarla təmsil olunur.

Azərbaycan və ingilis dillərində gələcək zaman mikrosahəsinin qarşılaşdırılması göstərir ki, gələcək zaman hər iki dildə özünəməxsus cəhətlərə malikdir. Bu cəhətlər hər iki dilin tipoloji xüsusiyyətləri ilə izah olunmalıdır. Analitik ingilis dilində bütövlükdə gələcək zaman mikrosahəsi daha az, Azərbaycan dilində isə daha çox qrammatikləşmə səviyyəsi ilə səciyyələnir. İngilis dilində az qrammatikləşmə səviyyəsi gələcək zamanın digər, yəni leksik ifadə vasitələrilə kompensasiya olunur.

# V FƏSİL

# SİNTAKTİK TEMPORALLIQ SAHƏSİ

## 5.0. Ümumi qeydlər

Biz əvvəlki fəsillərdə temporallığın dilə xas olan ifadə vasitələrindən bəhs etdik, bu fəsildə isə biz temporallığın nitqə xas olan ifadə vasitələri üzərində dayanacağıq.

Sintaktik temporallıq və ya sintaktik zaman mürəkkəb və az öyrənilmiş kateqoriyalardandır. Bu kateqoriyaya münasibət də müxtəlifdir. Sintaktik zaman anlayışı bəzi tədqiqatçılar tərəfindən qəbul edilir, bəziləri tərəfindən isə rədd edilir. Sintaktik zaman anlayışını keçmiş sovet dilçiliyinə akademik A.A.Şaxmatov gətirmişdir. Amma akademik V.V.Vinoqradov öz tədqiqatlarında bu kateqoriyanı daha dərindən öyrənmiş və sintaktik zamanı predikativliyi əmələ gətirən üç mühüm komponentdən biri saymışdır. O müəyyənləşdirmişdir ki, predikativlik ümumi qrammatik məna olaraq sintaktik modallıq, sintaktik zaman və sintaktik şəxs kimi xüsusi qrammatik mənalarda təzahür edir. Bu üç qrammatik məna bütövlükdə fikri gerçəkliklə bağlayır[1]. Müasir rus ədəbi dilinin qrammatikasında da akad. V.Vinoqradov ənənəsinə uyğun olaraq, sintaktik zaman obyektiv modallıqla vəhdət təşkil etməklə (yəni qrammatik zaman və şəkil kateqoriyalarının vəhdəti kimi) predikativliyi formalaşdıran kateqoriya hesab olunur[2].

Zaman cümlənin qrammatik əsasında predikativ əlamətin (əlbəttə, modal və şəxs səciyyəsi ilə birlikdə) tərkib hissəsi, həm də məcburi hissəsidir. Bu fikir dilçilər tərəfindən qəbul

---

[1] Виноградов В.В. Основные вопросы синтаксиса предложения (на материале русского языка) // Виноградов В.В. Исследования по русской грамматике. М., 1975, с. 267.

[2] Грамматика современного русского литературного языка. М., 1970.

olunmuşdur. Bununla belə, dilçilər bu kateqoriyanın həcmini və cümlədə zamanın ifadə olunduğu üsul və vasitələrin kəmiyyətini müxtəlif şəkildə müəyyənləşdirirlər. Məsələn, T.P.Lomtev cümlə səviyyəsində ifadə olunan sintaktik kateqoriyalar sistemini müəyyənləşdirmiş və həmin kateqoriyalar əsasında cümlənin sintaktik paradiqmasını tədqiq etmişdir[1]. Tədqiqatçının qənaətinə görə, onun müəyynləşdirdiyi sintaktik kateqoriyalar sistemi morfoloji kateqoriyalar sistemini təkrar etmir.

N.Y.Şvedova da sintaktik zaman kateqoriyasının mövcudluğunu qəbul edən və ona V.V.Vinoqradov ənənələri əsasında yanaşan tədqiqatçılardandır. Sintaktik zamanın mövcudluğunu əsaslandırmaq üçün onun gətirdiyi dəlillər maraqlıdır: «Birincisi, öz qrammatikasına görə dil abstraksiyalar sistemidir və bu sistemdə mücərrəd obrazlar bir-biri ilə mürəkkəb qarşılıqlı əlaqədədir; həmin mücərrəd obrazlarla sonsuz (leksik cəhətdən sərbəst obrazlar üçün) və məhdud sayda (leksik cəhətdən sərbəst olmayan obrazlar üçün) konkret vahidlər, yəni söz cildində ifadə edilmiş vahidlər qurula bilər. İkincisi, bütövlükdə dil nominasiyalar sistemidir (Nominasiya dedikdə, o, bildirməni (xəbərverməni) [=сообщение] yox, yalnız adlandırmanı, işarələməni [=обозначение] nəzərdə tutur. Nominasiyada isə müxtəlif dərəcədə və müxtəlif şəraitlərdə bilavasitə həm söz, həm söz-forma, həm söz birləşməsi, həm də cümlə iştirak edir. Bütün bu vahidlər dilin müxtəlif səviyyələrində adlandıra (işarələyə) bilir; həm də müxtəlif səviyyəli vahidlərin nominasiya sferasında qarşılıqlı əlaqəsi nəticəsində dildə elə adlandırma situasiyasıyaları hasil olmuşdur ki, həmin situasiyalarda söz-forma və ya söz birləşməsi adlandırmaqla eyni vaxtda «gizli (olaraq) bildirir (xəbər verir)». Üçüncüsü,

---

[1] Ломтев Т.П. Предложение и его грамматические категории. М., 1972, с. 126.

dil bilavasitə müşahidə və qavrayışlarda bizə verilən xəbərlərin [=сообщение] ardıcıllığıdır»[1].

Dilçilik ədəbiyyatında sintaktik zaman anlayışını qəbul etməyən fikir və mülahizələrə də rast gəlmək olar. Sintaktik zamanı qəbul etməyən tədqiqatçılar belə fikirlər yürüdürlər ki, sintaktik zamanda fellə bağlı olan morfoloji zaman özünü göstərir. A.Bondarko sübut və dəlillərə əsaslanaraq sintaktik zaman anlayışına daha sərt mövqedən yanaşmışdır[2]. O, sintaktik zamanı tamamilə özünəməxsus şəkildə anlayır və ondan sadə cümlənin qrammatik mənası kimi imtina edir. Tədqiqatçı etirazını ümumi şəkildə belə izah edir: morfoloji kateqoriyaların sintaksis səviyyəsinə keçirilməsi qanunauyğun deyildir: bu, morfoloji və sintaktik zamanların qarışdırılmasına, bununla birlikdə sintaksis sferasının həddən artıq şişirdilməsinə səbəb olur. Felin zamanlara görə dəyişməsi sadə cümlənin sintaktik strukturunda əksini tapmır, həmin struktur dəyişməz olaraq qalır. *Я здесь живу – жил – буду жить* tipli cümləları nümunə gətirən A.Bondarko bunu «əslində eyni cümlə modelinin morfoloji variantları», onun «morfoloji potensialı»nın reallaşması adlandırır. Bununla da o, cümlədə fel formalarının kontekstlə bağlı olan bütün fəaliyyət hallarını morfologiyaya və ya morfoloji kateqoriyaların fəaliyyət sahəsinə aid edir və belə nəticə çıxarır ki, bu, «funksional morfologiya» sahəsidir[3].

Son dövrün dilçilik ədəbiyyatında temporallığın morfoloji və sintaktik ifadə vasitələri müqayisəli şəkildə nəzərdən keçirilir, onların ümumi və fərqli cəhətləri qeyd olunur.

Rus dilində sintaktik zaman kateqoriyasını xüsusi bir səriştə ilə tədqiq etmiş T.Y.Şapovalova morfoloji və sintaktik zaman kateqoriyasının münasibəti barəsində yazır: «Sintaktik

---

[1] Шведова Н.Ю. Синтаксическое время // Филологические Науки, 1978, № 3, с. 90-91.
[2] Бондарко А.В. Теория морфологических категорий. Л., 1976, с. 16-25.
[3] Yenə orada, s. 23.

zaman felin morfoloji zamanına istinad etsə də öz təbiətinə görə ondan seçilir. Məlum olduğu kimi, morfoloji kateqoriya yalnız indikativ formalarda təzahür edir, sintaktik zaman kateqoriyası isə bütün cümlələrdə ifadə olunur. Bir sıra fel kateqoriyalarının qrammemləri öz aralarında calaşmır (birləşmir), məsələn, əmr və arzu (mümkünat – сослагательное наклонение) şəkillərinin formaları zaman kateqoriyasının qrammemləri ilə calaşmır (birləşmir). Lakin tərkibində həmin şəkillərin formaları olan söyləm və ya mətnlərdə temporal semantika başqa üsullarla ifadə olunur və bir çox hallarda həmin şəkillərin məzmunu verilmiş semantika barəsində heç də neytrallıq nümayiş etdirmir»[1].

T.Y.Şapovalova morfoloji zaman kateqoriyası ilə müqayisədə sintaktik zaman kateqoriyasının aşağıdakı xüsusiyyətlərlə səciyyələndiyini qeyd edir:

1. Sintaktik zaman cümlənin ayrıca ünsürlərinə deyil, bütövlükdə cümlənin özünə xasdır.

2. Sintaktik zaman cümlənin fakültativ yox, məcburi ünsürüdür.

3. Sintaktik zamanda ona daxil olan ünsürlərin semantikasından fərqlənən məzmun keyfiyyəti vardır.

4. Sintaktik zamanın morfoloji kateqoriyada olduğundan daha geniş və spesifik ifadə vasitələri vardır[2].

T.Y.Şapovalova sintaktik zamanın ifadə vasitələrindən danışarkən göstərir ki, cümlənin əsas qrammatik mənası kimi, sintaktik zaman mənası da cümlənin məzmun və formal-qrammatik tərkib hissələrinin qarşılıqlı təsiri sayəsində yaranır.

Cümlə gerçəkliklə canlı əlaqəni saxlayır[3]. Obyektiv gerçəkliyə aid olan məzmun ünsiyyət prosesində cümlədə onların

---

[1] Шаповалова Т. Е. Категория синтаксического времени в руском языке. М., 2000, с. 4.

[2] Yenə orada, s. 4.

[3] Кацнельсон С.Д. Типология языка и речовое мышление. Л., 1972, с.141.

təsəvvürləri vasitəsilə öz əksini tapır. Ünsiyyət prosesini qurmaq üçün danışanın öhdəsində sintaktik zaman mənalarının müxtəlif ifadə vasitələri vardır.

Göründüyü kimi, dilçilikdə sintaktik zaman kateqoriyasına münasibət birmənalı deyildir. Sintaktik zamana sadəcə fel zamanlarının, başqa sözlə morfoloji zamanın sintaksis səviyyəsinə keçirilməsi kimi yanaşanlar da var. Eyni zamanda həmin kateqoriyaya dildə zaman münasibətlərinin ifadəsi üçün istifadə edilən, funksional cəhətdən bir-birini tamamlayaraq çox mürəkkəb qarşılıqlı əlaqədə olan formaların sintaktik səviyyədə birləşərək dilin kommunikativ imkanlarını təzahür etdirən toplusu kimi yanaşanlar da vardır.

Biz öz tədqiqatımızda sintaktik zamana və ya sintaktik temporallığa real zamanın insan təfəkküründə inikası olan perseptual zamanın dildə sintaktik vasitələrlə ifadə vasitələrinin məcmusu kimi yanaşırıq. Həmin sintaktik ifadə vasitələri isə müxtəlifdir. Belə bir yanaşma temporallığın funksional-semantik sahə kimi tədqiq edilməsi ilə tamamilə uyğundur.

Mülahizə, fikir bir neçə zaman göstəricisindən eyni vaxtda istifadə edilməklə qurulur, bu vaxt həmin zaman göstəricilərinin bir-birini əvəz etməsi, birinin digərinə nisbətən daha ümumi, digərinin daha konkret kommunikativ məqsədlərə xidmət etməsi müşahidə olunur. Bütün bu mürəkkəblik və çoxaspektlilik ümumi zaman anlayışının çoxaspektliliyi və mürəkkəbliyi ilə bağlıdır. Zaman münasibətlərini ifadə etmək üçün istifadə olunan formalar funksional cəhətdən bir-birini tamamlayır. Başqa dil vasitələri kimi, onlar də mərkəzdə və ucqarda olmaları ilə bir-birindən seçilir.

Qarşılaşdırdığımız dillərdə, eləcə də türkoloji dilçilikdə sintaktik temporallığın ifadə vasitələrinin öyrənilməsi vəziyyətinə nəzər salmaq faydalı olardı.

İngilis dilində sintaktik zaman kateqoriyasının ifadə vasitələri iki əsərdə tədqiqat obyekti kimi seçilmişdir. Bunlar

T.A.Vinoqradovanın “Müasir ingilis dilində temporal münasibətlərin sintaktik ifadə vasitələri” və N.V.Petraşın “Müasir ingilis dilində temporal sintaksemlər” namizədlik dissertasiyalarıdır.

T.A.Vinoqradovanın tədqiqatında ingilis dilində cümlənin sintaktik-semantik ünsürlərindən biri olan temporal mənalı genişlənmənin struktur və semantik xarakteristikası yenidən işıqlandırılır, temporal genişlənmə yeni nöqtəyi-nəzərdən təsvir edilib sistemləşdirilir. Tədqiqatçı göstərir ki, temporal genişlənmə vasitəsilə cümlədə temporal mənalar verilir[1].

N.V.Petraşın dissertasiyasında ingilis dilində temporallığın sintaktik-semantik əlaməti olan elementar sintaktik vahidlər, sintaksemlər tədqiq olunmuşdur. Burada ilk dəfə olaraq temporal sintaktik vahidlər diferensial sintaktik-semantik əlamətlərin məcmusu kimi nəzərdən keçirilmişdir. Həmin əlamətlərin sayı 14-ə çatır. Tədqiqatda həmin əlamətlər əsasında formalaşmış 38 sintaksem fel və isimlərin yanında işlənmə nöqteyi-nəzərindən təhlil olunur. Burada həmin 38 substansial temporal sintaksemin variantlar sistemi də nəzərdən keçirilmişdir.

P.A.Suçkova və N.V.Petraşın “Temporal indefinit sintaqmlar” məqaləsində həmin vahidlərin xarakterik xüsusiyyəti onların məzmununda hansısa kateqorial əlamətin (substansiya, kvalifikasiya, yaxud proses əlamətlərinin) olmaması kimi müəyyənləşdirilir[2].

Müəlliflər qeyd edirlər ki, dilçilikdə mürəkəb söz və söz birləşməsinin sərhədləri indiyədək tam həll olunmamış qalır.

---

[1] Виноградова Т.А.Синтаксические средства выражения темпоральных отношений в современном английском языке. Автореф. дисс. ... канд. филол. наук., М.,1982, с. 3.

[2] Сучкова П. А., Петраш Н. В. Темпоральные индефинитные синтагмы // Проблема синтаксиса словосочетания и предложения в современном английском языке. Пятигорск, 1987, с. 166-179.

Belə hallarda orfoqrafiya mürəkkəb sözün sərhədlərinin müəyyənləşdirilməsində etibarlı meyar ola bilmir (müq. et: *someday, sometime, some-time, some-day*). Söz birləşməsi və sözün ayırd edilməsi üçün yaradılmış meyarlar sistemi bütün halları ehtiva etmir. Faktik materialın təhlilindən aşkar olur ki, temporal indefinit sintaqmların çox vaxt öz variantlar sistemi olur: *someday / some day sometime / some time* variantlarından savayı belələrinə də rast gəlmək olur: *at some time, some time or an another time*[1].

Azərbaycan dilçiliyində də sintaktik temporallığın ifadə vasitələrinin öyrənilməsinə tədqiqat işləri həsr olünmuşdur.

Azərbaycan dilində zaman anlayışının sintaktik vahidlərlə ifadəsinə həsr etdiyi namizədlik dissertasiyasında A.Ş. Məmmədova mürəkkəb cümləni tədqiqat obyekti kimi götürmüşdür[2]. Həmin dissertasiyada tabesiz mürəkkəb cümlədə zaman əlaqəsi, zaman münasibətləri araşdırılır. Müəllifin fikrinə görə, tabesiz mürəkkəb cümlənin komponentləri arasında zaman münasibətləri özünü eynizamanlı və müxtəlifzamanlı olmaqla iki formada göstərir. Tədqiqatda tabeli mürəkkəb cümlələr də zaman anlayışı baxımından araşdırılmışdır. Bəllidir ki, zaman anlayışını cümlə səviyyəsində reallaşdıran sintaktik struktur zaman budaq cümləsidir. Ona görə də tədqiqatçı zaman budaq cümləli tabeli mürəkkəb cümlənin araşdırılmasına ayrıca bölmə ayırmışdır. Zamanın ifadəsi başqa tipli budaq cümlələrdə də diqqətdən kənarda qalmamışdır.

Azərbaycan dilçiliyində zamanın sintaktik vasitələrinə dair aparılmış işlər müqayisəli xarakter daşımışdır. Bu məsələnin öyrənilməsinə həsr olunmuş tədqiqatlar ayrıca olaraq

---

[1] Сучкова П. А., Петраш Н. В. Темпоральные индефинитные синтагмы // Проблема синтаксиса словосочетания и предложения в современном английском языке. Пятигорск, 1987, с. 167

[2] Мамедова А.Ш. Понятие времени и его выражения в азербайджанском языке синтаксическими единицами, АКД, Баку, 1990.

Azərbaycan dilinin materialları əsasında deyil, əsasən qohum və ya qohum olmayan dillərin materialları əsasında aparılmışdır. Məsələn, G.L.Rəfibəyli ingilis və Azərbaycan dillərində sintaktik temporallığın ifadəsində mühüm rol oynayan feli sifət və feli bağlama tərkiblərini öyrənməklə bu iki müxtəlifsistemli dildə felin təsriflənməyən formalarının nomenklaturasını, həmin formaların uyğunluq dərəcələrini, fərqli və oxşar cəhətlərini müəyyənləşdirmişdir[1].

M.M.Musayev tədqiqatını cənub-qərb qrupu türk dillərində zaman budaq cümləsi və zaman mənalı feli sifət və feli bağlama tərkiblərinə həsr etmişdir[2].

D.X.Şadmankulova və K.Cumabayevin əsərlərində başqa türk dillərinin və Hind-Avropa dillərinin materialları əsasında sintaktik temporallığın ifadə vasitələri kontrastiv şəkildə təhlil edilir[3].

Beləliklə, məlum olur ki, sintaktik temporallığın ifadə vasitələri müəyyən qədər tədqiq edilmişdir. Lakin həmin tədqiqatlarda çatışmayan cəhətlər, fikrimizcə, onların sahə tədqiqatlarına uyğun aparılmamasıdır. Əslində onlardan bunu gözləmək də düzgün olmazdı, çünki qeyd olumuş tədqiqatlar ayrı-ayrı kateqoriyaların araşdırılmasına həsr olunmuşdur. Sahə tədqiqatları isə dilin müxtəlif səviyyəli vahidlərinin müəyyən invariant mənanı ifadə etməsi yönümündən aparılan araşdırmalar olub sistemli xarakter daşıyır.

---

[1] Rəfibəyli G.L. İngilis və Azərbaycan dillərində feli tərkiblər. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 2004.

[2] Мусаев М.М. Придаточные предложения времени и причастные и деепричастные обороты с временном значением в тюркских языках юго-западной группы, АКД, Баку, 1980.

[3] Шадманкулова Д. Х. Способы и средства выражения временных отношений в современном узбекском языке, АКД, Ташкент, 1990,; Джумабайев К. Сложноподчиненные предложения с придадочными времени и причины в современном немецком языке и их соответствия в киргизском языке. АКД, Фрунзе.

### 5.1. Temporallığın ifadəsini reallaşdıran sintaktik strukturlar

Qarşılaşdırdığımız ingilis və Azərbaycan dillərində temporallıq müxtəlif səciyyəli sintaktik vahidlər vasitəsilə reallaşır. Bura söz birləşmələri, tərkiblər, sadə və mürəkkəb cümlələrin müxtəlif tipləri (təktərkibli cümlə, zaman budaq cümləsi, budaq cümlələrin bəzi tipləri) və onların tərkib hissələri aiddir.

Qeyd etmək lazımdır ki, adları çəkilən konstruksiyalar təkcə yekun roluna, funksiya səciyyəsinə görə yox, həm də həmin rolları həyata keçirən forma xüsusiyyətlərinə görə diqqətəlayiqdir. Bundan başqa, sintaktik temporallığın mühüm əlamətlərindən biri də müvafiq zaman vahidlərinin aid olduğu cümlə üzvü, cümlənin tərkib hissəsidir. Bu cəhət də nəzərə alınmalı aspektlərdən biridir.

#### 5.1.1. Temporal söz birləşmələri

Tədqiq etdiyimiz dillərdə söz birləşmələri rəngarəng ifadə vasitələrinə və əmələgəlmə üsullarına malikdir. Həmin birləşmələrin ifadə vasitələri və əmələ gəlmə üsulları elmi ədəbiyyatda geniş şəkildə izah olunduğuna görə[1], onlar üzərində dayanmayacağıq. Bu məsələdə bizi maraqlandıran Azərbaycan və ingilis dillərində sintaktik temporallıq sahəsinin komponentlərindən biri olan temporal birləşmələrin əmələ gəlməsi və ifadə üsulları, onların oxşar və fərqli xüsusiyyətləridir.

---

[1] Bax: Seyidov Y. Azərbaycan dilində söz birləşmələri, Bakı,1992; Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis, 2000; Смирницкий А.И. Синтаксис английского языка. М., 1957, с. 55-70; Бархударов Л.С. Структура простого предложения современного английского языка. М., 1966, с. 44-136.

### 5.1.1.1. Azərbaycan dilində temporal söz birləşmələri

Söz birləşmələri aid olduğu dilin müəyyən sintaktik qaydaları əsasında sözlərdən təşkil olunmuş nitq vahidləridir. Bunlara həm sözün dar mənasında söz birləşmələri, həm də cümlələr aiddir.

Azərbaycan dilində sintaktik temporallığın ifadəsinə xidmət edən söz birləşmələri arasında təyini söz birləşmələri geniş yer tutur. Əldə olan materialların təhlili göstərir ki, Azərbaycan dilində temporal söz birləşmələri təyini söz birləşmələrinin hər üç tipi üzrə yaranır. Bundan başqa, mürəkkəb təyini söz birləşməsi və təktərəfli təyini söz «birləşməsi» tipində yaranan temporal ifadələrdən də danışmaq mümkündür.

Mürəkkəb təyini söz birləşməsi yaxşı məlum olan və geniş yayılmış nitq hadisəsidir, onun isbata, izahata ehtiyacı yoxdur. Təktərəfli təyini söz birləşmələrinə zaman anlayışlı ifadələrdən *səhərisi, ertəsi* tipli formaları misal göstərə bilərik.

#### 5.1.1.1.1. Birinci növ təyini söz birləşməsi şəklində olan temporal ifadələr

Bildiyimiz kimi, birinci növ təyini söz birləşməsinin tərəfləri heç bir şəkilçinin köməyi olmadan tabelilik əlaqəsi əsasında birləşirlər. Həmin üsul yanaşma əlaqəsi adı ilə məlumdur. Belə birləşmələrdə birinci tərəf təyinedici vəzifə daşıyır.

Birinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı ifadələrin ikinci tərəfi əsasən zaman adları ilə ifadə olunur: *zaman, vaxt, an, gün, həftə, ay, il, gecə, səhər, saat, dəqiqə, saniyə* və s.

Birinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələrin birinci tərəfi kimi əvəzliklərin bəzi məna qrupları, saylar (əsasən miqdar sayları), sifətlərin bəzi semantik tipləri və s. çıxış edir. Beləliklə, birinci tərəfin ifadə vasitə-

ləri bir çox sintaktik vahidlərin əmələ gəlməsi zamanı təkrar olunur. Bu o deməkdir ki, belə təyini söz birləşməsinin semantik-sintaktik siması ikinci tərəfin ifadə vasitələri ilə müəyyənləşir. Ona görə də birinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələrin sintaktik strukturunda ikinci tərəf əsas rol oynayır. Bu səbəbdən biz aşağıda müvafiq sintaktik konstruksiyaları məhz ikinci tərəfə görə nəzərdən keçirəcəyik.

***Zaman*** sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələri: *bu zaman, o zaman, bir zaman, çox zaman, xeyli zaman, son zaman(lar), axır zaman(lar), hər zaman, heç zaman* və s.

***Bu zaman*** *o, təəccüblə üzümə baxar və heç bir söz deməzdi* (İ. Əfəndiyev). ***O zaman*** *mənim on yaşım olardı* (Dan.); ***O zaman*** *bic doğulmuş bəzi vəzifə, kreslo, kabinet sahibləri və düşgünləri onun varlığından, yorulmazlığından narahat olurdular* (S. Səxavət). *Nadir hallarda özlərindən çıxırlar ki,* ***o zaman*** *onların qabağında durmaq olmaz* (S.Səxavət). ... *Biz Vətən qarşısında öz borcumuzu həmişə yerinə yetirə bilməsək də, nə qədər dönük, bəzən etibarsız çıxsaq da, Vətən bizi* ***hər zaman*** *bağışlayır* («Şərq» qəzeti). *Amma Vətən bizdən* ***heç zaman*** *qisas almaz* («Şərq» qəzeti). *Ələlxüsus bu* ***axır zamanlar*** *içində şeytan olan adamın sayı yaman çoxalır, İsfəndiyar kişi...* (İ.Hüseynov). *Aleksey Osipoviç arvadının* ***çox zaman*** *yuxuda çatılan qaşlarına, alnındakı düyünlərə, çöhrəsindəki hüznə ürək ağrısı ilə tamaşa edirdi* (İ.Şıxlı).

***Vaxt*** sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələri: *bu vaxt, bir vaxtlar, o vaxt, o vaxtlar, bir vaxt, bir vaxtlar, xeyli vaxt, çox vaxt, axır vaxtlar, son vaxt, son vaxtlar, ayrı vaxt, özgə vaxt, hansı vaxt, hər vaxt, heç vaxt* və s.

*Birdən başa düşdüm ki, Mədinə nəyə isə qulaq verir. Mədinə telefonu dinləyirdi.* ***Bu vaxtlar*** *o, zəng edərdi* (Anar). ***O vaxt*** *zaman, dövr bax, bunu diktə eliyirdi* (S.Səxavət). ***O***

***vaxtlar*** *həkim deyənə şübhə ilə baxırdılar ki, havalanıb – həkim nə gəzirdi* (S.Səxavət). ....*Cavan tacir* ***bir vaxt*** *ac-yalavac bir yetim idi* (Elçin); ***Çox vaxt*** *söhbəti mən özüm salırdım,...* (Anar). ... ***Axır vaxtlar*** *hiss edirdim ki, mənim söz açmağıma ehtiyac qalmır* (Anar). ***Xeyli vaxt****dır yarın fərağındayam* (Vaqif). *Haqqı olmayanlar* ***heç vaxt*** *doğulmayacaqlar, heç vaxt doğula bilməyəcəklər* (S.Səxavət). *Onu* ***heç vaxt*** *üzünü görmədiyi atası səslədi* (Elçin).

*Heç vaxt* temporal birləşməsinin *heç vədə* kimi semantik və *heç bir vaxt* kimi semantik-sintaktik sinonimi vardır. Məsələn:

*Bilirdim ki, o daha* ***heç vaxt*** *zəng eləməyəcək. Xeyli fikir edib anladı, qandı ki, padşah* ***heç bir vaxt*** *ölüb-eləyən deyil* (Anar). *Axı onu necə başa salaydım ki, bu* ***heç bir vaxt*** *mümkün olmayacaq?* ***Heç bir vaxt*** *bizim heç birimiz onun həlak olmuş ərinin yerini tuta bilməyəcəyik. Mən* ***heç bir vaxt*** *vicdanımın əksinə getmərəm,* ***heç vədə*** *elə söz demərəm ki, vicdanım onu qəbul eləməsin* (Anar).

Bu cür geniş yayılmış üsullardan başqa, *vaxt* sözü nisbətən az məhsuldar olan üsullarla da birinci növ təyini söz birləşmələri əmələ gətirir. Bu halda söz birləşməsinin birinci tərəfi sifət, feli sifət və s. tipli sözlərlə ifadə olunur. Məsələn:

***Ayıq vaxtımda*** *zəng elədim ki, mənim haqqımda yanlış təsəvvürünüz olmasın. «Zərər yoxdur,* ***həmişəki vaxt*** *zəng edərəm, qoy, sürpriz olsun». Təsadüfən* ***evdə oldüğü vaxt****, çarpayısında dincəldiyi zaman mənim «şerimi» eşidib və cavab verib* (Anar). *Pakizə bu cür yarışirin, yarıxəyali* ***xatirələrlə yaşadığı vaxt*** *ikinci bir hadisə baş verdi* (İ.Şıxlı).

Zaman ifadə etmək *vaxt* sözünün nominativ funksiyasıdır, lakin sintaktik zaman ifadə etmək üçün bu, kifayət deyildir. Nitqdə *vaxt* sözü çox zaman kommunikasiyanın məqsədlərindən asılı olaraq müvafiq dildənxaric gerçəkliyi subyekt, ob-

yekt və s. kimi təqdim edir. Bu xüsusiyyət bəzi hallarda onun sintaktik törəmələrinə də keçir. Məsələn:

***Vaxtınızı*** *çox almadım ki?* (Dan.) ... *Diksinməyə* ***vaxt*** *qalmamışdı. Onun söz dinləməyə, Dədə Qorqud boylarına qulaq asmağa əməlli-başlı* ***vaxtı*** *olmamışdı* (Elçin). *Bax ha, gecikmə,* ***vaxtında*** *gəl* (Dan.). – *Axşamın xeyir!* – *Hər* ***vaxtın*** *xeyir.*

*Gün* sözü *o, bu, həmin* işarə əvəzlikləri, *bir* qeyri-müəyyən miqdar sayı, eləcə də konkret miqdar saylarının köməyi ilə müxtəlif səciyyəli birinci növ təyini söz birləşmələri yaradır: *bu gün, o gün, həmin gün, bir gün, hər gün* və s.

***Bu gün*** *də biz Rasimi itiririk. Mənə elə gəlir ki,* ***bu gün*** *onun toyu yox, yasıdır. Amma* ***bu gün*** *radiomun qapağı xarab olub. Hə,* ***bu gün*** *idarəmizə təzə şöbə müdiri gəlib. Deməli,* ***bu gün*** *ayıqsınız* (Anar)

Bu ifadə ilə əlaqədar olaraq bir məsələni qeyd etmək lazımdır. *Bu gün* ifadəsi özünü həm leksik vahid, mürəkkəb söz kimi, həm də sintaktik vahid, birinci növ təyini söz birləşməsi kimi göstərir. Onun birinci növ təyini söz birləşməsi olması xüsusi sübut tələb etmir. Bu statusda o, *o gün* söz birləşməsi ilə qarşılıq münasibətində olmaqdan savayı, onunla və *həmin gün* birləşməsi ilə eyni sintaktik struktur (işarə əvəzliyi + isim, ad) nümayiş etdirir. Digər tərəfdən, *bu gün* ifadəsi *dünən, srağagün, ta srağagün, sabah, biri(si)gün, ta biri(si)gün* sözlərinin əmələ gətirdiyi silsiləyə daxildir və burada o, özünü leksik vahid, mürəkkəb söz kimi göstərir. Müq. et: ***Bu gün-sabah*** *hərə qaçar bir yana* (Zakir).

Təsadüfi deyildir ki, bir çox dillərdə «bu gün» mənasına gələn ifadələr mürəkkəb söz hesab edilir və bitişik yazılır. Azərbaycan dilinin orfoqrafiya qaydalarında *bu gün* mürəkkəb sözünün həmin statusu nəzərə alınmamışdır.

***O gün*** *niyə dəstəyi asdın?! Sənin acığına bu gün Seymur məni evə ötürdü. Bəlkə də* ***o gün*** *məni evinə dəvət etsəydi, hər*

*şeyi ona deyəcəkdim* (Anar). *İnternat uşaqlarından fərqli olaraq, o, evdə qalırdı,* ***hər gün*** *odun gətirib satır, ailəyə kömək eləməyə çalışırdı* (S.Səxavət). ***Bir gün*** *zəng eləyib ona deyəcəklər ki, səni işdən çıxarıblar* (Anar). *Döz, hövsələn olsun,* ***bir gün*** *tez,* ***bir gün*** *gec hər şey qaydasına düşəcək* (Dan.). *Günlərin xüsusi çəkisi gündən-günə ağırlaşırdı. Bəzən bir həftənin, bir ayın, bir ilin ağırlığı bir günün boynuna düşürdü –* ***həmin günün*** *ağırlığı da adamların boynuna düşürdü, adamların boynu əyilirdi.* (S.Səxavət). *Mən dəstəyi asdım.* ***Üç gün*** *ona zəng eləmədim (Anar). – Sənə* ***neçə gün*** *süd verim? Üç ay, yoxsa* ***ü-ü-üç gün****? –* ***Ü-ü-üç gün*** («Dovşan» nağılı).

Sonuncu nümunədə birinci tərəf rolunda digər saylar da çıxış edə bilər. Məsələn: *beş gün, on gün, iyirmi gün*.

*Bütün gün(ü)* – Bu təyini söz birləşməsi nitqdə bir qayda olaraq *bütün günü* şəklində işlənir:

***Bütün günü*** *yüz əlli iki min işlə məşğul oldum və hər şeyi unutdum* (Anar). *Və yaxud* ***bütün günü*** *kipriyi ilə od götürən anası daş kimi düşüb yatanda onun ağlaya-ağlaya qışqırığını eşidib vaxtında döşünə salmayacaq, «kişinin» halal-hümmət südünü verməyəcək, o da haqqını tələb etməyə başlayacaq və...* (S.Səxavət). ***Bütün günü*** *açıq havada, bağda, ağaclarlayam, dirrik, bostanda çalışıram* (S.Əhmədli)

Həmin sintaktik konstruksiyada müşahidə olunan affiksal morfem heç də yerinə düşmür. O həm mənsubiyyət şəkilçisinə, həm də təsirlik hal şəkilçisinə oxşayır. Lakin onların heç biri birləşmənin sintaktik-morfoloji təbiəti ilə şərtlənmir. Mənsubiyyət şəkilçisi təyini söz birləşməsində birinci tərəfin isimlə ifadə olunduğu hallarda lazım gəlir. Onun təsirlik hal şəkilçisi olmasına gəldikdə isə, qeyd etmək lazımdır ki, *məşğul olmaq* feli təsirsizdir, ona görə də təsirlik halda olan obyekt tələb etmir. Buna baxmayaraq, buradakı *–ü* şəkilçisini məhz hal şəkilçisi kimi qiymətləndirmək olar. Təsirsiz fellər özlərinə

aid olan sözlərin təsirlik halda olmasını tələb etməsə də, bu heç də istisna olunmur. Bu münasibətlə təsirli fellərin qeyri-müəyyən təsirlik halda olan sözlərlə işlənməsini yada salmaq olar.

*Gün* sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələri bir çox hallarda *gecə* sözünün iştirakı ilə yaranmış müvafiq birinci növ təyini söz birləşməsinə əks məna yaradır, yəni *gün* sözü o halda «gündüz» mənasında işlənir: *Sən olanda **üç gün-üç gecə** ayaq üstə olmuşam* (Dan.)

*Gecə* sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələri qrupuna aşağıdakıları daxil etmək olar: *bu gece, o gecə, həmin gecə, bir gecə, hər gecə* və s.

***Bu gecə** xəstə yaxşı yatıb* (Dan.) ***O gecə** sən də sözünü dedin* (Dan.) *O gecənin xatirəsi səni yüz il yaşatmağa layiqdir* (İ.Əfəndiyev). *İş ondadır ki, bufetçik orda ölməyib, evinə gəlib, **həmin gecə** ürəkdən ölüb* (Anar). *İndi mən **hər gecə** sənin yuxuna girəcəyəm. ... Deyirlər, Məhin Banu **hər gecə** yüz kişinin yuxusuna girirmiş* (Anar). Həmçinin müq. et: ***Hər gecəm** oldu kədər, qüssə, fəlakət sənsiz* (Nizami).

*Bütün gecə(ni) – **Bütün gecəni** sizə zəng vurmuşam* (Anar)

Yuxarıda *bütün günü* təyini söz birləşməsi dediklərimizin bəziləri bu birləşməyə də aiddir.

*Axşam* sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələrinə aşağıdakılar aid edilə bilər: *bu axşam, o axşam, həmin axşam, hər axşam, hansı axşam* və s.

*Yaxşı ki, zəng elədiniz, yoxsa **bu axşam** mən də yaman darıxırdım. Bax biz hamımız burdayıq, bir yerdəyik, kefimiz də sazdır. Amma gəlin fikirləşək – görək , **bu axşam** tək qalanlar neyləyir?* (Anar). ***O axşam** işdən sonra məni evə dəvət etdi. Bura bax, Səmayə sən **o axşam** hansı rəqəmi deyirdin? – Hansı axşam, nə rəqəm?* (Anar).

*Səhər* sözünün iştirakı ilə yaranan birinci növ təyini söz birləşmələri qrupuna aşağıdakı birləşmələri aid etmək olar: *bu səhər, o səhər, bir səhər, hər səhər, həmin səhər* və s.

***Bu səhər*** *danaotaran uşaq qabağıma çıxıb* (Dan.). ***Hər səhər*** *Gülzarın səsi gəlir* (Dan.) ***Hər səhər*** *ərşə çıxar ah ilə əfğanım mənim.* ***Bir səhər*** *ferma müdirinin maşını dayandı məktəbin həyətində, ferma müdiri özü gəlmişdi* (S.Əhmədli).

*Saat, dəqiqə* sözlərinin iştirakı ilə düzələn birinci növ təyini söz birləşmələri: *bu saat, o saat, həmin saat, hər saat, bu dəqiqə, o dəqiqə, həmin dəqiqə, hər dəqiqə* və s.

*Bu saat, o saat, bu dəqiqə, o dəqiqə* tipli birləşmələr daha çox məcazi mənada işlənmələri ilə seçilir. Bütövlükdə bu söz birləşmələri hərəkətin qısa müddət ərzində baş verməsinə işarə edir:

***Bu saat****, Seymur. Sənə əntiqə musiqi tutacağam. Mən* ***bu saat*** *ən yaxın yoldaşımın toyundan çıxmışam* (Anar). *Bu ağac* ***bu saat*** *ovulub töküləcəkdi* (Elçin).

Misalların birincisində *bu saat* «əlüstü, dərhal» mənasına gəlir. İkinci misalda o, ən yaxın keçmişə, üçüncü nümunədə isə ən yaxın gələcəyə aid olan zaman məqamını bildirir. Həmçinin müq. et: *Ünvanınızı deyin,* ***bu saatca*** *gəlim ora. Mənə xoşdur ki, müəyyən saatlarda zəng gözləyirəm.*

*O saat –* ***O saat*** *görünür ki, çox çabalayıb* (Ə.Əmirli).

*Hər dəqiqə – Amma gərək adamın ağlı başında olsun. Xoruz kimi atılmasın* ***hər dəqiqə*** *ortalığa. O hər zəngdən, hər hərəkətdən diksinirdi. Yəqin, ona elə gəlirdi ki, bu mina-telefon* ***hər dəqiqə*** *bir bəd xəbərlə partlaya bilər* (Anar).

Deyilənləri yekunlaşdıraraq qeyd etmək lazımdır ki, həmin sözləri iki qrupa ayırmaq olar:

1. müstəqil olaraq sintaktik zaman bildirənlər: *axşam, gecə, sabah, səhər* və s.

2. yalnız müəyyən sintaktik funksiyalarda və konstruksiyaların tərkibində sintaktik zaman bildirənlər: *bu gün, gündə, bu il, ildə* və s.

*Saat, dəqiqə* sözləri məhz ikinci qrupa aid edilə bilər. Lakin bu qəbildən olan ifadələr yalnız sadaladıqlarımızla məhdudlaşmır. Bu sıraya *an, dəm, dəfə, səfər, müddət* və s. sözləri də əlavə etmək olar. Onların bəziləri yalnız konstruksiya, söz birləşməsi tərkibində zaman bildirir, təklikdə isə bu məqsədlə işlənmirlər. Məsələn:

***Bir dəfə*** *soruşdu* (Anar). ***Bu dəfə*** *üstün vurmuram, bir də belə şey eləmə* (Dan.). ... *amma* ***bir an*** *mən də şübhələndim, mən də gözlədim və mən də möcüzə arzuladım – istədim telefon səslənsin. O bir an susdu* (Anar). *O axşam işdən sonra* ***ilk dəfə*** *məni evinə dəvət etdi* (Anar). *O bilirdi ki,* ***bu dəm*** *qız-gəlinin başının üstündə dayanıb.* ***Bu dəm*** *meşəyə gün dəydi* (Elçin). *Köksü gözəl o dağlardakı meşədə* ***o dəm*** *sarı bülbül dünyanın ən cəhcəhli nəğməsini oxudu* (Elçin). ***Bir vədə*** *gördüm ki, iş-işdən keçib* (Dan.). *Yaxşı padşah* ***heç vədə*** *öz rəiyyətinə güldən ağır söz deməmişdi. Mən ... dörd rəqəmi yığa bilərəm, amma* ***heç vədə*** *son rəqəmi – beşincini yığmayacağam* (Anar). *Ya bəlkə,* ***bu səfər*** *danışan başqa adamdır*? (Anar). ***O səfər*** *sən nə deyirdin?* (Dan). ***Keçən səfər*** *evlənənin başqa dostu təklikdən şikayət edir. And olsun ki,* ***keçən səfər*** *səsim sərxoş səsi idi, onunçün tanımadınız* (Anar). *Yaxşı, Seymur, sənin toyunu haçan eləyirik?* ***Uzaq gələcəkdə*** (Anar). *Dəniz bağına getdim,* ***uzun müddət*** *adamsız bulvarı dolandım* (Anar).

Birinci növ təyini söz birləşmələri *il, ay, həftə* sözlərinin iştirakı ilə də yaranır: *bu il, o il, keçən il (bildir), gələn il, cari il, iki il, yeni il, bu ay, keçən ay, beş ay (və s.), bu həftə, keçən həftə, gələn həftə* və s.

*Yeni il* – Bu ifadə yalnız ismin yerlik və çıxışlıq hallarında sintaktik zaman bildirir. Qalan məqamlarda isə müvafiq za-

manı ifadə etmək onun (ifadənin) yalnız nominativ funksiyasını təşkil edir. Məsələn, müqayisə edək:

***Yeni ildə*** *mən Sizə vacib bir şey demək istəyirəm. –* ***Yeni ildən*** *harda işləyəcəksən? O da, yəqin ki, hardasa* ***yeni ili*** *qarşılayır.* ***Yeni ili*** *Firuzgildə qarşılayırdıq.* ***Yeni il*** *pis başlamır. İstədim ki, (onun)* ***yeni ilini*** *Moskva vaxtı ilə təbrik eləyəm. ... Praqa vaxtıyla* ***yeni ilini*** *təbrik etmək istədim. ... Hansı vaxtla* ***yeni il*** *idi, bilmirəm, bəli, Qrinviç vaxtıyla. Sizi Atlantik* ***yeni iliylə*** *təbrik edirəm* (Anar).

*Qəzənfər öləndən sonra ailə* ***iki il*** *yeni ili qeyd etmədi* (Anar). Müq. et: ***Bu il*** *tarixi il olacaq* (Anar). ***Bu ay****, deyəsən, havalar yaxşı keçəcək* (Dan.). *N. bu il konkursdan keçmədi;* ***gələn il*** *genə sənədlərini hazırlayıb verəcək* (Dan.). ***Hər il*** *deyir ki, gələn Novruzda, gələn Novruzda...(*S.Səxavət). ***Gələn həftə*** *də bir bəhanə tapıb Ofelyanı xəbərdar etdi. Amma* ***gələn həftə*** *görüşə biləcəklərmi?* (Anar). ***Hər həftə*** *ata-anasıyla telefonla danışır, hər bayramda təbrik məktubları göndərirdi* (Anar).

Beləliklə, biz görürük ki, birinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələr temporallığın ifadəsində çox mühüm rol oynayır.

### 5.1.1.1.2. İkinci növ təyini söz birləşməsi şəklində olan temporal ifadələr

İkinci növ təyini söz birləşməsi «qeyri-müəyyən yiyəlik halda olan söz (ad) + mənsubiyyət şəkilçili söz» modeli üzrə əmələ gəlir. Bu zaman ikinci tərəf yalnız üçüncü şəxsə aid olan mənsubiyyət şəkilçisi qəbul etməlidir: başqa şəxslərə aid olan mənsubiyyət şəkilçisi birinci tərəfin müəyyən yiyəlik halda olmasını tələb edir.

İkinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələr, demək olar ki, sintaktik zaman bildirmək

zərurəti ilə bağlı deyildir. Onlarda nominativ funksiya birinci yerdə durur. Təsadüfi deyildir ki, onların bir qismi dilin leksik sistemində günlərin, günün hissələrinin adı kimi qərarlaşmışlar.

Bu qəbildən olan ifadələr daha bir cəhətinə görə diqqəti cəlb edir. Onlara xas olan əmələgəlmə üsullarının bəziləri bir-iki nümunə ilə, bəziləri isə çoxlu sayda nümunələrlə təmsil olunmuşdur. Başqa sözlə desək və morfologiyada şəkilçilər barəsində işlənən «məhsuldar» və «qeyri-məhsuldar» ifadələrini burada tətbiq etsək, həmin əmələgəlmə üsullarının «məhsuldar» və «qeyri-məhsuldar» olmasından danışa bilərik.

Burada həmin ifadələri biz göstərilən əlamətə görə təsnif etmirik, çünki artıq onların sayı bu məsələni əyani olaraq nümayiş etdirir. Bundan başqa, ikinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələrdə tərəflər öz funksiyalarına görə aşağıdakı kimi səciyyələnir: birinci tərəf daha çox zaman adlarına istinad edir; ikinci tərəf isə zamanın ya «kateqoriya»sını, ya da «dərəcə»sini dəqiqləşdirir. İkinci növ təyini söz birləşməsi şəklində olan zaman mənalı birləşmələrdən aşağıdakıları qeyd etmək olar:

1. *Çağ* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmələr. Bu ifadələrin birinci tərəfi günün hissələrini bildirən sözlərdən ibarət olur: *axşam çağı, səhər çağı, sübh çağı, ikindi çağı*;

2. *Axşam* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmələr: *çərşənbə axşamı, cümə axşamı, bayram axşamı*. Bunların birinci ikisi həftənin günlərinin adlarıdır.

3. *Üst* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmələr: *axşam üstü, günorta üstü.*

4. *Ertə* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmə: *bazar ertəsi*. Bu ifadə həftənin günlərindən birinin adı kimi işlənir.

5. *Yarı* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmə: *gecə yarısı*.

6. *Boyu* ünsürü ilə əmələ gələn zaman mənalı birləşmələr: *ömrüm boyu, ömrün boyu, ömrü boyu, həftə boyu*. Bu ifadələrdən birinci üçü nitq subyekti və ya obyekti ilə bağlıdır. Onların ikinci mühüm cəhəti bundan ibarətdir ki, hər üçü sintaktik zamanı bildirir.

7. *Vaxt* ünsürü ilə əmələ gələn zaman mənalı adlar: Bu ifadələri bir neçə qrupa bölmək olar:

7.1. Söz birləşməsinin birinci tərəfində günün hissələrinin adları işlənməklə əmələ gələnlər: *gecə vaxtı, günorta vaxtı, səhər vaxtı, axşam vaxtı.*

7.2. Söz birləşməsinin birinci tərəfində fəsil adının işlənməsi ilə əmələ gələnlər: *yaz vaxtı, yay vaxtı, payız vaxtı, qış vaxtı, bahar vaxtı.*

7.3. Nitq subyekti, yaxud obyektininin müəyyən yaş dövrünü bildirən sözlərin iştirakı ilə əmələ gələnlər: *uşaq vaxtı, cavan(lıq) vaxtı, yeniyetmə(lik) vaxtı, ahıl vaxtı, qoca vaxtı.*

7.4. Nitq subyekti, yaxud obyektininin bağlı olduğu şəraitə işarə edən zaman mənalı ifadələr: *iş vaxtı, istirahət vaxtı, məzuniyyət vaxtı, zarafat vaxı.*

7.5. Müəyyən coğrafi obyektlərlə bağlı olan zamanı bildirən ifadələr: *Bakı vaxtı, Ankara vaxtı, Tehran vaxtı, Moskva vaxtı* və s.

8. *Gün* sözünün əlavəsi ilə əmələ gələn zaman mənalı ifadələr: *bazar günü, çərşənbə günü, cümə günü, şənbə günü; istirahət günü, bayram günü, ad günü, axirət günü, aşura günü; Dirçəliş günü, Gülüş günü* və s.

9. *Ay* sözünün əlavəsi ilə əmələ gələn zaman mənalı ifadələr: *yanvar ayı, fevral ayı, mart ayı, aprel ayı, may ayı, iyun ayı, iyul ayı, avqust ayı, sentyabr ayı, oktyabr ayı, noyabr ayı, dekabr ayı, bayram ayı.*

10. *İl* sözünün əlavəsi ilə əmələ gələn zaman mənalı ifadələr: *dovşan ili, meymun ili, at ili, xoruz ili, ilan ili və s; doğum ili, vəfat ili; dönüş ili* və s. Azərbaycan dilində bu qəbil-

dən olan və azişlənən «heyvan ili» adlarından savayı, emfatik səciyyə daşıyan *it ili* zaman ifadəsi də işlənir.

Yuxarıda sadalanmış sintaktik konstruksiyaların hər birini cümlədə konkret misallarla nümayiş etdirməyə ehtiyac yoxdur. Bəzi nümunələrlə kifayətlənmək olar:

*Maral çıxdı dağ döşünə, **Səhər vaxtı** gülə-gülə* (S.Vurğun). *Bəli, o yol baxıcıları ki, .... daxmalarından **gecə vaxtı** yola çıxıb, qatarları ötürürlər* (Anar). ***Ömrün boyu** çox rəqəmləri unudacaqsan. Padşahın yaşı ötmüşdü, amma **ömrü boyu** nəinki adam, heç taxtabiti, birə də öldürməmişdi* (Anar).

İkinci növ təyini söz birləşməsi şəklində olan zaman ifadələrində sintaktik zaman bildirmək xüsusiyyəti olmaya da bilər. Məsələn:

*Bunu bilmək üçün axşamı gözləyirdim. **Telefon saatını**. İstədim ki, (onun) yeni ilini Moskva vaxtıyla təbrik eləyəm. Praqa vaxtyla yeni ilini təbrik etmək istədim. ... Hansı vaxtla yeni il idi, bilmirəm, bəli, Qrinviç vaxtıyla* (Anar).

### 5.1.1.1.3. Üçüncü növ təyini söz birləşməsi şəklində olan temporal ifadələr

Üçüncü növ təyini söz birləşməsi «yiyəlik halda olan söz (isim) + mənsubiyyət şəkilçili söz» modeli üzrə əmələ gəlir. Belə birləşmənin ikinci tərəfində hər üç şəxsə aid olan mənsubiyyət şəkilçisi işlənə bilər.

Həmin söz birləşməsi modelinin zaman mənalı ifadələr üçün yararlılıq dərəcəsi necədir? Əldə olan azsaylı materiallardan görmək olur ki, həmin model nominativ vahid kimi yox, sintaktik vahid kimi zaman mənalı ifadələrin yaranmasına xidmət edə bilir.

Üçüncü növ təyini söz birləşməsi şəklində olan zaman mənalı ifadələrin sintaktik zaman bildirməsi onların cümlədə hansı üzv məqamında çıxış etməsi ilə bağlıdır. Müvafiq zaman

mənalı ifadə ismin adlıq halında sintaktik zaman bildirmir, lakin məkani hal şəkilçiləri qəbul etdikləri hallarda həmin mənanı ifadə edir. Məsələn:

*Hər şey **Rasimin toyundan** başlandı. Nəhayət, səhər **altının yarısında** küçədəki avtomatdan zəng eləyəndə cavab çıxdı* (Anar). ***Yanvarın ikisində*** *təzə iş yerinə gəldim* (Anar).

Yuxarıdakı cümlələrdə *Rəşidin toyu, altının yarısı, yanvarın ikisi* təyini söz birləşmələri mətndən kənarda sintaktik zaman bildirmir, lakin nominativ vahid kimi *altının yarısı, yanvarın ikisi* söz birləşmələri, əlbəttə, müəyyən saata və müvafiq ayın müəyyən gününə işarə edir.

Həmin model üzrə başqa zaman mənalı ifadələr də düzəltmək olar: *birin yarısı, ... on ikinin yarısı; yanvarın üçü, fevralın beşi* və s. Ay adlarını və sayları dəyişməklə külli miqdarda zaman mənalı ifadə yaratmaq olar. Nitq prosesində biz şəraitdən asılı olaraq məhz belə də edirik, «sürüşkən qrafik» üzrə bizə lazım olan sintaktik vahidlər yaradırıq.

Üçüncü növ təyini söz birləşməsi şəklində olan zaman mənalı ifadələrin əmələ gəlməsinin başqa bir üsulu da vardır. *Ay* sözü, yaxud ay adları, *il* sözü, yaxud il adları *əvvəl, orta, axır, son* sözləri ilə birləşməklə məhz belə sintaktik vahidlər əmələ gətirir: *ayın əvvəli (axırı, ortası, sonu), oktyabrın əvvəli, fevralın sonu, mayın ortası, ilin əvvəli, ilin sonunda* və s. Bir daha vurğulamaq lazımdır ki, bu qəbildən olan söz birləşmələri sintaktik zamanı ifadə etmək üçün müvafiq morfoloji formada olmalıdır: *ilin əvvəlində, ilin sonunda, ayın axırında* və s.

Beləliklə, üçüncü növ təyini söz birləşməsi şəklində olan zaman mənalı ifadələr dilin lüğət tərkibinin ünsürü olmaqdan uzaqdır. Bunlar nitqin tələbinə uyğun olaraq və yeri gəldikcə yaradılıb istifadəyə verilir.

### 5.1.1.1.4. Mürəkkəb təyini söz birləşməsi şəklində olan temporal ifadələr

Təyini söz birləşməsinin bu tipi sadə təyini söz birləşmələrinin başqa sözlərlə, yaxud bir-biri ilə birləşməsi nəticəsində meydana gəlir. Həmin hadisəni «genişlənmə» də adlandırmaq olar. Üçüncü növ təyini söz birləşməsi kimi, mürəkkəb təyini söz birləşməsi də sırf nitq hadisəsidir. Nümunələrə diqqət yetirək:

***Tanışlığın elə birinci dəqiqəsindən*** *hər şeyi bilmək istəyirsiniz? O özü həvəslə Seymur müəllimdən danışır. Rüstəmlə* ***uzun-uzadı telefon söhbətləri zamanı*** *danışır. Amma Seymurla heç vaxt Rüstəm barəsində danışmırdı. Böyük bir materialı redaktə etdim və* ***işin axırına yaxın*** *makinaçıya verdim* (Anar).

I cümlədə *birinci dəqiqə* birinci növ təyini söz birləşməsidir. *Tanışlığın* sözünün ona əlavə edilməsi ilə üçüncü növ təyini söz birləşməsi modeli üzrə mürəkkəb təyini söz birləşməsi yaranmışdır. Lakin bu hələ hamısı deyildir: *elə* əvəzlik ədatının *birinci dəqiqə* söz birləşməsinin əvvəlinə artırılması ona təkid, dəqiqləşdirmə çaları verir.

II cümlədə *telefon söhbəti* mərkəzi tərkib hissəsidir. O, özündən qabaq *uzun-uzadı* təyini, özündən sonra isə *zaman* sözü ilə əlaqəyə girərək, mürəkkəb sintaktik vahid yaratmışdır (*uzun-uzadı* təyini daha çox *söhbət* sözünə aiddir).

III cümlədə *işin axırı* özlüyündə III növ təyini söz birləşməsidir. *Yaxın* sözü ona əlavə olunmaqla, bu birləşməni bir qədər də mürəkkəbləşdirir. Amma konkret olaraq o, yəni *yaxın* sözü *axır* sözünə aid olmaqla, hərəkətin başvermə zamanını bir qədər də dəqiqləşdirir.

Demək lazımdır ki, mürəkkəb təyini söz birləşmələri «genişlənmiş» üzvlər olsa da, heç də bütün genişlənmiş üzvlər mürəkkəb təyini söz birləşməsi olmur.

Mürəkkəb təyini söz birləşməsi şəklində olan zaman mənalı ifadələrin bir qismi emfatik səciyyə daşıyır, yəni onlar hansısa konkret zaman bildirmək yox, müəyyən təsir bağışlamaq məqsədi güdür. Məsələn:

*Günlərin bir günü* – ***Günlərin bir günü*** *baş vəzir papağını qoyub qabağına fikirləşdi* (Anar). *O başqa bir bülbül tutdurub qəfəsə saldırdı, kar eləmədi, qəfəsi daha da böyütdürdü, genişləndirdi, kar eləmədi, axırda* ***günlərin bir günü*** *... qızıl qəfəsin ağzını açdırdı, sarı bülbülü qəfəsdən buraxdırdı* (Elçin).

*Gecənin bir yarısı* – ***Gecənin bir yarısı****, görürsən, dururdu, çırağı yandırırdı, bir-bir birələri tuturdu, amma öldürmürdü* (Anar).

*Gecənin bu (o) vaxtında* - ***Gecənin bu vaxtında*** *sənə haradan qız tapacağıq? Həm də* ***gecənin bu vaxtında*** *küçələri gəzən qızı almazsan, yəqin.* ***Gecənin o vaxtında*** *kiminlə danışırsan belə?* (Anar).

Aydındır ki, *gecənin bir yarısı* ifadəsinin əsasında *gecəyarısı*, *gecənin bu (o) vaxtı* ifadəsinin əsasında isə *gecə vaxtı* ifadəsi dayanır (II növ təyini söz birləşməsi). Lakin nitqdə həmin zamanı sintaktik zamana çevirmək üçün ikinci ünsürdən qabaq konkretləşdirici, dəqiqləşdirici ünsür əlavə edilmişdir.

Həmin effekt eyni sözün müxtəlif formalarının əlaqələndirilməsi, əksmənalı sözlərin bir ifadə tərkibində qarşılaşdırılması yolu ilə də edilir. Məsələn:

*Günü-gündən – Mən bu yad adama heç kəsə danışmadıqlarımı danışmağa başladım: işdəki çətinliklərimdən, köhnə dostum Füzuli ilə* ***günü-gündən*** *uzaqlaşmağımızdan ... ona heç bir dəxli olmayan şeylərdən* (Anar).

*Günü-gündən* ifadəsində birinci tərəfin işləndiyi formanın mahiyyəti aydın deyildir, buna baxmayaraq, bütövlükdə ifadənin mahiyyəti aydındır: o, təkrarlığa işarə edir.

*Gündən-günə – Heç kim ağlına gətirmirdi ki, bu təzə bağçanın sahibi cavan tacir* ***gündən-günə*** *şöhrətlənən,* ***gündən-günə*** *dövlətlənən ... cavan tacir bir vaxt ac yalavac bir yetim idi* (Elçin).

*Gündən-günə* ifadəsinin əmələgəlmə modeli (eyni sözün çıxışlıq + yönlük hal formaları) daha çox məhsuldardır. Məsələn: *birdən-birə, hardan-hara, burdan-bura*.

*Gündən-günə* temporal ifadəsində fasiləsizlik, arasıkəsilməzlik mənası vardır.

*Birdən-birə – İndi* ***birdən-birə*** *o meşənin zümrüd yaşıllığı hər tərəfi bürüdü. Sonra o buna təəccüb etdi ki, nə üçün* ***birdən-birə*** *o uşağı xatırladı* (Elçin).

*Ayda-ildə (bir dəfə) –* ***Ayda-ildə*** *bir namaz, Onu da şeytan qoymaz* (Məsəl). *Sonra elə bilərsiz içkibazam*: ***ayda-ildə bir dəfə*** içirəm.

*Ayda-ildə* ifadəsi birinci cümlədə xəbərlə əlaqəsiz, ikinci cümlədə isə feli xəbərlə əlaqədar işlənmişdir. Düşünmək olar ki, birinci cümlədə də onun işlənmə məqamı ikinci cümlədəkinin eynidir; belə ki, birinci cümlə elliptik cümlədir, onun tam forması mütləq feli xəbərlə tərtib olunardı.

*Əzəl-axır – Şairin biri o birisindən danos yazırdı ki, bəs filankəsin işlətdiyi qafiyələr* ***əzəl-axır*** *məmləkətləri bərbad edib, xaraba qoyacaq* (Anar).

Verilmiş misalda cümlənin xəbəri felin qəti gələcək zaman forması ilə ifadlə olunmuşdur. Bu o deməkdir ki, həmin zaman mənalı ifadənin tərkibində uzaq keçmişə işarə edən *əzəl* sözü olsa da, sintaktik zaman uzaq və qeyri-müəyyən zamanla bağlıdır. Lakin birləşmənin özü ilə bağlı qeyd olunmalıdır ki, o, *əzəl-axır* yox, *əvvəl-axır* şəklində olmalıdır.

*Axşam-səhər –* ***Axşam-səhər****, çeşmə, sənin başına, Nə canlar gedərək, nə canlar gəlir?* (S.Vurğun). *Sarı bülbül* ***səhər-axşam*** *oxumağa başladı, amma sarı bülbül yenə də hami-*

*şə yanıqlı ötdü, bu nəğmələr* ***səhər-axşam*** *dünyanın dərdindən, qəmindən xəbər verdi* (Elçin).

*Axşam-səhər* ifadəsi bir gün ərzində baş verən hadisənin zamanını yox, hər gün təkrarlanan hərəkətin zamanını bildirir: *Bir zəhmətkeş qızdır ki,* ***səhərdən-axşamacan*** *çalışır* (Anar).

### 5.1.1.2. İngilis dilində temporal söz birləşmələri

İngilis dilində temporal söz birləşmələrinin əmələ gəlməsində zaman adları, zaman zərfləri, sözönülər xüsusi rol oynayır. Zaman adlarına günün hissələrinin adları, günlərin subyektiv zamana görə bölgüsü ilə bağlı ifadələr, həftənin günlərinin adları, ay adları, fəsil adları, il adları və s daxildir. Bu sözlərin zaman anlayışı ilə bağlı olması heç kəsdə şübhə doğurmur. Zamanı ifadə etmək onların nominativ funksiyasıdır. İngilis ictimai şüurunda mövcud olan, ingilislər üçün dünyanın konseptual modelinə daxil olub ən mühüm zaman anlyışlarını ifadə edən bu sözlər nominativ funksiyada leksik temporallıq sahəsinin vahidləridir. Həmin leksik vahidlər dilin sintaktik qayda-qanunları əsasında başqa söz kateqoriyaları ilə əlaqəyə girərək sintaktik temporallığın ifadəsində söz birləşməsi səviyyəsində iştirak edir.

Günün hissələrin adlarından ibarət yarımqrupu təşkil edən leksik vahidlər günün işıqlı və qaranlıq hissələrini bildirən sözlərdir: *morning, morrow, sunrise, dawn, daybreak, daydawn, forenoon, noon, daytime, daylight, noonday, midday, afternoon, evening, even, evenfall, evenlight, twilight, dusk, sunset, forenight, night, midnight* və s.

Onların bəzilərinin temporal söz birləşmələrinin əmələ gəlməsində iştirakını nəzərdən keçirək.

*Morning* «səhər» sözü həm təklikdə, həm də *this, that* və s. işarə əvəzlikləri, sifətlər ilə birlikdə temporal birləşmə əmələ gətirir: *this morning, that morning, the following morning,*

*next morning, every morning* və s.

*Why, Grace, why, Marion!' he added, aloud, 'is the world more mad than usual **this morning?'*** (Ch. Dickens). *Whittington was in a hurry to get rid of you **this morning**, ...* (A.Cristie). *The **next morning** dawned bright and sunny, and I was full of the anticipation of a delightful visit* (A.Cristie). *She is up at five **every morning** to milk, and keeps at it steadily until lunchtime* (A.Cristie).

*Morning* sözü *towards* sözönüsü ilə əlaqəyə girir və «səhərə yaxın» mənasında işlənir. ***Towards morning** his rest was disturbed* (Hayley).

*Morning* sözü bəzi isimlərlə əlaqəyə girərək, onların ifadə etdikləri əşyaları (predmetləri) «səhər» anlayışına mənsubiyyətinə görə təyin edir: *morning coat* vizitka («səhər və günorta qəbulları vaxtı geyinilən rəsmi [parad] paltar(ı)»), *morning dress* adi (sadə) paltar, *morning gown* «xalat», *morning watch* «səhər geyimi», *morning star* «dan ulduzu», *morning news* «xəbərlərin səhər buraxılışı».

*All night long he watches the stars, and when the **morning star** shines he utters one cry of joy, and then he is silent* (O. Wilde).

*Noon* «günorta» / *noonday* «günorta çağı» – ***At noon** the yellow lions come down to the water's edge to drink* (O. Wilde).

*Evening «*axşam» – ***By evening** the quotation had gone from Wast to Coast* (Hayley). *There was one house in particular where I was turned down **that evening*** (J.London).

*Morning* sözü kimi, *evening* sözü də bəzi isimlərlə əlaqəyə girərək onların bildirdikləri obyektləri «axşam» anlayışına bağlayır: *evening meal* «şam yeməyi», *evening dress* «axşam paltarı» və s.

*Day* sözü müxtəlif səciyyəli temporal ifadələrin yaranmasında mühüm rol oynayır: *all day* «bütün gün(ü)», *before*

*day* «sübh tezdən, erkən, dan üzü», *by day* «gündüz», *day about* «günaşırı», *the day after tomorrow* «birisigün», *the day before* «ərəfəsində, bir gün qabaq», *the day before yesterday* «srağagün», *day in day out* «günü-gündən, gündən-günə», *every day* «hər gün», *every other day* «günaşırı», *one day* «bir gün, bir dəfə», *the other day* «bu yaxınlarda», *some day* «nə vaxtsa, bir vaxt»; *day of judgement* «axirət günü, qiyamət günü», *Christmas day* «Mövlud günü», *birthday* «doğum günü».

Həmin ifadələrin bir çoxu özünün motivinin əmələgəlmə üsuluna görə Azərbaycan dili materialları ilə oxşarlıq nümayiş etdirir.

*Day* sözü həm özünün törəmələri şəklində, həm də müəyyən təyinlərlə birlikdə sintaktik zaman ifadə edir. Nümunələr:

*'There! Take my love with it,' said the Doctor, imprinting his upon them; 'and many happy returns of the - the idea! - **of the day*** (Ch.Dickens). *And who knows but **some day** I may meet him? ...* (J.London). *'Music and dancing **TO-DAY**!' said the Doctor, stopping short, and speaking to himself. 'I thought they dreaded **to-day*** (Ch.Dickens). *Many an insect deriving its delicate colour from harmless leaves and herbs was stained anew **that day** by dying men ...*(Ch.Dickens). *There is abundant reason, therefore, why Americans of **the present day** should know James Fenimore Cooper* (J.F.Cooper) . *Many a wild flower formed by the Almighty Hand to be a perfumed goblet for the dew, felt its enameled cup filled high with blood **that day**, and shrinking dropped* (Ch.Dickens).

*That day* zaman ifadəsi sahiblik məqamında (yiyəlik halda) işlənərək qoşulduğu sözün ifadə etdiyi obyekti sintaktik zamana görə təyin edir:

*Heaven keep us from knowledge of the secrets whispered afterwards upon the tainted wind that blew across the scene of*

***that day's work*** *and that night's death and suffering!* (Ch. Dickens).

*A day* – ***A day*** *had passed since their marriage without her regretting* (S. Maugham).

Misaldan göründüyü kimi, *a day* ifadəsi sadə cümlənin mübtədası rolunda çıxış edir, lakin bu, onun nominativ mənasında zaman təsəvvürünün olmasına mane olmur.

***In the daytime*** *I played with my companions in the garden, and* ***in the evening*** *I led the dance in the Great Hall*. (O.Wilde)

*In the daytime* və *in the evening* birləşmələri təkcə hərəkətin təkrar olunduğunu bildirməyib, həm də bir-birinə semantik bağlılıq və eyni zamanda əkslik münasibətində çıxış edirlər.

*Day* sözü *all* təyin əvəzliyi, *long, next* dəqiqləşdirici ünsürləri ilə işlənərək, müvafiq sintaktik zamanın ifadəsinə xidmət edir. Bu xüsusiyyət başqa zaman mənalı ifadələrə (*night, year* və s.) də aiddir.

*All day ( long)* «bütün gün ərzində» – ***All day long*** *they played, and in the evening they came to the Giant to bid him good-bye.* (O.Wilde). ***All day long*** *he flew, and at night-time he arrived at the city* (O.Wilde).

*Next day* «sonrakı gün» – ***The next day*** *the Swallow flew down to the harbour* (O.Wilde). *A steamer was to sail early* ***next day****, and they went aboard that very night* (George Ade).

*Few days* «bir neçə gün» - *"He was very nearly drowned* ***few days*** *ago while taking a swim in the sea, and the doctor has ordered him to remain indoors for some time."* (O'Henry). *It had lost some of its childish devotion; it was bolder, as if she had lived and felt, and brushed a good deal more down off her wings during those* ***few days****.* (John Galsworthy).

*Birth-day* «doğum günü» - *'Make some allowance for it, father, if it be,' replied his younger daughter, Marion, going*

*close to him, and looking into his face, 'for it's somebody's* ***birth-day****.'* (Ch.Dickens). *'Somebody's birth-day, Puss!' replied the Doctor. 'Don't you know it's always somebody's* ***birth-day****?* (Ch.Dickens).

Verilmiş misallarda *birth-day* ifadəsi xəbər vəzifəsində və adlıq cümlə vəzifəsində işlənmişdir. Ancaq onun zaman zərfliyi funksiyasında işlənməsi də istisna olunmur.

*Christmas day* «mövlud günü» - *"I remember seeing it* ***on Christmas Day****, and the little model who was sitting for it an attractive type!* (J. Galsworthy).

Bu nümunədəki (*on*) *Christmas Day* ifadəsi nominativ vahid kimi onsuz da təqvimin müəyyən tarixinə işarə edir. Bundan əlavə, işləndiyi *on* sözönüsü ilə birlikdə zaman zərfliyi funksiyasını daşıyır.

*Night* sözü müxtəlif səciyyəli temporal ifadələrin yaranmasında mühüm rol oynayır: *night* «gecə, axşam»; *night after night, night by night* «hər gecə»; *all night (long)* «bütün gecəni, bütün gecə ərzində»; *at night* «gecə, axşam»; *by night* «gecə ərzində»; *on nights* « gecələr»; *the small night* hərfən: «kiçik gecə (gecəyarıdan sonrakı 1-2 saat)»; *to-night* «bu (gün) axşam».

*Night* sözü öz törəmələri və təyinləri ilə birlikdə sintaktik zaman bildirir. Məsələn:

*all night (long)* «bütün gecə ərzində» – ***All night long*** *he watches the stars, and when the morning star shines he utters one cry of joy, and then he is silent* (O.Wilde).

*One night* «bir gecə, bir axşam» – Bu ifadə yerinə görə *for* önqoşması, *long* kəmiyyət göstəricisi isə birlikdə işlənir.

*"Swallow, Swallow, little Swallow," said the Prince, "will you not stay with me* ***one night longer****?"* (O.Wilde). *But the Happy Prince looked so sad that the little Swallow was sorry. "It is very cold here," he said; "but I will stay with you* ***for one night,*** *and be your messenger."* (O.Wilde)

*In the night* «gecə(də)» – *I have heard an owl hooting in the daytime; a cuckoo singing* ***in the night****."* (J. Galsworthy).

*Last night – Uncle Hilary came to dinner* ***last night****. We talked of social questions* (J.Galsworthy). *'Are you going to spread it out here, as you were told* ***last night****?' said the Doctor* (Ch.Dicken). *"You have not told me if Mrs. Inglethorp ate well* ***last night****."* (A.Christie).

*To-night – He doesn't want any supper* ***to-night*** (A.Christie).

*Afternoon* «günortadan sonrakı vaxt», *köhn*. «ikindi çağı» – *But on the Sunday* ***afternoon*** *a message was brought to the house* (A.Christie). *It was not until the middle of the* ***afternoon*** *that the hunters returned...* (W. Irving). *I went there* ***afternoons*** *and afterwards stopped at the café* (E.Hemingway)

*Afternoons* sözünün cəm şəkilçisi ilə işlənməsi hərəkətin təkrar olunduğuna işarə edir.

Azərbaycan dilində *gecə* və *gündüz* sözlərinin əks mənalarda işləndiyini görürük: *gündüz gəzər obanı, gecə ağrar dabanı* (məsəl). Ola bilsin ki, ing. *day* və *night* sözləri arasında da müvafiq formalarda belə bir münasibət vardır, amma bunu göstərməyə əlimizdə belə bir material yoxdur.

Sintaktik zaman *o'clock, minute* və *moment* sözləri ilə ifadə olunur.

*O'clock* sözü *at* sözönü ilə və say adları ilə əlaqəyə girərək sintaktik zaman ifadə edir:

***At the seven o'clock*** *she went to Mrs. Bracebridge's* (Th.Dreiser).

*O'clock* sözü saydan qabaq gələn *about, round* tipli sözlərlə əlaqəyə girməklə, təxmini zaman ifadə edir:

*Call me* ***about seven*** (Sillitoe).

Gördüyümüz kimi, bu temporal atranzitiv sintaksemdə *o'clock* sözü işlənməmişdir.

***About eleven o'clock*** *in the morning, a great cloud of dust was descried in the rear, advancing directly on the trail of the party.* (W. Irving)

*O'clock* sözü budaq cümlənin tərkibində də işlənir (subyekt vəzifəsində):

***When nine o'clock came,*** *he went alone to the court, for it was thought advisable that the others should stay away* (Th.Dreiser).

*Minute* «dəqiqə» – *Minute* söz təklikdə, işarə əvəzlikləri, say və başqa təyinedici sözlərlə işlənərək, sintaktik zaman ifadə edir.

*Every minute* «hər dəqiqə» – *Did you never hear how many new performers enter on this - ha! ha! ha! - it's impossible to speak gravely of it - on this preposterous and ridiculous business called Life,* ***every minute****?'* (Ch.Dickens).

(in) + say + minute modelli birləşmə – *It was* ***a five minutes*** *task to write a note to the judge asking him to revoke the fine, for the sake of the boy's character and send it by a messenger to his home* (Th.Drieser). *Tuppence directed him, and he returned* ***in a few minutes*** *with a cold pie and three plates* (A.Christie). ***In a few minutes*** *I was knocking at the door of Leastways Cottage* (A.Christie). *I've just* ***five minutes*** *to catch the post* (A.Christie).

Həm bu, həm də əvvəlki sintaksemi temporal kvantitativ sintaksem kimi səciyyələndirmək olar. Xatırladaq ki, bu qəbildən olan ifadələrə başqa münasibətlərdə də rast gəlinir.

*(in) + half + minute – Everything shall be ready for you in* ***half a minute****, Mister.* (Ch.Dickens) *... the truth is, it had gone at such a pace, and worked itself to such a pitch of competition with the dancing, that it never could have held on,* ***half a minute*** *longer* (Ch.Dickens)

Son nümunədəki *longer* ifadəsi özündən əvvəlki sintaksemə ardıcıl davamlılıq çaları verir.

*Moment* «an, dəqiqə»; *at // to the moment* «bu an, bu dəqiqə»; *at (the) moment, this moment* «bu saat, indicə»; *to the (very) moment* «deyilən vaxtda»; *at a moment notice* «hər an».

*the moment – **The moment** they wore out, their wooden souls were taken from them and their bodies given to the poor* ... (J.Galsworthy)

*at this moment – The frightful indelicacy of her situation **at this moment**, the feeling of unfairness that she should be placed in it, almost overwhelmed ...* (J.Galsworthy)

*for a moment – Everything that he was **for the moment** incapable of saying was eloquent in that look* (A.Christie).

Sintaktik zamanın ifadə olunmasında həftənin günlərinin adlarının digər söz kateqoriyaları ilə əmələ gətirdiyi temporal ifadələrə rast gəlmək olar.

İngilis dilində həftə və onun günlərinin adları bunlardır: *week* «həftə», *Monday, Tuesday, Wednesday, Thursday, Friday, Saturday, Sunday*.

Həftənin günlərinin adları təklikdə, önqoşmalarla və təyinedici sözlərlə işlənərək, sintaktik zaman ifadə edir.

*Monday – Soon the only thing that recalled London to her was the arrival **on Monday** of the Sunday papers. She had arrived **long on Monday**.* (S.Maugham) ***When Monday came**, Jennie bade here parents good bye and left largely, going straight to the Dornton, where Lester awaited her* (Th.Drieser).

*Tuesday – **On Tuesday** night the new laundrymen arrived, and the rest of the week was spent breaking them into the routine* (J. London).

*Wednesday – **On Wednesday** he received another polite note from McGregor, James and Hay.* (S.Maugham). *It was **on a Wednesday afternoon**, in the latter part of August, when the letter came from Gerhardt* (Th. Drieser)

Sonuncu cümlədə eyni zaman parçasının üç (dörd) üsulla ifadə olunduğunu görürük. Burada həftənin gününün, günün hissəsinin, ayın hissəsinin və məktubun gəlib çatmasını görürük.

*Thursday – «We are very pressed, madam." – Oh, but you must let me have it* ***by Thursday*** *at the latest, please* (J.Galsworthy ). *I arrive.* ***Thursday****, night, and I want You to meet me in the ladies' parlor of the Dornton at noon Friday* (Th.Drieser).

Həmin cümlələrdən birincisində *the latest* «ən geci» dəqiqləşdirici vasitəsinin, ikincisində isə günün hansı vaxtının (*night*) ifadə olunduğunu görürük.

Aşağıdakı cümlədə isə *Thursday* sözünün təyin məqamında işləndiyini görürük.

*The widow of a somewhat famous connoisseur, she was now secretary of the League for Educating Orphans who have Lost both Parents, vice-president of the Fordom Hope for Maids in Peril, and treasurer to* ***Thursday*** *Hops for Working Girls* (J.Galsworthy).

*Friday – They decided to move* ***Friday****, which was two days away*. (S.Maugham).

*The fatal* ***Friday*** *came and Jennie stood face to face with his new and overwhelming complication in her modest scheme of existence* (Th.Drieser).

Burada diqqəti təkcə *Friday* «cümə» sözünün cümlənin mübtədası rolunda çıxış etməsi deyil, həm də onun «gəlmək» feli ilə işlənməsi cəlb edir. Qeyd etmək lazımdır ki, zaman anlayışı bildirən sözlərin «gəlmək» feli ilə işlənməsi Azərbaycan dili üçün də xarakterikdir. Müq.et: *Qış getdi, yenə bahar gəldi* (Xətai).

*Saturday – Thus,* ***on that Saturday*** *afternoon, the 4th of May, he felt for once such a positive aversion from the reading of reviews, as men will feel from their usual occupations when*

*their nerves have been disturbed* (J.Galsworthy). *I'll call You* ***on Saturday*** *or on Sunday* (J.Galsworthy). ***On the Saturday****, Cherlock Holmes drove with me to Haddington Stadion* (A.C.Doyle). ***On the following Saturday*** *he came again to their house.* (S.Maugham). *He ran up to the Cleveland* ***the following Saturday*** *and calling at her place of business, he made on appointment to see her that evening* (Th.Drieser).

İkinci cümlədə *Saturday* «şənbə günü» sözü *Sunday* «bazar günü» ifadəsi ilə həmcins üzv kimi işlənmişdir. Sonrakı cümlədə *Saturday* sözünün *following* «sonrakı» sözü ilə təyin olunduğunu görürük. Bu, nitq anından hesablanan şənbədir.

*Sunday – One* ***Sunday*** *afte[r]noon he appeared at their house in South Hennington* (S.Maugham) *They went ... to High Mass* ***on Sundays*** (S. Maugham).

Sonuncu cümlədə *Sunday* sözünün cəm şəkilçisi ilə işlənməsi hərəkətin təkrarlılığına işarə edir.

Sintaktik zaman ay adları ilə də ifadə olunur. «Ay» mənası ingilis dilində *month* ümumi ismi və *January, February, March, April, May, Juny, July, August, September, October, November, December* xüsusi isimləri ilə bildirilir.

Ay adları sintaktik zamanı üç cür ifadə edirlər: a) hər bir konkrer ay adının müəyyən sözönü, işarə əvəzlikləri və s. təyinedici sözlərlə birləşməsi şəklində; b) ay adının müəyyən illəri bildirən ifadələrlə əlaqədə işlənməsi şəklində; c) ay adlarının müəyyən ardıcıllıqla (başlanğıc – son) işlənməsi şəklində:

*We go to Italy get our honeymoon* ***in August*** *and* ***September*** (S.Maugham). *Dorris was to be married* ***in November*** (S.Maugham).

Birinci cümlədə *August* və *September* adlarının müvafiq konstruksiyada həmcins tərəflər kimi işləndiyini görürük.

Ay adları il bildirən ifadələrlə işlənərək temporal birləşmə əmələ gətirir. Məsələn: *I was born* ***in the September of 1979****.*

Ay adları birləşmədə müəyyən ardıcıllıqla (başlanğıc – son) işlənir: *He lived there* ***from March till September***.

Misaldan gördüyümüz kimi, ay adlarının yaratdığı konstruksiyada ardıcıllıq münasibəti təkcə *March* və *September* sözlərinin müvafiq leksik sistemdə tutduğu yerlə yox, həm də *from* və *till* sözönülərinin köməyi ilə ifadə olunmuşdur.

Həmin məna *from* sözönüsü olmadan yalnız *through* vasitəsilə də ifadə olunur:

*May 10 through June 15* «Mayın 10-dan ta iyunun 15-nə qədər».

Aşağıdakı misallarda isə ay adları söz birləşməsinin tərkibində təyin məqamında işlənir:

*Then* ***on*** *a hot* ***July afternoon****, after a terrible battle at Placktree Greek, a stream of confederate soldiers began to arrive in Atlanta* (M.Mittchell). *As an earnest of our pleasure in publishing the poem, let me tell you that we have set it for the* ***August number****, our* ***July number*** *being already made up* (J.London).

*Month* ümumi ismi təyinedici vasitələrlə və saylarla əlaqəyə girərək, temporal birləşmələrin əmələ gəlməsində də iştirak edir. Birləşmədəki saylar zamanın kəmiyyətinə işarə edir. Məsələn:

*He lit a cigarette, the first* ***this month****. We are now trying to release all our books* ***one month*** *in advance. ... and the Solomon Islands, after* ***eight months*** *of failure to find treasure, had witnessed the breaking up of the expedition.* (J.London) *It had taken him* ***six months*** (J.Galsworthy).

Temporal birləşmələr fəsil adları ilə də əmələ gəlir. Fəsil adları aşağıdakı qaydalar üzrə işlənir:

a) Fəsil adı müəyyən sözönülər, işarə əvəzlikləri və s. təyinedici vasitələrlə əlaqəyə girərək sintaktik zaman ifadə edir. Məsələn: *He was going* ***in the autumn*** (S.Maugham). ***That***

***summer****, for the first time since the war, began the people of Atlanta heard the sound of battle*. (M.Mittchell) *He had met her early* ***in the spring*** *as he was flying down the river after a big yellow moth, and had been so attracted by her slender waist that he had stopped to talk to her* (O.Wilde). *"What a remarkable phenomenon," said the Professor of Ornithology as he was passing over the bridge. "A swallow* ***in winter****!"* (O.Wilde).

Sonuncu cümlədə fəsil adının artiklsız işləndiyini görürük. Bu, cümlənin ümumi məzmunu ilə bağlı olub, qeyri-müəyyən zaman bildirir.

b) Fəsil adı konkret il bildirən ifadə ilə əlaqəyə girməklə işlənir:

***The autumn of 1862*** *went quickly for Scarlett ...* (M.Mittchell)

c) Fəsil adı müəyyən hadisənin baş verməsi ilə əlaqədə sintaktik zaman ifadə edir:

***The spring after his father died****, he put his plan into exercise* (Th.Dreiser).

ç) Fəsil adı zamanın davam etməsinə işarə edən *during, through* kimi sözlərlə işlənir:

*Once or twice every month* ***during the winter****, and on each Wednesday evening while the season lasted, he would throw open to the world his beautiful house and have the most celebrated musicians of the day to charm his guests with the wonders of their art.* (O.Wilde) *This was his courtship, and it lasted all* ***through the summer*** (O.Wilde).

d) Fəsil adı danışıq anına istinad edən *last* sözü ilə əlaqədə işlənməklə sintaktik zaman ifadə edir:

***Last summer****, when I was staying on the river, there were two rude boys, the miller's sons, who were always throwing stones at me* (O.Wilde).

e) Fəsil adı *next* təyini ilə işlənərək sintaktik zaman ifa-

də edir. Həmin zaman danışıq vaxtından sonraya aid olduğu üçün cümlənin xəbəri felin gələcək zaman formasında işlənir:

*Dear Prince, I must leave you, but I will never forget you, and **next spring** I will bring you back two beautiful jewels in place of those you have given away.* (O.Wilde)

ə) Fəsil adı *time*, *day* sözləri ilə əlaqədə işlənərək, sintaktik zaman ifadə edir. Birləşmədə həmin ünsürlər səciyyələndirici vəzifə daşıyır. Bunun analoqunu Azərbaycan dilində də görürük: *yaz vaxtı, qış vaxtı, yay günü, qış günü.*

*He knew that one of those trees rustled musically **in the summer time** at the window of Marion's chamber* (Ch. Dickens). *It was fought **upon a long summer day** when the waving grass was green* (Ch. Dickens).

f) Fəsil adı günün hissələrini bildirən sözlərlə birləşərək sintaktik zaman ifadə edir:

*…Where, **on a bright autumn morning**, there were sounds of music and laughter, and where two girls danced merrily together on the grass…*(Ch. Dickens)

h) Fəsil adı müəyyən zamanla bağlı olan isimlərlə işlənərək xarakterik konstruksiyalar yaradır: *winter fire, spring (autumn) rain, summer hot* və s.:

*… And wore away such legendary traces of it as the neighbouring people carried in their minds, until they dwindled into old wives' tales, dimly remembered round the **winter fire**, and waning every year.* (Ch. Dickens)

Burada *winter* sözünün təşkil etdiyi konstruksiya sintaktik zaman bildirməsə də, *winter* sözü nominativ planda sintaktik zaman bildirmə xüsusiyyətini saxlayır.

*Year* sözü sözönülər, zərflər və saylarla əlaqəyə girərək sintaktik zaman ifadə edir. *Year* sözü *for* sözönüsü ilə işlənir. Həmin sözönü zaman mənalı başqa sözlərlə də işlənərək gələcəkdə icrası nəzərdə tutulmuş iş və hərəkətin zamanını bildirir. Məsələn:

*… And the sheaves they yielded, were,* ***for many a long year****, called the Battle Sheaves, and set apart ...*(Ch. Dickens.)

*Year* sözü əsasında (onun təkrarı yolu ilə) yaranan zaman mənalı ifadələrin bəzilərini qeyd edək: *year by year «*hər il», *year in year out* «ildən-ilə», *from year to year, year by year* «hər il, ilbəil», *in the year one* «çoxdan, çox illər əvvəl». Bunlarda əsas ünsürlərin ya arasında (*in, by*), ya da əvvəlində (*from ... to* ) sözönülər işlənir. Bu üsula Azərbaycan dilində də rast gəlirik (*ilbəil, ildən-ilə* və s.).

Həmin birləşdirici vasitələrdən biri də *after* sözüdür. O, təkrar olunan *year* sözləri arasında işlənərkən zaman ardıcıllığını bildirir.

*But, there were deep green patches in the growing corn at first, that people looked at awfully.* ***Year after year*** *they reappeared ...* (Ch. Dickens).

*Year* sözü ilə işlənən sözönülər və zərflərdən ikisi diqqəti xüsusilə cəlb edir: *about* və *ago*. Onlardan birincisi zaman kəmiyyətinin təxminliyini, ikincisi isə onun danışıq anının daha əvvələ aid olduğunu bildirir:

*Nowhere more altered, perhaps,* ***about a hundred years ago****, than in one little orchard attached to an old stone house with a honeysuckle porch* (Ch. Dickens). *They are made of rare sapphires, which were brought out of India* ***a thousand years ago***. (O.Wilde).

*Year* sözünün iştirakı ilə yaranan zaman ifadələrinin bəziləri *at most* və *at least* ünsürlərinin hesabına genişlənir. Bu genişlənmənin əsas vəzifəsi sintaktik zamanın müvafiq surətdə yuxarı və aşağı həddini göstərməkdir:

*The difference between them, in respect of age, could not exceed* ***four years at most*** (Ch. Dickens).

Temporal birləşmələrin yaranmasında *time* sözü də fəal iştirak edir. Onun bir çox sintaktik törəmələri vardır: *at times* «vaxtaşırı», *from time to time* «ildən-ilə, vaxt-bivaxt, vaxtaşı-

rı», *in good time* «vaxtında, vaxtlı-vaxtında (vaxtında, vədəsində)», *in bad time* «gec, iş-işdən keçəndən sonra», *in no time* «dərhal, əlüstü», *on time* «vaxtında», *some time or other* «nə vaxtsa», *at times* «bəzən, ara-sıra», *at no time* «heç (bir) vaxt)», *at the same time* «eyni vaxtda (eyni zamanda)».

*Time* sözü qeyd olunan ifadələrdən savayı, kəmiyyət göstəriciləri, işarə əvəzlikləri və s. vasitələrlə əlaqəyə girərək sintaktik zaman ifadə edir.

*Time* sözü *once* və *upon* sözlərinin əlavəsilə işlənməklə qeyri-müəyyən keçmiş zamanı bildirir. Bu birləşmələr Azərbaycan folklor dilində işlənən «biri varmış, biri yoxmuş» ifadəsinə müvafiq gəlir, məzmun və ifadə planı ilə ondan fərqlənir. Müq. et:

***Once upon a time***, *it matters little when, and in stalwart England, it matters little where, a fierce battle was fought* (Ch.Dickens).

*Time* sözü təklikdə və təyinediciləri ilə birlikdə subyekt, obyekt və təyin vəzifələrində işlənir:

***The time*** *is on me when I really must make myself look nice!* (J.Galsworthy). *I've so little time. I cannot afford the time ... it is a shame they give them* ***such long time*** (J.Galsworthy).

Temporal birləşmələr «sözönü + (zaman bildirməyən) isim» modeli əsasında da yaranır. Belə konstruksiyada sözönü yerində *after, before, since, prior, in, during* və s. sözlər işlənir:

*One should never do anything that one cannot talk about* ***after dinner***. (O.Wilde) *'And if any pleasure,' she said* ***after a short pause*** (Ch.Dickens). ***Before and after dinner*** *they played dominoes. You could hardly have been here* ***since your boyhood*** *without my knowledge* (Ch.Dickens). ***Prior to her marriage*** *she was a teacher* (BARS).

Həmin konstruksiyaların əksəriyyətinin Azərbaycan di-

lində qarşılığı «isim (çıxışlıq halda) + qoşma» modeli üzrə əmələ gələn birləşmələr uyğun gəlir. Müq. et: *after dinner – nahardan sonra, before and after dinner – nahardan əvvəl və sonra, since your boyhood – uşaqlığından bəri* .

### 5.1.2. Temporallığın tərkiblərlə ifadəsi

Söz birləşmələri kimi, tərkiblər də dilin qrammatik qanunları əsasında nitqdə birləşmələr şəklində təzahür edən sintaktik vahidlərdir. Azərbaycan və ingilis dillərində tərkiblər felin təsriflənməyən formaları əsasında yaranır. Qarşılaşdırdığımız dillərdə felin təsriflənməyən formaları say baxımından uyğun gəlsə də, tərkibcə fərqlənir. Burada fərqlilik Azərbaycan dilində feli bağlama, ingilis dilində cerund formalarında özünü göstərir. Temporal birləşmə əmələ gətirmək xüsusiyyəti Azərbaycan dilində feli sifət və feli bağlama, ingilis dilində isə feli sifət və cerunda xasdır.

#### 5.1.2.1. Temporallığın Azərbaycan dilində feli bağlama tərkibi ilə ifadəsi

Cümlədə feli bağlamaların əsas vəzifəsi əsas feli tərzə və zamana görə təyin etməkdir. Həmin xüsusiyyət feli bağlama tərkiblərində də qalır.

Azərbaycan dilində feli bağlama yaradan şəkilçilər sayca çox deyildir. Qeyd etmək lazımdır ki, bizi burada daha çox feli bağlamaların yaranma üsulu yox, feli bağlama tərkiblərinin sintaktik zaman ifadə etməsi maraqlandırır. Lakin feli bağlamaların hansı şəkilçilərlə düzəlməsi məsələsi təsnifatı asanlaşdırır, ona görə də biz feli bağlamaların yaranma üsulundan bu məqsədlərdə istifadə edirik. Onlardan zaman mənasına malik olanlar aşağıdakılardır:

- *andə*[2] şəkilçili feli bağlamalarla yaranan tərkiblər. Bu şəkilçi ilə düzələn feli bağlamalar adlıq, təsirlik, yönlük, yerlik və çıxışlıq hallarında olan sözlərlə əlaqəyə girərək tərkiblər əmələ gətirir. Feli bağlamanın hansı halda olan sözlə əlaqəyə girməsinin mətnin təşkili baxımından mühüm əhəmiyyəti vardır. Məsələn, adlıq halda olan sözlə əlaqəyə girən feli bağlama müəyyən mənada onun fərdi, məxsusi «predikat»ı olur. Misallara diqqət yetirək:

***Qonaqlar*** (a.h.) ***dağılışanda*** *.... biz bir yerdə çıxdıq. Bir* ***adam tələsəndə, sağla-solu çaşdıranda*** *idman müəllimimiz deyərdi ki, sağı-solu yadında saxlaya bilmirsənsə, yadında saxla: arpa bu yana, buğda bu yana* (Anar). *Bəlkə, axşam* ***qaranlıq qarışanda*** *oğurlanıb sizə gəldim* (İ.Şıxlı).

Qeyd edək ki, *şər qarışanda* birləşməsi *qaranlıq qarışanda* ifadəsindən daha məqbuldur.

***Qardaşım*** (a.h.) ***yadıma*** (yön. h.) ***düşəndə*** *Şamxalın şən ürəyi kövrəldi, həm də qəzəbi artdı* (İ.Şıxlı). ***Onlar*** (a.h.) *paltarlarını geyinib* ***sahilə*** (yön.h.) ***qayıdanda*** *artıq dan yerinə səda düşmüşdü* (İ.Şıxlı).

*Səni görməyə də bilərdim; amma məsafədən belə duyurdum –* ***sahil kəndlərinin sakinləri*** (a.h.) ***dənizi*** (təs.h.) ***görməyəndə belə*** *duyduqları kimi* (Anar).

Yuxarıdakı cümlədə *dənizi* sözü eyni zamanda həm *görməyəndə* feli bağlamasına, həm də *duyduqları* felinə aiddir. Burada *belə* qüvvətləndirici ədatının işlənməsi də nəzəri cəlb edir.

*Amma* ***atasının*** iki qardaş arasında ***ayrı-seçkilik saldığını*** (təs. h.) ***xatırlayanda*** *tutuldu* (İ.Şıxlı). *Eyvaz da gəlib* ***qoyunları*** (təs. h.) ***Hacının ağılında*** (yer. h.) ***görəndə*** *lap dondu* (Ə.Cəfərzadə). ***Qapıdan*** (çıx. h.) ***çıxanda*** *eşitdim ki, Mədinə makinada nə isə yazır. Onun uzun barmaqları vardı və* ***makinada*** (yer. h.) ***yazanda*** *adama elə gəlirdi ki, piano çalır* (Anar). ***Qaranlıqdan*** (çıx. h.) ***işığa*** (yön. h.) ***çıxanda*** *gözü qa-*

*maşan adamlar kimi qayadan qaynayan su da azadlığın bu ilk anında nə edəcəyini bilmir*(S. Rüstəmxanlı).

Beləliklə, nümunələrdən görünür ki, *-anda*² şəkiliçili feli bağlamaların yaratdıqları tərkiblər bütün hallarda müəyyən situasiya ilə bağlı sintaktik zaman bildirirlər.

- *dıqca*⁴ şəkilçili feli bağlamalarla yaranan tərkiblər. Bu şəkilçili feli bağlamalar əsas fellə ifadə olunan hərəkətin davamlılığını bildirir, fasiləsizlik, intensivlik mənaları ifadə edir. O, ismin adlıq, yönlük, təsirlik hallarında olan sözlərlə əlaqəyə girərək tərkiblər əmələ gətirir. Məsələn:

***İllər*** (a.h.) ***keçdikcə*** *Zərnigar yaşa dolur, nazik ucaboy bir qıza dönürdü* (İ.Şıxlı).

***Daşlar*** (a.h.) ***yuvarlandıqca*** *uçurumun şiş qayalarına dəyib atlanaraq, dəhşətli gürultu qoparırdı* (İ. Əfəndiyev).

***Ərşad*** (a.h.) ***belə düşündükcə*** *addımlarını da yeyinlədir, heyvanları nəfəsini dərməyə qoymurdu* (İ. Əfəndiyev).

***Hava*** (a.h.) ***qaraldıqca*** *bu hiss daha da güclənir və eyni zamanda əl-qolunu bağlayırdı* (Anar).

***Məmmədhəsən əmi*** (a.h.) ***oğluna*** (yön. h.) ***yalvardıqca*** oğlan səsini ucaldırdı (C. Məmmədquluzadə).

***Ustalar*** (a.h.) *çəkiclə* ***dəmiri*** (təs.h) ***döyəcdədikcə*** *danqıltı şəhəri başına götürür, dəmirçixanalardakı zindan səslərini belə batırırdı* (İ. Şıxlı).

Bu cümlələrdə *illər keçdikcə, hava qaraldıqca, Məmmədhəsən əmi yalvardıqca, ustalar dəmiri döyəclədikcə* feli bağlama tərkiblərinin əsas feldən fərqli müstəqil subyekti vardır. *Ərşad belə düşündükcə* feli bağlama tərkibinin subyekti eyni zamanda əsas felin də subyektidir.

*Hava qaraldıqca* və *ustalar dəmiri döyəclədikcə* feli bağlama tərkibləri bir felə yox, həmcins xəbərlər kimi çıxış edən iki əsas felə aiddir. Buna oxşar halı *daşlar yuvarlandıqca* feli bağlama tərkibinin işlənməsində də müşahidə edirik, lakin bu-

rada həmcins xəbərlərdən biri (*atlanaraq=atlanırdı*) feli bağlama formasında təqdim olunmuşdur.

*-mış*[4] şəkilçili feli bağlama ilə yaranan tərkiblər. Qeyd etmək lazımdır ki, bu şəkilçi Azərbaycan dilçilik ənənəsində daha çox feli sifət şəkilçisi kimi tanınır, lakin canlı danışıq dilində həmin şəkilçinin artırıldığı söz özünü feli bağlama kimi də göstərir. Məsələn:

***On ikiyə on dəqiqə qalmış*** *masanın arxasına keçdim* (Anar).

Bu cümlədə *qalmış* sözünün feli bağlama olduğunu onun *qalanda, qalarkən* feli bağlamaları ilə əvəz edilə bilməsi də təsdiq edir.

*-a*[2] şəkilçili feli bağlama ilə yaranan tərkiblər. Bu şəkilçi ilə düzələn feli bağlamalar eyni felin təkrarı ilə yaranır: *axa-axa, gedə-gedə* və s.

*-a*[2] şəkilçili formanın daha çox tərz mənalı olması inkaredilməzdir. Lakin bununla yanaşı, onun müəyyən hərəkətin icrası ilə bağlı olan zaman bildirməsi də göz önündədir. Məsələn: *Tələbə soyunub yatağına girdi. Yuxuya* ***gedə-gedə*** *düşünürdü* (Anar).

Yuxarıda qeyd etdiklərimiz həm yazılı dildə, həm də danışıqda geniş işlənən feli bağlamalar və onların yaratdıqları tərkiblərdir. Azərbaycan ədəbi dilində onlardan başqa, danışıq dilində məhdud dairədə işlənən daha bir neçə feli bağlamaya təsadüf edilir.

*-arkən*[2] şəkilçili feli bağlamalarla yaranan tərkiblər. Bu şəkilçinin yaratdığı feli bağlamalar -anda[2] şəkilçisinin yaratdığı feli bağlama ilə sinonimdir. Həmin iki şəkilçi ilə əmələ gələn feli bağlamalar arasında fərq ondan ibarətdir ki, *-anda*[2] şəkilçisi ilə əmələ gələn feli bağlama dəfələrlə təkrarlanan, *arkən*[2] şəkilçili feli bağlama isə bir dəfə icra olunan hərəkətə işarə edir. Müq. et: *kitabı oxuyanda, kitabı oxuyarkən.* Nümunələrə diqqət edək:

*İndi o,* ***makinasında mənim verdiyim böyük materialı yazarkən*** *heç ağlına da gətirmirdi ki, bu materialı ona mən vermişəm. Biz bulvarla* ***evə qayıdarkən*** *o mənə həlak olmuş əri haqqında danışdı. Ancaq* ***dəhliz qapısının qarşısında ayrılarkən*** *o, əlini tələsik mənə uzatdı* (Anar).

***Çarığın bağlarını bərkitmək istərkən*** *gözü əmisinin yalın ayaqlarına sataşdı* (İ.Şıxlı). *Əlbəttə,* ***bu mənzilləri alarkən*** *biz hələ evlənməmişdik.* ***İçəri girərkən*** *ona elə gəldi ki, otaqda nə isə dəyişmişdir*(Anar).

Verilmiş nümunələrin çoxunda diqqəti feli bağlama tərkiblərinin subyektlərinin implisit şəkildə ifadə olunması cəlb edir. *Dəhliz qapısının qarşısında ayrılarkən* feli bağlama tərkibində subyekt ifadə olunmamışdır, lakin onu bərpa etmək də mümkündür. Həmin subyekt «biz» də, «o» da ola bilər.

*Çarığın bağlarını bərkitmək istərkən* feli bağlama tərkibində də subyekt ifadə olunmamışdır, onu *gözü sataşdı* ifadəsinə görə bərpa etmək mümkün olur («o»)

*-dıqda*$^4$ şəkilçili feli bağlama ilə düzələn tərkiblər. Bu şəkilçi də *-anda*$^2$ şəkilçili feli bağlamalarla sinonim olan feli bağlamalar yaradır. Misallar:

***Biz səbəbini soruşduqda*** *dedi ki, evdə sirkə yoxdur* (C.Məmmədquluzadə). ***Onun geyimindən seminarist olduğunu bildikdə*** *daha da təəccübləndi* (İ.Şıxlı). *Zərnigar xanım* ***küləyin otu*** *bir yumaq kimi büküb xırman yerinə qədər* ***apardığını gördükdə*** *yerindən tərpənmədi* (İ.Şıxlı).

Sonuncu iki cümlədə subyekt nə feli bağlama tərkibində, nə də cümlələrin əsas hissələrində ifadə olunmuşdır. Onun «o» olduğunu həmin cümlələrin xəbərlərindən müəyyənləşdirmək olur.

*-məmiş*$^2$ şəkilçili feli bağlamalarla düzələn tərkiblər. Bu şəkilçi *-ma*$^2$ inkar şəkilçisi ilə *-mış*$^2$ şəkilçisinin qovuşmasından yaranmışdır. Cümlədə *-məmiş*$^2$ şəkilçili feli bağlamanın

ifadə etdiyi hərəkət baş verməmiş əsas fellə ifadə olunan hərəkət baş verir:

O, ***ağzını açmağa macal tapmamış,*** *Molla Sadığın yanındakı şagirdlərdən biri qabağa yeridi* (İ.Şıxlı). *...**Hələ heç kəs nə olduğunu anlamağa macal tapmamış**, yer tərpənməyə başladı* (Ə.Cəfərzadə). *Padşah ... mürgüləyən kimi **gözünün çimirini almamış** dik atılırdı. Onu arvadının xorultusu oyadırdı* (Anar).

*-məmiş*[2] şəkilçisi ilə zaman bildirən feli bağlamaların yaranması zəminində bəzi sırf zaman zərflərinin də formalaşdığını görürük:

*Ərşad göydə sayrışan ulduzlara baxıb müəyyən elədi ki, **işıqlanmamış** çatacaqlar Kürdobaya* (İ.Şıxlı).

*-ınca*[4] şəkilçili feli bağlamalarla yaranan tərkiblər. Bu şəkilçi həm təsdiq, həm də inkar formalarında işlənir. Belə ki, müvafiq feli bağlamalar təsdiq formasında əsas fellə ifadə olunan hərəkətin bilavasitə və qısa bir müddətdə baş verdiyini bildirdiyi halda, feli bağlamanın inkar forması həmin zamanı potensial imkan kimi təqdim edir. Məsələn:

***Şair yumru əlin yumşaq təmasını hiss edincə**, qarşısındakının mehriban insan ola biləcəyini düşündü. **Cənab İvanov müəllimin sözlərini eşidincə**, uçundu* (Ə.Cəfərzadə).

Həmin şəkilçinin inkar formasında işlənən feli bağlama əsas felin bildirdiyi hərəkətin zaman həddini ifadə edir:

*Ərşad da cavab verdi ki, dayıma deyərsən, **Sərvinazı götürüb, öz damımıza gətirməyincə**, bu tüfəngdən əl çəkən deyiləm* (İ.Əfəndiyev).

*-araq*[2] şəkilçili feli bağlamalarla yaranan tərkiblər. Bu şəkilçi vasitəsilə düzələn feli bağlamalar adətən tərz mənasına malik olur. Lakin əldə olan material göstərir ki, onlar sintaktik zaman da ifadə edir. Məsələn:

***İlk dəfə olaraq*** *o öz işi haqqında ağzından söz qaçırtdı.* Müq. et: ***İlk dəfə idi*** *ki, bizim söhbətimizi qammalar müşaiyət etmirdi* (Anar).

### 5.1.2.2. Temporallığın Azərbaycan dilində feli sifət tərkibləri ilə ifadəsi

Azərbaycan dilində feli sifətlərin felə xas olan xüsusiyyətlərindən biri onların zaman bildirməsidir. Belə ki, *-an*$^2$ şəkilçisi ilə düzələn feli sifətlər indiki zamanı, *-acaq*$^2$ şəkilçisi ilə düzələn feli sifətlər gələcək zamanı, *-mış*$^4$ və *dıq*$^4$ şəkilçiləri ilə düzələn feli sifətlər keçmiş zamanı bildirir. Feli sifətlərin zaman bildirmə xüsusiyyəti onların əmələ gətirdikləri tərkiblərdə də qalır.

Feli sifətlər cümlədə üç cür işlənir. Birincisi, onlar təyin funksiyasında çıxış edir. İkincisi, onlar substantivləşərək hal şəkilçisi qəbul edirlər. Bu məqamda onlar məkani hallarda, yəni yönlük, yerlik və çıxışlıq hallarında zərflik xüsusiyyəti kəsb edir. Üçüncüsü, feli sifətlər qoşmalarla işlənərək zaman zərfliyi funksiyasında çıxış edir.

*-an*$^2$ şəkilçili feli sifətlərin əmələ gətirdikləri tərkiblər:

***Bu açıq-aşkar hiss olunan*** *şadlıq da onu deyirdi ki, axır ki, sənin də axırın çatdı* (Elçin). *....Bu xalıların, gəbələrin* ***alışıb yanan*** *rəngləri,* ***mütəkkələrin, döşəkçələrin üzünə çəkilmiş, qapı-pəncərələrə tutulmuş*** *hind mahudunun işıltısı ... gözdən itdi* (Elçin)

*-mış*$^4$ şəkilçili feli sifətlərin əmələ gətirdikləri tərkiblər:

*O* ***bir yaşı təzəcə tamam olmuş*** *oğlundan danışırdı* (Anar). *Sonra o, bu pıçıldayanların səsindəki ehtirasdan, hərislikdən tanıdı ki,* ***bunlar uzun-uzadı illər boyu ölüb-getmiş*** *dövlət sahibləri, tanış-bilişlərdi* (Elçin).

- *dıq*$^4$ şəkilçili feli sifətlərin əmələ gətirdikləri tərkiblər:

***Kəniz-qaravaşların gizli bir hüznlə onunçün oxuduqla-rı*** *mahnıların,* ***çaldıqları*** *udun səsi eşidilməz oldu* (Elçin).

Feli sifətlər və onların əmələ gətirdikləri tərkiblər qoşmalarla da işlənir. Onlar ya sərbəst, ya da daha böyük tərkiblərin komponenti kimi işlənir.

Feli sifətlərin qoşmalarla işlənməsilə yaranan tərkiblər. Feli sifətlər təklikdə olduğu kimi, müəyyən qoşmalar qəbul etməklə də tərkiblər yaradır. Qoşmaların iştirakı ilə yaranan tərkiblər cümlədə zaman zərfliyi vəzifəsində çıxış edir.

Bir qədər yuxarıda feli sifət tərkiblərindən bəzilərini feli sifət düzəldən şəkilçilərə görə nəzərdən keçirmişdik. Burada isə feli sifət tərkiblərini qəbul etdikləri qoşmalara görə nəzərdən keçirəcəyik. Qeyd etmək lazımdır ki, qoşmalar qoşulduqları tərkiblərin sintaktik vəzifəsinə görə seçilib, müvafiq mənaları başlanğıc, dəvamiyyət və sonluq əlamətlərinə görə dəqiqləşdirir.

*Bəri* qoşması qoşulduğu feli sifətin ifadə etdiyi hərəkətin istinad nöqtəsi kimi götürməklə sintaktik zaman ifadə edir. Məsələn:

***O öləndən bəri*** *evdə heç kəs bir dəfə də olsun bu səsə qulaq asmağa ürək eləməmişdi* (Anar). ***Əsəd rəhmətə gedəndən bəri*** *Bikə xalanın ən istəkli, ən əziz kürəkəni Murtuz olmuşdu.* ***Mən burda işləyəndən bəri*** *bu iki paltonu bir yerdə almışam, bir yerdə qaytarmışam* (Anar).

*Əvvəl* qoşması qoşulduğu feli sifətin ifadə etdiyi hərəkətin baş vermədiyini əsas felin ifadə etdiyi hərəkətin baş verməsinin istinad «nöqtə»si kimi təqdim edir. Nümunələr:

*Ayağını üzəngiyə qoyub* ***atın belinə qalxmazdan əvvəl*** *mehtərin haqqını verdi* (İ.Şıxlı). ***Ağası bəy sözləri tərcümə etməzdən əvvəl*** *Seyyid cümlənin mənasını dərhal anlamışdı.* (Ə.Cəfərzadə). *Hətta Tofiq getsəydi də,* ***onun gedəcəyi məlum olmamışdan*** *bir neçə dəqiqə* ***əvvəl*** *Həmidə xala nə sevinərdi* (Anar).

*Sonra* qoşması çıxışlıq hal şəkilçisi qəbul etmiş *-an*$^2$, *-dıq*$^4$ şəkilçili feli sifətlərə qoşulur. Onun vasitəsilə əsas fellə ifadə olunan xəbərin zamanı feli sifətlə ifadə olunan hərəkətin icrasından sonraya aid edilir.

*-an*$^2$ şəkilçili feli sifətlərlə işlənən *sonra* qoşmasına aid misallar: ***Qaranlıq qarışıb, əl-ayaq yığışandan sonra*** *Zərnigar xanım yan otağa çəkildi.* ***Qardaşı məktəbi qurtarandan sonra,*** *allah bilir, hara çıxıb gedəcək* (İ.Şıxlı). ***Adamlar uşaqların tamamilə yer altından çıxdığına əmin olandan sonra*** *qonşu evlərə dağılışdılar* (İ.Şıxlı). *... Padşah* ***səhər xorultusu kəsiləndən sonra*** *da yata bilmirdi* (Anar).

*-dıq*$^4$ şəkilçili feli sifətlərin *sonra* qoşması ilə işlənməsinə aid misallar: *Güləsər* ***Salatını yıxıldığı yerdən qaldırdıqdan sonra*** *belini düzəldib göyə baxdı.* ***Hava qaraldıqdan sonra*** *pristavın otaqlarında çıraqları yandırdılar. ...**qatarın arxasınca xeyli baxdıqdan sonra** kişi yol çantasını götürüb bircə budkadan ibarət olan stansiyaya yaxınlaşdı* (İ.Şıxlı). *Ancaq* ***dalınca heç kəsin gəlmədiyini yəqin etdikdən sonra*** *atı yavaşıtdı* (Yusif Şirvan).

*Qədər* qoşması əsasən *-an*$^2$ şəkilçili feli sifətlərə yönlük hal şəkilçisindən sonra qoşulmaqla, əsas fellə ifadə edilən hərəkəti feli sifətlə ifadə edilən hərəkətin icrasından əvvəlki sintaktik zamana bağlayır. Məsələn:

*Onlar* ***Əşrəf gələnə qədər*** *hər şeyi hazır etmək istəyirdilər.* ***O dillənənə qədər*** *Zərnigar xanımın böyük qardaşı cavab verdi* (İ.Şıxlı). ***Mingəçevir tikilənə qədər*** *Kür bəzən o qədər qalxırdı ki, Ağcabədiyə qədər qayıqla meşənin içindən keçib gedərdik* (Anar). *-Əhd, eləmişəm,* ***Bəhmən gələnə qədər*** *saz köynəkdən çıxmayacaq,-dedi* (İ.Hüseynov).

*-can*$^2$ qoşmasının ifadə etdiyi qrammatik məna *qədər* qoşmasının ifadə etdiyi mənanın eynidir. Ona görə də onları cümlədə bir-biri ilə əvəz etmək mümkündür.

*Bu dəfə cavab vermək əvəzinə Əjdər uzun müddət Sərvərin gözlərinin içinə baxdı,* ***onu çaşdıranacan, hətta hürküdüb qorxudanacan*** *baxdı və uzun-uzadı baxışdan sonra nəhayət ki, dilləndi* (Ə.Əylisli). ***Seyid özünü içəri atanacan*** *iş-işdən keçmişdi* (Ə.Cəfərzadə). ***Kənd sovetinin həndəvərinə yaxınlaşanacan*** *Nəsir müəllim qırğı kimi gedirdi* (Ə.Əylisli).

*Kimi* qoşması *-an*[2] şəkilçili feli sifətlərə qoşulur. Cümlədə feli sifətlə ifadə olunan hərəkət baş verdikdən bilavasitə sonra əsas felin ifadə etdiyi hərəkət baş verir. Məsələn:

***Qoç qalxan kimi*** *o biri üç erkək də qalxdı* (İ.Əfəndiyev). ***Məhəmməd*** *dinmədən irəli keçdi və* ***keçən kimi də*** *kürəyinin ortası alışdı* (Ə.Cəfərzadə). ***At sahibinin süvar olduğunu duyan kimi*** *başını dik tutub kişnədi. ...* ***Uşaqlar Molla Sadığı görən kimi*** *aşağı sinib gizləndilər* (İ.Şıxlı). ***Mən gələn kimi*** *yatdım. ... Dünən* ***biz ayrılan kimi*** *sənə zəng elədim* (Anar).

Göründüyü kimi, temporallığın Azərbaycan dilində feli sifət tərkibləri ilə ifadəsi geniş yayılmışdır.

### 5.1.2.3. Temporallığın ingilis dilində feli sifət tərkibləri ilə ifadəsi

İngilis dilində, məlum olduğu kimi, feli sifətin iki növü vardır. Onlardan biri *-ing* şəkilçisi ilə əmələ gəlib, indiki zaman feli sifəti adlanır. İkinci feli sifətin əmələ gəlməsi feldən asılı olaraq müxtəlif şəkildə baş verir. Bu, keçmiş zaman feli sifəti adlanır. Feli sifətlər cümlədə tərkib əmələ gətirmək xüsusiyyətinə malikdir.

İngilis dilində indiki zaman feli sifəti əşya və ya hərəkətin əlamətini ifadə etdiyi üçün mənasına görə sifətə və zərfə yaxındır: *He was a star student in his third year, already producing salable work.*

Feli sifət tərkibi həm qrammatik, həm də nominativ cəhətdən bütöv söz birləşməsidir və onun əsas elementi atributiv

funksiya daşıyan feli sifətdir. Bütövlükdə bu birləşmə cümlənin formal-semantik strukturunu mürəkkəbləşdirir.

Cümlənin semantik-sintaktik quruluşunda feli sifət tərkibi nəinki təyin etdiyi obyektə, həm də qrammatik fel forması ilə ifadə olunmuş predikata münasibətdə asılı mövqedə olur.

Məlum olduğu kimi, feli sifət nisbi zaman bildirir. İngilis dilində feli sifət tərkibləri əsas fellə ifadə olunan hərəkət barəsində əlavə informasiya verir. Həmin informasiya feli sifətlə ifadə olunan hərəkətin əsas fellə ifadə olunan hərəkətlə nisbəti, yəni eynizamanlılığı, ondan əvvəl və ya sonra gəlməsi ilə bağlı olur. Müşahidələr göstərir ki, feli sifətlə ifadə olunan hərəkətin əsas fellə ifadə olunan hərəkətlə eynizamanlılığı iki şəkildə, yəni tam eynizamanlılıq və qismən eynizamanlılıq formasında olur.

Feli sifətlə və əsas fellə ifadə olunan hərəkət, iş hadisələrin tam eynizamalılığı o halda baş verir ki, onların baş verdiyi zaman kəsikləri bütün nöqtələrdə üst-üstə düşür. Bu xüsusiyyət daha çox indiki zaman feli sifətinə aiddir. Müqayisə edək:

1. *While reading an English book one may come across some new words and expressions.*

2. *While reading an English book, I came across some new words and expressions.*

3. *While reading an English book, you will come across some new words and expressions.*

Hər bir cümlədə indiki zaman feli sifəti ilə ifadə olunan hərəkət və əsas fellə ifadə olunan hərəkət zaman kəsiyi etibarilə tam üst-üstə düşür.

Qismən eynizamanlılıq o halda baş verir ki, hərəkətlər hansısa zaman müddətlərinin birində üst-üstə düşür. Məsələn:

*They separated, crying quietly* (J. Galsworthy).

Öncəgəlmə münasibəti keçmiş zaman feli sifəti və ya indiki zaman feli sifətinin perfekt forması ilə ifadə olunan hərəkətlə bağlı olur:

*Having reached the door, he turned the key and opened the door* (O.Wilde). *Having gained her degree, se was doing no more studying* (J.London).

Sonragəlmə münasibəti feli sifətlə ifadə olunan hərəkət ilə əsas fellə ifadə olunan hərəkətin heç bir nöqtədə kəsişməməsində özünü göstərir. Bu zaman bir hərəkətin başlanmasına qədər digər hərəkətin bitməsi lazım gəlir:

*Passing the road, the children entered the garden. Having open the bag, I took out a pen.*

Beləliklə, ingilis dilində feli sifət tərkiblərinin nəzərdən keçirilməsi onların Azərbaycan dilindəki analoqlarından fərqli cəhətlərə malik olduğunu göstərir. Aqlütinativ quruluşlu Azərbaycan dilindən fərqli olaraq, ingilis dilində feli sifətlərin gələcək zaman forması yoxdur.

### 5.1.2.4. Temporallığın ingilis dilində cerund tərkibi ilə ifadəsi

Cerund felin təsriflənməyən forması olub, həm ismi, həm də feli xüsusiyyətlərə malikdir. Felin digər təsriflənməyən formalarında olduğu kimi, cerund da mütləq deyil, nisbi zaman bildirir. Cerundla ifadə edilən hərəkətin zamanı cümlədə əsas fellə ifadə olunan zamandan asılıdır. Cerundun iki zaman forması vardır. Qeyri-müəyyən zaman formasında işlənən cerundla ifadə olunan hərəkət cümlədə əsas fellə ifadə olunan hərəkətlə eynizamanlılıq bildirir:

*We happened then to cross the street, and the traffic prevented us from* ***speaking*** (S.Maugham). *You don't mind* ***my smoking*** (J.London).

Hərəkətin perfekt zaman formasında işlənən cerund tərkibi ilə ifadə edilməsi onun cümlədə əsas fellə ifadə olunan hərəkətdən əvvəl icra olunduğunu göstərir:

*My bed at night was under another haystack, where I rested comfortably, after* ***having washed*** *my blistered feet in a stream, and dressed them as well as I was able, with some cool leaves* (Ch.Dickens). *In this room, after* ***having had*** *their quarters for the night allotted to them by two young Fathers, the travellers presently drew round the hearth* (Ch.Dickens).

Müasir ingilis dilində cerund tərkibi müxtəlif sintaktik funksiyalar daşıya bilir. Bu sintaktik funksiyaların əsasında da kommunikasiya prosesinin tələblərinə uyğun olaraq reallaşan semantik funksiyalar dayanır.

### 5.1.3. Temporallığın təktərkibli sadə cümlələrlə ifadəsi

Temporallığın reallaşdığı sintaktik strukturlardan biri təktərkibli sadə cümlədir. Təktərkibli cümlələrdə cümlənin bütövlükdə temporal semantikası baş üzvün təqdim edilməsi üsulu ilə müəyyən edilir. Təktərkibli cümlələrin növlərindən yalnız ikisi – adlıq və şəxssiz cümlələr tədqiqatda araşdırılmışdır.

#### 5.1.3.1. Temporallığın adlıq cümlə ilə ifadəsi

Məlumdur ki, təktərkibli adlıq cümlələrin semantikası cümlə modeli, həmin modelin leksik cəhətdən dolğunlaşması və kontekst kimi komponentlər əsasında formalaşır, ona görə də hər hansı bir əşyanın, hadisənin mövcud olmasının, varlığının intonasiyanın köməyi ilə təsdiq və ya inkar edilməsi adlıq cümlələr üçün invariant məna hesab olunur. Bu, adlıq cümlə-

lərə verilən tərifdən də aşkar görünür[1]. Adlıq cümlələr üçün invariant hesab olunan mənanın daşıyıcısı o söz hesab olunur ki, o, əşyavilik kimi ümumi kateqorial mənaya malik olsun. Bu da adlıq halda olan sözür. Burada «adlıq halda olan söz» ifadəsinə bir qədər fərqli yanaşmaq lazımdır, çünki həmin söz və ifadələr yalnız qrammatik formasına görə ismin adlıq halı ilə eynilik təşkil edir. Əslində həmin sözlərdə adlandırma və ya nominasiya vardır. Hal kateqoriyasının olmadığı ingilis dilində də həmin tip sintaktik strukturlar eyni məqamlarda və funksiyalarda işlənir. Belə sintaktik strukturlar nominativ cümlələr adlanır. Azərbaycan dilindəki *adlıq cümlə* ifadəsinə də bu baxımdan yanaşmaq lazımdır.

Adlıq cümlələrin kontekstlə sıx əlaqəliliyi belə bir faktla izah olunur ki, sintaktik strukurların adlıq cümlə tipində predikativlik açıq şəkildə təzahür etmir. Adlıq cümlələr real modallıq və indiki zaman mənası təzahür etdirir. Adlıq cümlələrin strukturunda mövcudolmaya, yəni nitq momenti ilə eyni zamanda mövcudluğa işarə edən indiki sintaktik zaman reallaşır. Məsələn: *Səngərlər. Təlaş. Ölənlər və yaralananlar*[2]*. A cavern. In the middle, a boiling cauldron* (W.Shakespeare). Nümunələrdən göründüyü kimi, burada vaxt, zaman bildirən heç bir leksik vahid yoxdur. Bununla belə, müəyyən hadisə və ya prosesin mövcudluğu göz önündədir. Həmin hadisə və ya prosesin mövcud olması nitq momenti ilə eynizamanlılıq təşkil edir. Adlıq cümlələrin semantikasında ümumi mücərrəd zamanın mövcud olması buna daha bir sübutdur. Mövcudolma həmişə indiki zamanla bağlıdır. Adlıq cümlələrdə hökmün hansı zamana aid olması ilə bağlı mübahisə edən tədqiqatçılar,

---

[1] Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, s. 191; Abdullayev Ə.Z., Seyidov Y.M., Həsənov A.Q. Müasir Azərbaycan dili. Sintaksis. 1V hissə, Bakı, 1985, s. 272; İzahlı Dilçilik terminləri, Bakı, 1989, s. 9.

[2] Misallar Q.Kazımovdan götürülmüşdür. Bax: Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, c. 192.

görünür, bu faktı nəzərə almamışlar. Məsələn, Z.Budaqovaya görə, «adlıq cümlələrdə zaman kateqoriyası qrammatik cəhətdən ifadə olunmadığından onlarda ifadə edilən hökmün zamanı onları əhatə edən cümlənin zamanı ilə müəyyənləşir»[1]. Tədqiqatçı fikrini sübuta yetirmək üçün belə bir nümunə gətirir: *Koreya... Uzaq yol ... Kəsib aranı okeanlar, dağlar, dərələr...*[2]. Misalda adlıq cümlələrdən sonra gələn cümlənin xəbərinin (*kəsib*) keçmiş zamanda işləndiyini nəzərə alan tədqiqatçı hökmün keçmiş zamana aid olduğu qənaətinə gəlir. Diqqət yetirildikdə isə nəqli keçmiş zaman forması ilə (*kəsib*) ifadə olunan hərəkətin nitq momenti vaxtında nəticə etibarilə indiki zamana bağlandığı aşkara çıxır. Bu halda kommunikasiya prosesinin iştirakçısını hal və hərəkətin özündən çox nəticəsi maraqlandırır. Burada tədqiqatçının fikri ilə razılaşmaq çətindir.

Adlıq cümlələrdə hökmün indiki zamana aidliyini təsdiq edən dilçilərin fikirləri daha çox cəlbedicidir: «Adlıq çümlələrin keçmiş və gələcək zaman forması yoxdur. Adlıq cümlələr .... mövcudiyyəti təsdiq edir. Onların inkar forması yoxdur...»[3].

Həm ingilis, həm də Azərbaycan dillərində adlıq cümlələr əsasən bədii və publisistik əsərlərin dilində işlənir. Xüsusən dram əsərlərinin remarkaları adlıq cümlələrdən ibarət olur. Bu tip cümlələrdən istifadə edilməklə əşya, hadisə və proseslərin nitq momenti ilə eyni zamanda mövcud olan vəziyyəti barədə qısa və yığcam məlumat çatdırılır.

Qarşılaşdırdığımız dillər üçün oxşar cəhətlərdən biri adlıq cümlələrin mətn daxilində predikativ cümlələrlə müşayiət

---

[1] Bax: Budaqova Z.İ. Təktərkibli cümlə //Müasir Azərbaycan dili, III cild, Sintaksis, Bakı, Elm,1981, s. 277.

[2] Yenə orada, s. 277.

[3] Cavadov Ə. Təktərkibli sadə cümlələr // Müasir Azərbaycan dili. Sintaksis. II kitab, Azərbaycan Dövlət Tədris Pedaqoji Ədəbiyyatı Nəşriyyatı, Bakı, 1962, s. 162-163.

edilməsidir. Bu hal onların cümlə kimi dərk olunmasına kömək edir. Nümunələr:

*Kişinin evi. Axşamçağı.* ***Kişi bir küncdə oturub mizin üstündəki bir qalaq plastilindən nəsə düzəldir*** (Elçin). *1929-cu il. Hadrut. Sübh tezdən.* ***Quşların səsi, qoyun-quzunun mələşməsi eşidilir*** (Elçin). *Yarıqaranlıq otaq.* ***Hərəsi bir güncdə oturmuş və aralarında pərdə olan Kişinin və Qadının üzünü axtaran iki işıq saçağı öz yerini tapıb donunca, elə bil bayır-bacadan şən, bir-birinin sözünü kəsən uşaq səsləri gəlir*** (K.Abdulla).

*The Wimpole Street laboratory. Midnight. Nobody in the room.* ***The clock on the mantelpiece strikes twelve. The fire is not alight: it is a summer night*** (B.Shaw). *Next day at 11 a.m. Higgins's laboratory in Wimpole Street.* ***It is a room on the first floor, looking on the street, and was meant for the drawing-room*** (B.Shaw).

Qarşılaşdırdığımız dillərdə temporallıq bildirən adlıq cümlələrin əşya, hadisə və proseslərin təsvir məqamında işlənməsi geniş şəkildə müşahidə olunur. Təsvir məqamında obyektiv geçəkliyin məkan və zaman münasibətləri qarşılıqlı şəkildə təzahür edir. Yuxarıda verilmiş nümunələrdə bunu görmək çətin deyildir. Əlavə nümunələrə nəzər salaq:

*1939-cu il. Bakı. Məktəb. Məktəbin direktoru Ələsgər müəllimin kabineti* (Elçin).

*Covent Garden at 11.15 p.m. Torrents of heavy summer rain. Cab whistles blowing frantically in all directions* (B.Shaw).

İngilis və Azərbaycan dillərində temporallıq ifadə edən adlıq cümlələrdə temporallığı ifadə edən leksik vasitələr arasında mənasında zaman anlayışı olan isimlər (əsasən günün hissələrinin, həftə günlərinin, fəsillərin və ayların adları), sıra saylarının *il* ismi ilə əmələ gətirdiyi söz birləşmələri daha çox seçilir:

***İyun. 1953-cü il.*** *Bu gün işdən qayıdan zaman. Boru zavodunun keçdim yanından* (N.Xəzri)[1]. *Kişinin evi.* ***Axşam****. Kişi oturub qəzetlərə baxır. ... Bağça.* ***Günorta****. Lider bir əli ilə qarnını tutub...* ***1997-ci ilin payızının əvvəlləri****. Kişinin evi.* ***Səhər tezdən*** (Elçin).

***Night****. A lady's bed-chamber in Bulgaria, in a small town near the Dragoman Pass,* ***late in November in the year 1885*** (B. Shaw). ***The sixth of March, 1886*** (B. Shaw). ***Another five days.*** *Then Brenda came to Hilton again* (E.Waugh).

Sonuncu cümlədə adlıq cümlə cümlənin sonrakı hissəsi ilə *then* zərfi vasitəsilə bağlanmışdır.

Deyilənləri yekunlaşdırmaqla, belə bir qənaətə gəlmək olar ki, adlıq cümlələrdə temporal semantika ismin kateqorial mənası ilə təsbit olunur, adlandırma eyni zamanda adlandırılanın mövcudluğunu müəyyən edir.

### 5.1.3.2. Temporallığın şəxssiz cümlə ilə ifadəsi

Azərbaycan və ingilis dillərində temporallığı cümlə səviyyəsində reallaşdıran sintaktik strukturlardan biri şəxssiz cümlələrdir. Sintaktik temporallığın şəxssiz cümlələrlə ifadəsi zaman bildirən söz və ifadələrin predikativ vəzifədə işlənməsi ilə bağlıdır. Bu məsələdə ingilis və və Azərbaycan dillərində oxşarlıq özünü büruzə verir. Oxşarlıq zaman bildirən söz və ifadələrin predikativ vəzifədə işlənməsində təzahür edir. Azərbaycan dilinə dair qrammatika kitablarında şəxssiz cümlələr elə cümlələr adlandırılır ki, mübtədası olmasın və ya təsəvvür edilməsin[2]. Q.Kazımov haqlı olaraq göstərir ki, şəxssiz cümlə-

---

[1] Misal "Müasir Azərbaycan dili"ndən götürülmüşdür. III hissə, Bakı, 1981, s. 278.

[2] Bax: Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, s. 186; Müasir Azərbaycan dili, II cild, Morfologiya, Bakı, 1980, s. 266; Abdullayev

lərdəki məzmun, fikir predmeti xəbərlə birlikdə təsəvvür edilir[1]. İngilis dilindəki şəxssiz cümlələrdə isə Azərbaycan dilindəkindən fərqli olaraq həmişə mübtəda vardır, lakin bu mübtəda formal xarakter daşıyır, heç də real subyekt bildirmir.

Hər iki dildə şəxssiz cümlələr üzərində aparılan müşahidələr onların xeyli hissəsinin zaman bildirdiyi qənaətinə gəlməyə əsas verir. Zaman bildirən şəxssiz cümlələr hər iki dildə ismi xəbərli şəxssiz cümlələrdən ibarət olur. Onların yaranmasında temporal söz və söz birləşmələri iştirak edir. Azərbaycan dilində şəxssiz cümlələrdə xəbərlə təsəvvür edilən fikir predmetinin, məzmunun indiki zamana aidliyi *-dır*[4] xəbərlik şəkilçisi, keçmiş zamana aidliyi *idi, imiş* bağlamaları, gələcək zamana aidliyi isə *olmaq* feli ilə reallaşır. İngilis dilində isə indiki zamana aidlik *to be* felinin üçüncü şəxsin təkində işlənən *is* forması, keçmiş zamana aidlik həmin felin *was* forması, gələcək zamana aidlik isə *will be* forması ilə reallaşır. Nitq prosesində hər iki dildə əsasən indiki və keçmiş zamanlara aid şəxssiz cümlələr istifadə edilir. Azərbaycan dilində keçmiş zamanda *idi* bağlaması ilə işlənən şəxssiz cümlələrə daha çox rast gəlmək olar, *imiş* bağlaması ilə olan şəxssiz cümlələrə isə təsadüf edilmir. Eyni fikri gələcək zamanı *olmaq* feli ilə əmələ gələn şəxssiz cümlələrə də şamil etmək olar. İngilis dilində də gələcək zamana aid şəxssiz cümlələrə təsadüf edilmir. Şəxssiz cümlələrdə temporallığın ifadəsini konkret nümunələr əsasında nəzərdən keçirək:

- *Axı tanışlıq üçün vaxt* (?) ***bir az gecdir***. – ***Gecdir***? *Xeyr*, ***əsil vaxtdır*** (Anar).

Fikrimizcə, birinci cümlədə *vaxt* sözünün işlənməsi yerinə düşmür. Bu, cavab cümləsindən də görünür: ... *əsil vaxtdır*. Sual cümləsinin məzmununa görə gözləmək olardı ki, cavab

---

Ə.Z., Seyidov Y.M., Həsənov A.Q. Müasir Azərbaycan dili. Sintaksis. IV hissə, Bakı, 1985, s.262.

[1] Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004, s. 186

cümləsi *Vaxt əsil vaxtdır* kimi olacaqdır, lakin bu halda tavtologiya ilə qarşılaşmış olardıq.

Beləliklə, deyə bilərik ki, birinci cümlə üçün normal forma belə olmalıdır: «Axı, tanışlıq üçün bir az gecdir». İkinci cümlə isə onu tamamlayır: «Əsil vaxtdır». Hər iki halda mübtəda tələb olunmur. Bu cümlələrin hər ikisi ismi xəbərli şəxssiz cümlələrdir.

Bəzi məqamlarda buna oxşar şəxssiz cümlələrin zaman zərfliyi ilə işləndiyini də görürük:

***İndi gecdir***. *Gedim evimizə, yıxılım-yatım* (Anar).

Eyni tipli cümlələr ingilis dilində də həm indiki, həm də keçmiş zamanda işlənir:

*It was too late* (J.F.Cooper). *It is now twenty minutes to eight* (B.Shaw). *It was summer-time, and lovely weather* (Ch. Dickens).

Şəxssiz cümlələrin xeyli hissəsi təsvir məqsədilə işlənir. Nitq fəaliyyətində bir çox hallarda sintaktik zaman bir proses kimi təqdim olunur. Müvafiq cümlələrin məzmunu ya müəyyən müddətlərin keçməsinin təsviri, ya da zamanın ölçülməsi üçün nəzərdə tutulan qurğuların işinin təsvirindən ibarət olur. Məsələn:

*Yay idi, qovunun təzəcə ağaran vaxtı idi* (Ə.Əylisli). *Səhər beşin yarısı idi* (Anar). *İlin-ayın axır çərşənbəsi idi* (İ.Şıxlı).

*It was a dry cold night* (Ch.Dickens). *It was a fine day, early in spring* (S.Maugham).

*Gecə saat on iki idi* (Anar).

Burada *gecə* sözünü zaman zərfliyi kimi də, mürəkkəb zaman ifadəsinin tərkib hissəsi kimi də qəbul etmək olar. Həmçinin müq. et: - *İndi* ***gecdir***. – *Gecdir*? (Anar).

Yuxarıda qeyd edildiyi kimi, qarşılaşdırdığımız dillərdə şəxssiz cümlələrin xəbəri *ay, gün, il, vaxt* və s. sözlərinin işti-

rakı ilə tərtib olunur. Bunu yuxarıdakı misallarda da görmək olar. Başqa nümunələr gətirək:

*Indi yağışlı* ***axşam****dır* (Anar). *Namazın* ***vaxt****ıdır* (Anar)..

*It was early in the* ***morning*** (Ch.Dickens). *It was* ***a Saturday night*** (Ch. Dickens). *It was* ***a rimy morning*** (Ch. Dickens).

Azərbaycan dilində həmin məqamda zaman mənalı ifadələrdən *neçə* sözü işlənir.

«Neçə ildir» tipli cümlələr daha çox mürəkkəb cümlələrin tərkibində işlənir. Onlar yalnız bu xüsusiyyətinə görə və şəxssiz cümlə olmaları ilə diqqətəlayiq deyildir. Bu cür cümlələrin bir xüsusiyyəti də ondan ibarətdir ki, onlar formal cəhətdən cümlə şəklində olsalar da, aktual üzvlənmə baxımından cümlə üzvü, zaman zərfliyi məqamında işlənir.

Həmin ifadənin xəbər vəzifəsini saxlamaqla, müvafiq cümlə hissəsini «...işlədiyi neçə ildir» şəklində də vermək olar, lakin həmin ifadələr semantik cəhətdən eyni deyildirlər və bu variantı bir qədər əvvəl verdiyimiz mürəkkəb cümlənin əvvəlində işlətmək olmaz.

Şəxssiz cümlə kimi işlənən baş cümləli tabeli mürəkkəb cümlələrin bir cəhəti də diqqəti cəlb edir. Onların tələb etdiyi budaq cümlə (mübdəda budaq cümləsi) şəxsin yerini doldurur, amma bu «şəxs» qrammatik şəxs deyil, məntiqi şəxs, bir növ dildənxaric şəxsdir:

***Neçə gün idi ki****, ... sahibsiz qalmış bu cah-calalın üstündə gələcək əlbəyaxalar ehtirasının qığılcımları sezilirdi.* ***Neçə gün idi ki****, onun üçün bir pənahgah, bir ümid yeri yox idi.* ***Neçə gün idi ki****, o ölürdü, yolüstü qonaq idi* (Elçin). ***Neçə il idi*** *hər həftə bu gün, bu saatlar Feyzulla radioya - yazılışa gəlirdi* (Anar). ***Üç il idi*** *Feyzulla karamel fabrikində dram dərnəyinə rəhbərlik edirdi* (Anar).

### 5.1.4. Temporallığın mürəkkəb cümlələrlə ifadəsi

Zaman münasibətləri və əlaqələri müxtəlif, rəngarəng olduğuna görə, digər əlaqələrdən fərqlənir. Bir hərəkətin digər bir hərəkətə işarə edilməklə baş verməsindən danışarkən, onlar arasında münasibətlər müxtəlif ola bilər, yəni bir hadisə və ya hərəkət digəri ilə eyni vaxtda, ondan bir qədər və ya çox əvvəl, yaxud bir qədər və ya çox sonra icra edilə bilər. Bir hərəkət və ya hadisənin zamanını onunla səbəb-nəticə əlaqəsi ilə bağlı olan, yaxud zaman baxımından onunla təsadüfən eyni vaxtda baş verən başqa bir hərəkət və ya hadisənin zamanına münasibətdə göstərilməsi tamamilə adi haldır. Kommunikasiya aktının subyektləri müəyyən bir hərəkətin zamanını göstərməyin bu yolundan bir çox hallarda sadə cümlələrdə istifadə edilən zaman zərfliklərinə (məsələn, *saat 5-də* və s.) nisbətən daha çox istifadə edirlər. Bunun səbəbləri müxtəlif ola bilər. Məsələn, haqqında danışılan hadisə və ya hərəkətin dəqiq zamanı qeyri-müəyyən ola bilər. Bu yoldan xüsusən bu tipli hərəkətlər gələcəklə bağlı olduqda, yaxud kommunikant bu və ya başqa səbəbdən haqqında danışdığı hərəkətin zamanını qeyd etmək istəmədikdə nitq prosesində istifadə edilə bilər. Bütün bunlar nitqdə sadə sintaktik strukturlardan savayı, daha geniş və mürəkkəb strukturların – mürəkkəb cümlələrin işlədilməsini zəruri edir.

Temporallıq mürəkkəb cümlənin müxtəlif növləri və tipləri ilə ifadə olunur. Tabesiz mürəkkəb cümlədə zaman bildirən tərkib hissələrinin işlənməsi informativ məqsəd daşıyıb, müəyyən müddətin keçməsini ifadə edir:

***Bir az keçdi**, mahal hakimi gəldi. **Bir az keçdi**, atlar daha da şiddətlə başladılar kişnəməyə* (C.Məmmədquluzadə). ... ***Sonra vaxt olar**, danışarıq* (N.Vəzirov).

Verilmiş misallarda *bir az keçdi* və *vaxt olar* cümlələri müvafiq tabesiz mürəkkəb cümlələrin tərkib hissələridir. On-

lardan birinci keçmişdə baş vermiş, ikincisi isə gələcəkdə baş verəcək hərəkətdən əvvəlki zamanı bildirir.

Tabeli mürəkkəb cümlələrdə zaman bildirən tərkib hissələri həm baş cümlədə, həm də budaq cümlədə özünü göstərir.

Tabeli mürəkkəb cümlələrdə zaman bildirən tərkib hissələr ən çox zərflik (zaman) budaq cümləsi, şərt budaq cümləsi və qismən təyin və səbəb budaq cümləsində təzahür edir.

### 5.1.4.1. Temporallığın zaman budaq cümləsi ilə ifadəsi

Zaman budaq cümləsi baş cümlədə baş verən hərəkət və hadisənin zamanını bildirir. O, baş cümləyə Azərbaycan dilində *ki* bağlayıcısı, *o zaman ki, elə ki, nə qədər ki* və s. bağlayıcı sözlərin, ingilis dilində isə *when, before, after, as* kimi bağlayıcıların köməyi ilə daxil edilir. Qarşılaşdırdığımız dillərdə zaman budaq cümləsinin baş cümləyə görə mövqeyi iki cür təzahür edir: prepozitiv və postpozitiv.

İngilis dilində prepozitiv və ya postpozitiv mövqeyə malik zaman budaq cümlələri baş cümləyə *when, before, after, as, as soon as, while* və s. bağlayıcılarla bağlanır. Budaq cümlənin prepozitiv mövqeyinə aid misallara diqqət yetirək.

"***When I was alive and had a human heart,***" *answered the statue, "I did not know what tears were...* (O.Wilde). ***When she had finished*** *he nodded gravely* (A.Cristie). ***When the moon rose,*** *he flew back to the Happy Prince* (O.Wilde). ***When they reached the ground***, *Arrowhead intimated his intention to go towards the fire, and...* (J.F.Cooper). ***When day broke***, *he flew down to the river and had a bath* (O.Wilde).

Bu qəbildən olan zaman budaq cümlələrinin Azərbaycan dilində müqabili feli bağlama tərkibi ilə ifadə olunmuş zaman zərfliyi (I), yaxud *elə ki* bağlayıcı vasitəsi ilə baş cümləyə da-

xil edilən zaman budaq cümləsidir (II). Müqayisə edək:

(I) ***Ay doğanda***, *o, xoşbəxt şahzadənin yanına uçub gəldi.*

(II) ***Elə ki ay doğdu***, *o, xoşbəxt şahzadənin yanına uçub gəldi.*

Budaq cümlənin postpozitiv mövqedə işləndiyi nümunələrə nəzər salaq:

*And he was sorry and surprised* ***when she passed from his sight through one of the hundred doors*** (J.Galsworthy). *I've been talking to such a delightful person – just the type you see* ***when go into the cities*** (J.Galsworthy) . *He just heaved a sigh of relief* ***when the war took me off*** (A.Cristie). *I made up my mind to marry money* ***when I was quite young*** (A.Cristie). *I hear that Mr. Stone ... is writing a book which will create quite a sensation* ***when it comes out*** (J.Galsworthy).

Azərbaycan dilində belə cümlələrin müqabili o qədər də müəyyən deyildir. Birinci cümlədəki budaq cümləni əvvəldə gələn zaman zərfliyi, yaxud zaman budaq cümləsi kimi vermək olar. İkinci cümlənin budaq cümləsini yalnız feli bağlama tərkibi ilə ifadə olunmuş zaman zərfliyi şəklində vermək olar (*«eynən siz şəhərə gedərkən gördüyünüz şəxs kimi»*). Üçüncü cümlədəki budaq cümlə üç cür – zaman budaq cümləsi, qoşulma budaq cümləsi və şərt budaq cümləsi şəklində verilə bilər. Əlbəttə, bizi burada tərcümə məsələləri maraqlandırmır.

İngilis dilində *when* bağlayıcısı ilə daxil edilən budaq cümlə əsas cümlənin *then* zərfi ilə ifadə olunmuş ünsürünə əlavə kimi də çıxış edir:

***<u>Then</u>, when the autumn came*** *they all flew away* (O. Wilde). ***<u>Then</u>, when you reach the town***, *you go with the rest of them into* (Th.Dreiser). ***<u>Then</u>, when it comes to my turn to reply***, *I have to be awakened* (W.Irving).

Burada eyni zaman parçasının müxtəlif üsullarla ifadə olunduğunu görürük. *Then* sözü mətnin əvvəlki hissəsinə işarə

edir (ona isnaddən sonra). Budaq cümlə isə həmin zaman parçasını payızın gəlişinə bağlayır.

Dialoji nitqdə *when* bağlayıcısının daxil etdiyi cümlə verilən suala cavab olmaqla yanaşı, cavab cümləsinin də zamanını bildirir:

-*Your father breaks horses, don't he*?'

-*If you please, sir, when they can get any to break, they do break horses in the ring, sir* (J.Galsworthy).

*When* bağlayıcısı feli sifət tərkibi ilə əlaqədə zaman ifadə edir və əsas cümlənin daxilində işlənir.

*Heaven keep us from a knowledge of the sights the moon beheld upon that field,* ***when, coming up above the black line of distant rising-ground****, softened and blurred at the edge by trees* (Ch.Dickens)

Zaman budaq cümləsi baş cümləyə *after* bağlayıcısı ilə də daxil edilir:

***After they had gone*** *he felt lonely, and began to tire of his lady-love* (O. Wilde). *...* ***after they had secured for their world all the electricity there was in the Universe****, ... they could imagine as further necessary to human happiness, they would probably muse for awhile, and then reply, ...* (Jerome K.Jerome). "*What happened* ***after she had converted the boy into an allegory***?" (M.Twain). ***After the torpedo struck the ship****, in the few moments during the launching of the boats, Danvers was seen speaking to a young American girl* (A.Cristie).

Bu tipli budaq cümlələrə Azərbaycan dilində *sonra* zərfinin (yaxud qoşmasının) iştirak etdiyi feli bağlama tərkibi ilə ifadə olunan zaman zərfliyi (*onlar gedəndən sonra*) və *elə ki* bağlayıcı vasitəsi ilə daxil edilən zaman budaq cümləsi (*elə ki, onlar getdilər* ) müvafiq gəlir.

Bu cür mürəkkəb cümlələrdə budaq cümlə əsas cümlədə haqqında bəhs edilən hadisədən əvvəl baş vermiş hadisəyə,

prosesə görə əsas cümlənin zamanını bildirir.

*Before* bağlayıcısı ilə daxil edilən budaq cümlələrdə bunun əksini görürük. Burada budaq cümlədə, baş cümlədə haqqında bəhs edilən hadisədən əvvəl baş vermiş hadisəyə görə zaman ifadə olunur; həmin hadisənin baş verməsi cümlədə öz əksini tapır, potensial imkan olaraq qalır:

*But* ***before he had opened his wings****, a third drop fell, and he looked up, and saw--Ah! What did he see?* (O. Wilde). *... but next time he'll want to know something more* ***before he parts with his money*** (A.Cristie).

*As* bağlayıcısı ilə daxil edilən budaq cümlələrə diqqət yetirək:

*"Heave a-hoy!" they shouted* ***as each chest came up*** (O. Wilde). *What a remarkable phenomenon," said the Professor of Ornithology* ***as he was passing over the bridge*** (O. Wilde).

Misallardan göründüyü kimi, *as* bağlayıcısı ilə daxil edilən bütün budaq cümlələr axırda gəlir. Azərbaycan dilində həmin məzmun cümlənin əvvəlində gəlir və feli bağlama tərkibi ilə ifadə olunan zaman zərfliyi ilə ifadə olunur. Müqayisə edək:

*Ornitologiya professoru körpüdən keçərkən dedi...*

Azərbaycan dilində prepozitiv mövqedə işlənən zaman budaq cümlələri baş cümləyə *o zaman (ki), elə ki, nə vaxt (ki), haçan (ki)* və s. bağlayıcı sözlərlə daxil edilir:

***O zaman ki, aşnalığı tərk etdik****, Cüda düşdük, xeyli ciyər bərkitdik* (Vaqif). ***O zaman ki, gəldin bizə****, Mail olduq ala gözə* (Aşıq Ələskər). ***Elə ki, yekəlib ağlım kəsdi****, buz əhvalatı mənə hər bir yeri düşəndə dərd olur.* ***Elə ki, atam vəfat etdi****, onda mən on iki yaşımda idim.* ***Elə ki, bu söz ağzımdan çıxdı****, naçalnik yerindən dik atıldı* (C.Məmmədquluzadə).

Sonuncu cümlədə budaq cümlə baş cümlədə ifadə olunan hərəkətin zamanı ilə yanaşı, səbəbini də bildirir. Qeyd etmək lazımdır ki, həmin hərəkət bilavasitə budaq cümlədəki hərəkət

tamamlandıqdan sonra başlayır. Səbəb münasibəti birinci cümləyə də xasdır.

***Nə qədər ki, uşaq idim****, yadıma düşməzdi.* ***Nə qədər ki, sağam****, nökərəm sənə.* ***Nə qədər ki, sağam****, mən nökərəm sənin xanımına* (C.Məmmədquluzadə). ***Nə qədər ki, Rusiyada bolşevik hökuməti hələ yerini möhkəmlətməyib****, başımıza çarə tapmalıyıq* (Elçin).

Zamanın xarakteri zərflərlə də ifadə olunur:

***Qonaqlara təzəcə çay vermişdilər ki****, ucaboylu, sarıbəniz, enlikürək bir oğlan olan Şahmar gəldi* (İ.Əfəndiyev).

Baş cümlədəki hərəkətin budaq cümlədə ifadə olunmuş hərəkətin icrasından bilavasitə sonra, yaxud az sonra baş verməsi bağlayıcı və zərflər olmadan da verilə bilir:

***Stolun üstündəki «Xəstəlik tarixi»ni toplayıb, şəfqət bacısına vermək və qeyd otağına keçmək istəyirdi ki****, qapı aralandı* (Ə.Cəfərzadə).

Həmin məzmunun ifadəsində *istəmək* felinin rolu şəksizdir: o, əsas felin (*keçmək*) ifadə etdiyi hərəkətin baş vermədiyini, yalnız bir niyyət olduğunu bildirir.

Zaman budaq cümləsi müəyyən hərəkətin baş verməsi ilə əlaqədar olaraq işləndiyi kimi, baş verməməsi ilə əlaqədar də işlənə bilir:

***Qasıməli hələ sözlərini deyib-qurtarmamışdı****, Fizzə ilə Zibə ağlamağa başladılar* (C.Məmmədquluzadə).

Budaq cümlədəki hərəkətin keçmişdə tam baş vermədiyi anlaşılır, lakin bu həmişə belə olmur.

***Gördün ki, düşmən güc gəldi****, Qov bir yana, qaç bir yana* («Koroğlu»).

Burada budaq cümlənin xəbəri formal olaraq felin şühudi keçmiş zaman forması ilə ifadə olunmuşdur, ancaq faktiki olaraq o, gələcəyə aid olan hərəkətdir. Təsadüfi deyildir ki, baş cümlədə felin əmr şəklindən istifadə olunmuşdur. Həmin cüm-

lənin transformasiyası da bunu tələb edir: *Düşmənin [sənə] güc gəldiyini görəndə ...*

İngilis dilində sintaktik temporallıq paralel budaq cümlələrlə ifadə olunur. Həmin paralel budaq cümlələr baş cümləyə ayrı-ayrı bağlayıcı vasitələrlə (əsasən bağlayıcılarla) daxil edilir:

*The times comes* ***after the first heedless flights of youth have passed*** (I), ***when the initiative and more powerful efforts have been made*** (II), *and he begins to feel the uncertainity of results and final values which attaches itself to everything...* (Th.Dreiser)

Qeyd etmək lazımdır ki, həmin cümlədə «*The time comes*» tərkib hissəsi müxtəsər cümlə şəklindədir, bununla bərabər, onun mübtədası zaman mənalı ad ilə ifadə olunmuşdur.

Əldə olan materiallar göstərir ki, sintaktik temporallıq paralel əsas və paralel (fərdi) budaq cümlələrlə də ifadə olunur. Məsələn:

*They came a day*, ***when the annual interest on the mortgage was due***, *and on another* [*day*] ***when two different grocery-man met Gerhardt in the street, and ashed about their little biles*** (Th.Dreiser).

Beləliklə, zaman budaq cümləsi ilə ifadəolunma temporallığın cümlə səviyyəsində ən geniş yayılmış üsullarından biridir.

### 5.1.4.2. Temporallığın başqa budaq cümlələrlə ifadəsi

Zaman budaq cümləsindən əlavə, digər budaq cümlə növləri də sintaktik səviyyədə temporallığı ifadə edə bilir.

***Haçan istəsə*** *gedə*, ***haçan istəsə*** *gələ bilər*.

Bu cümlədə *haçan istəsə* tərkib hissəsi şərt bildirməklə yanaşı, «istədiyi vaxt» məzmunu da verir. Ona görə də həmin

cümləni bu cür transformasiya etmək olar: ***İstədiyi vaxt*** *gedə də bilər, gələ də bilər*.

Burada daha bir aspekt diqqəti cəlb edir. *Haçan istəsə* tərkib hissəsi *getmək* və *gəlmək* fellərinə eyni dərəcədə aiddir. Bununla belə, *istəmək* felinin şərt şəklində işlənməsi mətndə (cümlədə) məhz *bilmək* felinin işlənməsi ilə bağlıdır.

Şərt budaq cümləli tabeli mürəkkəb cümlələrin bəzi tiplərində (*ta*) *onda* ünsürünün işləndiyini görürük. Bu ünsür budaq cümlədə şərt məzmununun daha da qüvvətləndirilməsinə xidmət edir.

*Sən bir də mənim işlərimə qarışsan, mənim sözümün qabağında söz danışsan,* ***ta onda*** *özünü ölmüş bil* (C.Məmmədquluzadə).

Temporallığın ifadə edildiyi budaq cümlə növlərindən biri də təyin budaq cümləsidir.

*Gün gələcək ki*, insanlar yenə də poeziyanı, epopeyanı, romanı qızıl taxta qaldıracaqlar (Elçin).

Bəzi cümlə tipləri vardır ki, onların baş cümləsində zaman (müddət) bildirən söz və ifadələr işlənir, budaq cümlə mübtəda budaq cümləsi məqamında işlənir:

***Bir həftə idi ki***, *Rüstəm nişanlısı ilə küsmüşdü.* ***Otuz gün idi ki***, *can qurtaran külək əsirdi.* ***Dördüncü həftə idi ki***, *hərarətölçənin civəsi 39-40 dərəcədən aşağı düşmürdü.* ***Düz altı gün idi ki***, *tələbə bu lövhənin qarşısına gəlirdi* (Anar).

Nəhayət, sintaktik zamanın zaman zərfliyi mövqeyində işlənən sadə cümlələrlə ifadə olunmasını da müşahidə etmək olar. Həmin cümlələrin əsas xüsusiyyəti ondan ibarətdir ki, onlarda zaman bildirən tərkib hissəsi mübtəda ilə xəbərin arasında gəlir. Onlar baş cümləsində zaman mənalı ifadələr olan mübtəda budaq cümləli tabeli mürəkkəb cümlələrdən yalnız bu əlamətə görə fərqlənirlər. Məsələn:

*Onlar* ***on ildən çox idi ki****, evlənmişdilər* (İ.Şıxlı). *O,* ***düz bir həftə idi ki****, evə gəlmirdi* (İ.Şıxlı). *O,* ***yeddi il idi ki****, vəfat etmişdi* (Anar).

Həmin cümlələrdə bitişdirici (birləşdirici) *ki* bağlayıcısının işlənməsi də nəzəri cəlb edir. Bu bağlayıcı, göründüyü kimi, tabeli mürəkkəb cümlənin baş və budaq cümləleri arasında tabelilik əlaqəsini ifadə edir. Nitqdə həmin bağlayıcının işlənmədiyi hallara da təsadüf edilir. Bu isə həmin məqamda *ki* bağlayıcısının tabelilik əlaqəsi mənasının zəif olması deməkdir.

### 5.1.5. Temporallığın təsviri yolla ifadəsi

Nitq fəaliyyətində bir çox hallarda sintaktik zaman bir proses kimi təqdim olunur. Müvafiq cümlələrin məzmunu ya müəyyən müddətlərin keçməsinin təsviri, ya da zamanın ölçülməsi üçün nəzərdə tutulan qurğuların işinin təsvirindən ibarət olur. Məsələn: *Səhər açılırdı* (Anar).

Bu cümlədə mübtəda və xəbər vasitəsilə günün müəyyən hissəsinin olduğu vaxt barəsində məlumat verilir.

Aşağıdakı cümlələrdə zamanın ötməsi həmin zaman ərzində baş vermiş hadisələrlə eynitipli hadisələr kimi təqdim olunmuşdur:

***Bir saat da keçdi****, yenə zəng elədim.* ***Hansı vaxtla idi****, bilmirəm* (Anar). ***Günlər, aylar, illər keçdi*** *və bu uzun-uzadı illər boyu o meşə də, o bülbül də heç vaxt yada düşmədi* (Elçin).

***Saat on ikini vurdu****, biz bir-birimizi qucaqlayıb öpdük, hamıya, hamıya xoşbəxtlik arzuladıq* (Anar) cümləsinə isə müxtəlif cür yanaşmaq olar.

Bir tərəfdən, bu cümlədə sadəcə mübtəda (*saat*), xəbər (*vurdu*), tamamlıq (*on ikini*) vardır. Bu yanaşmaya görə, burada sözün əsl mənasında heç bir zamandan söhbət getmir.

Digər bir yanaşmaya görə, *saat on ikini vurdu* «saat on iki oldu» deməkdir. Bu, yeni il gecəsidir və bunun belə olduğunu cümlənin sonrakı hissələri də təsdiq edir: adamlar adi vaxtlarda qucaqlamadıqları şəxsləri qucaqlayır, bir-birinə xoşbəxtlik arzulayırlar. Vaxtın gecə saat on iki olması həmin cümlənin ümumi məzmununu təşkil edir. Burada artıq mübtəda, xəbər, tamamlıq axtarmaq lazım gəlmir.

### 5.1.6. Temporallığın emfatik vasitə ilə ifadəsi

Azərbaycan dilinin materialları arasında emfatik vasitə hesab oluna bilən yalnız bir ifadəyə – *elə hey* birləşməsinə rast gəlmişik:

*Mən **elə hey** danışıram, danışıram, Siz isə susursunuz. Siz də mənə bir şey danışın* (Anar). *Bu zümrüd yaşıllığın içində sarı bülbül meşə nəğməsini oxudu, **elə hey** əvvəlki nəğməsini, dərdli, ələmli nəğməsini oxudu* (Elçin).

Hər iki cümlədə *elə hey* ifadəsi zərflik məqamında işlənib, müvafiq fellərlə ifadə olunan hərəkətlərin uzun müddət davam etdiyini bildirir. O, özündə kəmiyyət, tərz və zaman zərfliklərinin əlamətini birləşdirir.

### 5.1.7. 5-ci fəslə dair nəticələr

Dilin bütün digər ümumi səciyyəli kateqoriyaları kimi, sintaktik zaman kateqoriyası da dilin leksik sistemi, lüğət tərkibi ilə üzvi şəkildə bağlıdır. Zamanın sintaktik vasitələrlə ifadəsi müxtəlif səviyyələrdə ümumiləşdirmələr və dillərin lüğət tərkibinin hissələri olan sözlərin, ifadələrin təşəkkül tapmasında başa çatır. Hər iki dil üzrə tədqiq edilmiş materiallar zaman mənalı ifadələrin iki tipini ayırd etməyə imkan verir: a) danışanın nitq situasiyasında tutduğu mövqedən asılı olmayan ifadələr: *yay / summer, qış / winter, yaz / spring, payız / autumn,*

*il / year, ay / month* və s.; b) danışanın nitq situasiyasında tutduğu mövqe ilə bağlı olan ifadələr: *bu gün / today, dünən / yesterday, indi / now* və s.

Bu iki ifadə tipinin əsas fərqi ondan ibarətdir ki, birinci qrupdan olanlar dilxarici gerçəkliyə ünvanlanmışdır; ikinci tipdən olan ifadələrin bağlı olduqları zaman təsəvvürləri isə başqa şəraitdə yeni ifadə vasitələri cəlb edir. Məsələn, hal-hazırda *bu gün, indi* sözləri ilə ifadə olunan zamanı bir gün keçdikdən sonra *dünən, bir gün (bundan) qabaq* ifadələrinin köməyi ilə ifadə etmək olar.

Dilxarici gerçəkliyə ünvanlanmış zaman mənalı ifadələrin işlənməsində də bu cür «sürüşkən qrafik» üzrə ifadəetməyə nail olmaq mümkündür. Məsələn, *2006-cı ilin mart ayında* ifadəsində il və ay adlarını dəyişdirməklə yeni zaman mənalı ifadələr əldə etmək olar.

Sintaktik zaman təkcə sistemli xarakterə deyil, həm də dinamik xarakterə malik linqvistik hadisədir. Onun ifadə vasitələri həm dil sistemində, həm də dilin qrammatik quruluşunda ardıcıl olaraq, fasiləsiz surətdə kəmiyyət və keyfiyyət baxımından artır, təşəkkül edir, təkmilləşir. Bu istiqamətdə elm və texnikanın inkişafı da əlavə bir stimul kimi özünü göstərir.

Sintaktik zamanın söz birləşmələri vasitəsilə ifadə olunması bu kateqoriyanı reallaşdıran yeganə vasitə deyildir. Sintaktik zaman cümlənin tərkib hissələrinin qarşılıqlı münasibəti əsasında da öyrənilə bilər (öncəgəlmə, eynizamanlılıq və sonragəlmənin ifadə formaları).

Qeyd etmək lazımdır ki, sintaktik zamanın ifadəsində hər bir dil özünün əsrlər boyü işləyib hazırladığı vasitə və üsullardan istifadə edir. Həmin vasitələr nominativ səciyyəli vahidləri əhatə edir. Üsullara isə sözdüzəltmə və söz birləşməsi yaradılması aiddir.

İngilis və Azərbaycan dillərində sintaktik zamanın ifadə olunması baxımından prinsipial əhəmiyyət daşıyan hadisələr-

dən biri birincidə ön qoşmalardan (sözönulərdən), ikincisində isə qoşmalardan istifadə edilməsidir. Onlar həmin dillərin struktur tipi ilə bağlı olan vahidlərdir. Onların təqdim etdiyi struktur əlamətlər morfoloji səviyyədə təkrar edilir və dil sisteminin vahidliyini göstərir.

Sintaktik zaman anlayışı cümlədə zamanın ifadə olunması ilə bağlıdır. Deməli, sintaktik zamandan o halda danışmaq olar ki, o, müvafiq nitq vahidində ifadə edilmiş olsun. Geniş mənada götürdükdə bu, cümlədir. Deməli, sintaktik zamanın əsas vahidləri müxtəlif cümlə tipləridir. Daha dəqiq desək, buraya nəqli cümlələr aiddir. İngilis və Azərbaycan dillərinin materialları da bu fikrin doğruluğunu təsdiq edir. Sintaktik zamanın bu dillərdə ifadə vasitələri arasında adlıq cümlələr, sadə cümlələr, sadə genişlənmiş cümlələr, tabesiz və tabeli mürəkkəb cümlələrə rast gəlmək olur.

Sintaktik zaman cümlələrdə məqsədli şəkildə seçilmiş və tərtib edilmiş cümlə üzvlərində, əsasən zaman zərfliklərində, zaman budaq cümlələrində ifadə olunur. Zaman bildirən üzvlər (ünsürlər) sabit ifadə vasitələri (zaman mənalı adlar, zaman zərfləri) və hazır şəkildə mövcud olmayan, dilin sintaktik qayda-qanunları əsasında tərtib edilmiş konstruksiyalarda ifadə oluna bilər. Buraya cümlə üzvləri (zaman zərflikləri), budaq cümlələr, eləcə də baş və budaq cümlələrdən ibarət olan konstruksiyalar daxildir.

# NƏTİCƏ

Dil zamanının, başqa sözlə temporallığın Azərbaycan və ingilis dillərinin materialları əsasında kontrastiv-tipoloji araşdırılması aşağıdakı nəticələri çıxarmağa imkan verir:

Dil və təfəkkür problemi ilə əlaqədar olub müəyyən qanunauyğunluqlarla nizamlanan linqvistik temporallıq sahəsi perseptual zaman kateqoriyasının universal semioloji funksional-semantik nüvə-invariant ətrafında bütöv halında toplaşan dil və nitq vahidlərindən ibarətdir ki, bunlar da linqvistik təhlilin müxtəlif səviyyələrinə aiddir. Sahənin əsasında dayanan məna, yəni semantik funksiyalar onun sabit təməlini əmələ gətirir ki, bununla da danışanın və ya subyektin təfəkkür, nəticə etibarilə kommunikativ fəaliyyəti gerçəkləşir. Temporallığa, başqa sözlə, dil zamanına sahə nəzəriyyəsi prizmasından baxış dili obyektiv gerçəkliklə təfəkkür vasitəsilə əlaqəli olan anlayış kimi nəzərdən keçirməyə imkan verir. Müxtəlif xalqların nümayəndələri əksər hallarda bəşəriyyət üçün ümumi və ya çox oxşar olan təfəkkür kateqoriyalarından istifadə edir. Eyni zamanda belə bir hal da etiraf olunmalıdır ki, ayrı-ayrı milli mədəniyyət mənsubları özünəməxsus təfəkkür stereotiplərinə malikdir. Bu baxımdan temporallıq makrosahəsinin və onun tərkib hissələri olan mikrosahələrin məzmun və funksional-kommunikativ səciyyəsi göstərir ki, onlarda Azərbaycan və ingilis dillərinin daşıyıcıları tərəfindən gerçəkliyin temporal strukturunun dərk edilməsində milli özünəməxsusluqlar əks olunur.

Azərbaycan və ingilis dillərində temporallıq makrosahəsinin və onu əmələ gətirən mikrosahələrin qarşılaşdırılması əsasında əldə olunan nəticələr kifayət qədər inamlı şəkildə belə bir faktı təsdiqləməyə imkan verir ki, qarşılaşdırılan Azərbaycan və ingilis dillərində temporallığın sahə strukturunda mühüm əlamətlərin ümumiliyi ilə yanaşı, onların struktur xü-

susiyyətləri, nomenklaturası, makro- və mikrosahə konstituentlərinin nitq aktında reallaşması, bir-biri ilə əlaqəsi baxımından fərqli cəhətlər vardır.

Azərbaycan və ingilis dillərində temporallığın sahə strukturunda ən ümumi mühüm əlamətlər sahənin üfüqi və şaquli üzvlənməsində təzahür edir. Sahənin strukturu hər iki dilin morfoloji, sintaktik və leksik səviyyələrinə aid dil vahidlərinin vahid invariant zaman mənası ətrafında birləşərək gerçəkliyin zaman əlaqələrini və münasibətlərini ifadə etməsi ilə səciyyələnir (şaquli üzvlənmə). Bu strukturda vahid invariant zaman məzmunu keçmiş, indiki və gələcək olmaqla oxşar sahələrə bölünür (üfüqi üzvlənmə).

Sahənin təşkilində ümumi cəhət onun nüvə və periferiyaya bölünməsidir. Qarşılaşdırılan dillərdə temporallıq sahəsinin nüvəsi morfoloji zaman kateqoriyasına, yəni nitq momentinə münasibətdə eynizamanlılıq, öncəgəlmə və sonragəlmə kimi müxtəlif diferensial əlamətlərlə qarşı-qarşıya qoyulan qrammatik fel formaları sistemi ilə təmsil olunur. Hər iki dildə morfoloji zaman kateqoriyası əsasən təsriflənən felin xəbər şəkli (indikativ) ilə məhdudlaşır. Temporallıq sahəsinin periferiyası temporal leksik vasitələrlə təmsil olunur. Sintaktik temporal ifadə vasitələri nüvəətrafı zona əmələ gətirir.

Azərbaycan və ingilis dillərində zaman onun müxtəlif ifadə vasitələrinin semantik zənginliyinə və rəngarəngliyinə rəğmən, temporallıq sahəsinin əsas və başlıca ifadə vasitəsi kimi morfoloji zaman və ya morfoloji temporallıq kateqoriyası hesab olunmalıdır, çünki zamanın morfoloji yolla ifadəsi temporal münasibətlərin reallaşmasında məcburiliyi, müntəzəmliyi və ümumiliyi ilə xarakterizə olunur.

Qarşılaşdırılan dillərdə temporal münasibətlərin reallaşmasında temporal leksik vasitələr ya aparıcı, ya da dəqiqləşdirici və ya konkretləşdirici rola malik olur. Temporal leksik vasitələrlə felin zaman formaları arasında qarşılıqlı əlaqə əsasən

üç tipdə təzahür edir: semantik uzlaşma, semantik uyğunsuzluq və neytrallıq münasibəti. Semantik uzlaşma münasibətində leksik vasitə və fel forması üçün uyğun, oxşar semalar xarakterikdir. Semantik uyğunsuzluq leksik vasitə və fel forması üçün ümumi semaların olmaması ilə səciyyələnir. Belə uyğunsuzluq ya fel formasının digər bir zaman planına transpozisiyası ilə nəticələnir, ya da fel formasının və leksik vasitənin bir araya gəlməməsinə və ya birləşmə əmələ gətirməməsinə səbəb olur. Məsələn, semantik komponentlərinin üyğunsuzluğu səbəbindən keçmiş zaman sferasına aid leksik vasitələr gələcək zamana və əmr şəklinə aid fel formaları ilə birləşmə əmələ gətirə bilmir.

Temporal leksik vasitələrin semantikasında leksik və qrammatik mənaların qarşılıqlı əlaqəsi təzahür edir. Bir tərəfdən, tədqiq edilən söz və söz birləşmələrində müəyyənlik, qeyri-müəyyənlik, müddət, uzunluq, başlanğıc və ya son hədd, ardıcıllıq, fasilələlilik və s. xalis semantik temporal əlamətlər təzahür edir, digər tərəfdən, temporal leksik vasitələrin semantikasında nitq momentinə münasibətdə eynizamanlılıq, öncəgəlmə və sonragəlmə kimi qrammatik zaman mənaları ilə oxşar komponentləri fərqləndirmək olur. Sonuncular temporal leksik vasitələrin semantikasında ikinci dərəcəli, nisbi səciyyə daşıyır.

Azərbaycan və ingilis dillərində sintaktik temporallıq sahəsi gerçəkliyin zaman münasibətlərini dilin sintaktik səviyyəsində reallaşdıran strukturlarla təmsil olunur. Sintaktik zamandan və ya sintaktik temporallıqdan o halda danışmaq olar ki, o, müvafiq sintaktik vahid vasitəsilə ifadə edilmiş olsun. Müəyyən edilmişdir ki, qarşılaşdırılan dillərdə zamanı sintaktik səviyyədə söz birləşmələri, tərkiblər və cümlələr reallaşdırır. Azərbaycan və ingilis dillərinin materiallarının təhlili göstərir ki, temporallığın ifadəsində ismi və feli söz birləşmələri, feli tərkiblər mühüm rol oynayır. Sintaktik zamanın bu dillərdə

cümlə səviyyəsində ifadə vasitələri arasında adlıq, şəxssiz, tabesiz və tabeli mürəkkəb cümlə tiplərinə rast gəlmək olur. Sintaktik temporallığın reallaşdırılmasında ən mühüm sintaktik struktur zaman budaq cümləsidir.

## ƏDƏBİYYAT

### *Azərbaycan dilində*


1. Abdullayev S. Müasir alman və Azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998.
2. Abdullayev Ə. Z., Seyidov Y. M., Həsənov A. Q. Müasir Azərbaycan dili. Sintaksis. IV hissə, Bakı, Maarif, 1985.
3. Adilov M.İ., Verdiyeva Z.N., Ağayeva F.M.İzahlı dilçilik terminləri (sorğu lüğəti).Bakı, 1989.
4. Axundov A.A. Felin zaman kateqoriyasının tədqiqi tarixindən // Aspirantların elmi əsərləri, III buraxılış, Bakı,1957, s.21-37.
5. Axundov A.A. Felin indiki zamanı // S.M.Kirov adına ADU-nun Elmi əsərləri. Bakı, 1958, № 2, s. 119-130.
6. Axundov A.A. Felin keçmiş zamanı. Şühudi keçmiş // S.M.Kirov adına ADU-nun Elmi əsərləri. Bakı, 1958, № 4, s. 43-52.
7. Axundov A.A. Felin zamanları, Bakı, 1961.
8. Axundov A.A. Ümumi dilçilik, Bakı, 1979.
9. Axundov A. Fel zamanlarının üslubi xüsusiyyətləri // Axundov A. Dilin estetikası. Bakı, Yazıçı, 1985.
10. Axundov A. Dil və mədəniyyət. Bakı, Yazıçı, 1992.
11. Axundov A. Fəlsəfi və qrammatik zaman kateqoriyaları // Ağamusa Axundov. Dil və Ədəbiyyat. I cild, Bakı, 2003, s. 199-203.
12. Axundov A. Türk dillərində zaman və sıra kateqoriyalarının qarşılıqlı əlaqəsi // Ağamusa Axundov. Dil və Ədəbiyyat. I cild, Bakı, 2003, s. 260-266.
13. Axundov A. Azərbaycan dilinin izahlı lüğəti. Bakı, Elm, 2005.
14. Azərbaycan dilinin izahlı lüğəti. I cild (red.: prof. Ə.Orucov), Bakı, Azərb. SSR EA nəşriyyatı, 1966.

15. Azərbaycan dilinin izahlı lüğəti. II cild (red.: prof. Ə.Orucov), Bakı, Elm, 1980.
16. Azərbaycan dilinin izahlı lüğəti. III cild (red.: prof. Ə.Orucov), Bakı, Elm, 1983.
17. Azərbaycan dilinin izahlı lüğəti. IV cild (red.: prof. Ə.Orucov), Bakı, Elm, 1987.
18. Azərbaycan dilinin izahlı lüğəti (red.: prof. A.Axundov). I cild, Bakı, «Çıraq», 1997.
19. Azərbaycan dilinin izahlı lüğəti (red.: prof. A.Axundov). II c., Bakı, «Çıraq», 1999.
20. Azərbaycan dilinin izahlı lüğəti (red.: prof. A.Axundov). III c., Bakı, «Çıraq», 2000.
21. Azərbaycan dilinin orfoqrafiya lüğəti. (red.: prof. A.Axundov). Bakı, «Lider nəşriyyat», 2004.
22. Azərbaycan dilinin qrammatikası. Azərbaycan EA nəşri, Bakı, 1960.
23. Budaqova Z.İ. Təktərkibli cümlə //Müasir Azərbaycan dili, III cild, Sintaksis, Bakı, Elm, 1981, s. 258-293.
24. Babayev A. Azərbaycan dilçiliyinin tarixi. Bakı, 1996.
25. Cavadov Ə. Təktərkibli sadə cümlələr // Müasir Azərbaycan dili. Sintaksis. II kitab, Azərbaycan Dövlət Tədris Pedaqoji Ədəbiyyatı Nəşriyyatı, Bakı, 1962.
26. Cəfərov Q. Azərbaycan dilinin leksik-semantik sistemi. Bakı, Elm, 1984.
27. Cəfərova B. İngilis və Azərbaycan dillərində felin zamanlar sistemi. Bakı, 2004.
28. Cahangirov F.F. İngilis dilində perfekt zaman formaları və onların Azərbaycan dilində ifadəsi. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 2000.
29. Cahangirov F.F. Perfekt zamanlar, Bakı, Elm, 2000.
30. Cahangirov F. İngilis və Azərbaycan dillərində modallığın struktur-semantik tədqiqi. Bakı, Elm, 2005.

31. Əfəndiyev İ.R. Müasir Azərbaycan dilində qrammatik kateqoriyalar. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 1960.
32. Əfəndiyeva T. Felin keçmiş zaman formaları. Bakı, «Nurlan», 2005.
33. Əfəndiyeva T. Azərbaycan ədəbi dilinin üslubiyyat problemləri. Bakı, Elm.
34. Ələkbər Aydın. Yazı pozularımdan seçmələr. Bakı, Nurlan, 2006.
35. Əliyev V.H. Müasir Azərbaycan və özbək dillərində feli sifətlər. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 1962.
36. Əliyev V. Azərbaycan dilində felin təsriflənməyən formaları. Məsdər. Bakı, 1986.
37. Əliyev Ə.M. Baş və budaq cümlələrdə zaman uyuşmaları // Azərbaycan Dövlət Universitetinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1972, № 1, s. 47-51.
38. Əliyev Ə.M. Baş və budaq cümlələrdə zaman uyuşmaları: Mütləq və nisbi zamanlıq haqqında // Azərbaycan Dövlət Universitetinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1972, № 5, s. 56-63.
39. Əliyeva G.A. Feli birləşmələrin tipoloji-semantik təhlili. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 2006.
40. Ərəbov V. S. İngilis və Azərbaycan dillərində zaman budaq cümləli tabeli mürəkkəb cümlə komponentlərinin müəyyənləşdirilməsinə dair // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi ali məktəblərinin elmi əsərləri. Dillər və ədəbiyyat seriyası, 1977, № 2, s. 29-35.
41. Əsgərov M.B. Zaman formaları, adverbial fel formaları və onlar arasında funksional semantik əlaqələr.Bakı, Nurlan, 2002.

42. Əsgərov M. Türk dillərində zaman formaları, adverbial fel formaları və onlar arasında funksional-semantik əlaqələr. Bakı, 2003.
43. Həsənov H.Ə. Müasir Azərbaycan dilinin leksikası. Bakı, Maarif, 1987.
44. Hüseynov Ə.Ş. Müasir ingilis dilində indiki zaman feli sifətinin Azərbaycan dilində ifadə vasitələri // Azərbaycan məktəbi, 1971, № 3, s. 17-21.
45. Hüseynov Ə.Ş. İngilis dilindəki I növ feli sifətin bəzi əlamətləri // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1977, № 1, s. 24-28.
46. Hüseynzadə M. H. Müasir Azərbaycan dilində mürəkkəb təyini söz birləşmələri // Azərbaycan SSR EA Ədəbiyyat və Dil İnstiutunun Əsərləri, 8-ci cild, 1957, s. 27- 49.
47. Hüseynzadə M. Müasir Azərbaycan dili. Morfologiya. 3-cü hissə. Bakı, Maarif, 1983.
48. Xanbutayeva L.M. Müasir Azərbaycan və ingilis dillərində infinitiv (ümumi tipoloji tədqiqat). Bakı, «Kitab aləmi», 2003.
49. Xudiyev N. Azərbaycan ədəbi dilinin sovet dövrü. Bakı, 1989.
50. İmanova S.X. İngilis və Azərbaycan dillərində zaman və məkan qrammatik əlaqələrinin ifadəsi // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1975, № 6, s. 56-62.
51. İngiliscə-azərbaycanca lüğət, Bakı, «Qismət», 2003.
52. Kərimov Y.K. Fel zamanlarının məna xüsusiyyətlərinə aid bəzi qeydlər // Azərbaycan Dövlət Universitetinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1973, № 3, s. 21 – 26.
53. Kazımov İ. Axısqa türklərinin dili, Bakı, Elm, 1999.
54. Kazımov Q. Müasir Azərbaycan dili. Sintaksis. Bakı, 2004.

55. Qurbanov A. Müasir Azərbaycan ədəbi dili, Bakı, 1985.
56. Marksizm-Leninizm Fəlsəfəsinin Əsasları. Bakı, 1980.
57. Mədətova R. XIII-XVIII əsrlər Azərbaycan dili yazılı mənbələrində məsdər. Bakı, 2002.
58. Məmmədov İ.T. Gələcək zaman formalarında sinonimlik // Azərbaycan SSR EA Xəbərləri. Ədəb., dil və incəsənət seriyası, 1969, № 3, s. 65-72.
59. Məmmədov İ. Azərbaycan dilinin semantikası. Bakı, Xəzər nəşriyyatı, 2006.
60. Məmmədov N., Axundov A. Dilçiliyə giriş, Bakı, Maarif, 1980.
61. Məmmədov Z.M. İndiki və gələcək zaman formalarının potensial məna komponentlərindən biri haqqında: Alman və Azərbaycan dillərinin materialı əsasında // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi ali məktəblərinin elmi əsərləri. Dillər və ədəbiyyat seriyası, 1975, № 3, s. 75-81.
62. Məşədiyev Q.İ. Adlıq cümlənin mənaca tipləri // Azərbaycan SSR EA Xəbərləri. Ədəb., dil və incəsənət seriyası, 1972, № 3, s. 52-57.
63. Məşədiyev Q.İ. Zaman zərflərinin semantikası // Azərbaycan SSR EA Xəbərləri. Ədəb., dil və incəsənət seriyası, 1976, № 4, s. 88 - 94.
64. Məşədiyev Q.İ. Zaman zərflərinin semantik xüsusiyyətlərinio dair // Azərbaycan dili və ədəbiyyatı tədrisi, 1976, №3 s. 71- 74.
65. Məşədiyev Q. Müasir Azərbaycan dilində nitq hissələrinin semantikası, Bakı, 1998.
66. Mirzəyev H.İ. Feli sifətlərdə zaman // Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Elmi Əsərləri. Pedaqogika və psixologiya fənlərinin tədrisi metodikası, dilçilik seriyası, 1963, № 6, s. 116-130.
67. Mirzəyev H. Azərbaycan dilində fel. Bakı, 1986.

68. Musayev O. İngilis dilinin qrammatikası. Bakı, 1979.
69. Müasir Azərbaycan dili, II cild, Morfologiya. Bakı, Elm, 1980.
70. Müasir Azərbaycan dili. III cild. Sintaksis. Bakı, Elm, 1981.
71. Müasir Azərbaycan dilinin semasiologiyası (oçerklər), Bakı, Elm, 1985.
72. Rəcəbov Ə. Dil, Şüur, Cəmiyyət, Tarix. Bakı, 1993.
73. Rəcəbova R.X. Azərbaycan dilində fel tərzlərinin ifadə üsulları. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 1994.
74. Rəcəbli Ə. Nəzəri dilçilik. Bakı, Nurlan, 2003.
75. Rəcəbli Ə. Göytürk dilinin leksikası. Bakı, 2004.
76. Rəcəbli Ə. Göytürk dilinin morfologiyası. Bakı, 2002.
77. Rəcəbli Ə. Göytürk dilinin sintaksisi. Bakı, 2003.
78. Rəfibəyli G.L. İngilis və Azərbaycan dillərində feli tərkiblər. Namizədlik dissertasiyasının avtoreferatı, Bakı, 2004.
79. Rəhimov İ., Hidayətzadə T. İngilis dilinin praktik qrammatikası. Bakı, Maarif, 1966.
80. Rəhimov İ., Hidayətzadə T., Mircəfərova S. İngilis dilinin praktik qrammatikası. Bakı, Azərnəşr, 2001.
81. Rəhimov M. Azərbaycan dilində fel şəkillərinin formalaşması tarixi. Bakı, Azərb. SSR EA nəşriyyatı, 1965.
82. Rəhimov M.Y. Qeyri-qəti gələcək zaman formasının məna xüsusiyyətləri: Azərbaycan və fransız dillərinin materialı əsasında // Azərbaycan Pedaqoji Dillər İnstitutunun Elmi Əsərləri, 9-cu buraxılış, filoloji seriya, 1961, s. 155-167
83. Rəhimov M.Y. Fransız və Azərbaycan dillərində gələcək zaman formalarının qrammatik və məna xüsusiyyətləri haqqında // Azərbaycan Dövlət Universitetinin Elmi Əsərləri. Dil və ədəbiyyat seriyası, 1971, № 1, s. 73-77.

84. Sadıqov R. Müxtəlifsistemli dillərdə obyektiv və qrammatik zaman əlaqələri. Bakı, Nurlan, 2004.
85. Seyidov Y. Azərbaycan dili. Ali məktəblərin rus bölmələri üçün dərslik. Bakı, 1998.
86. Seyidov Y. Azərbaycan dilində söz birləşmələri, Bakı, 1992.
87. Seyidov Y. Azərbaycan dilinin qrammatikası. Morfologiya (ikinci nəşr). Monoqrafik dərs vəsaiti. Bakı: Bakı universiteti nəşriyyatı, 2002.
88. Şirəliyev M.A. Türk dillərində zaman formaları sistemi ətrafında fikir ayrılıqları // Müasir Azərbaycan dilində şəkil və zaman kateqoriyaları. Bakı, 1968, s. 191-193.
89. Şirinova F. İngilis dilində felin indiki zamanı və onun Azərbaycan dilində ifadə yolları // Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin Elmi Əsərləri, Dil və ədəbiyyat seriyası, 1977, № 2, s. 21-24.
90. Verdiyeva Z., Ağayeva F., Adilov M. Azərbaycan dilinin semasiologiyası. Bakı, Maarif, 1979.
91. Verdiyeva Z., Ağayeva F., Adilov M. Dilçilik problemləri, 1982.

**Rus dilində**

92. Абилов А.С. Причастные обороты в современном азербайджанском языке. Автореф. дисс. ... канд. филол. наук. Баку, 1962.
93. Авелиани С.Ш. Очерки философии естествознания. Тбилиси, 1968.
94. Агазаде Н. Г. Система глагольных наклонений в современном азербайджанском языке. Баку, 1967.
95. Адмони В.Г. Основы теории грамматики. М.; Л., 1964.

96. Адмони В.Г. Грамматический строй как система построения и общая теория грамматики. Л., 1988.
97. Алекперов А.К. Вступление по докладам о категории времени и наклонения // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 198-202.
98. Алекперов А.К. Лексическая семантика простых глаголов в современном азербайджанском языке. Баку, Элм, 1983.
99. Античные теории языка и стиля, М-Л, 1936.
100. Ардентов Б.П. Выражение времени в русском языке. Лекции по спецкурсу. Кишинев, 1975.
101. Аскин Я.Ф. Проблема времени. Ее философское истолкование, М., Мысл, 1966.
102. Аскарова А.Х. Семантические процессы в рамках лексико-семантического макрополя времени (на материале русского, английского и немецкого языков). Автореф. дисс. ... канд. филол. наук. Саратов, 1992.
103. Атаева А. Лексическая средства выражения времени в туркменском языке. Автореф. дисс. ... канд. филол. наук. Ашгабат, 1993.
104. Аугустынек З. Лейбницево определение времени // ВФ, 1973, № 5, с. 109-121
105. Ахманова О.С. Словарь лингвистических терминов. М., Советская энциклопедия, 1966.
106. Ахундов А.А. Категория времени глагола (на материале азерб. языка) Автореф. дисс. ... канд. филол. наук. Баку, 1958.
107. Ахундов А.А. Изявительное наклонения в азербайджанском языке (опыт структурного анализа) // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 131-137.

108. Ахундов М.Д. Пространство и время в физическом познании. - М.: Мысль, 1982.
109. Балясникова Л.А. Лексико-семантическое развитие слов с этимологическим корнем *доб-* (из истории корнеслова русского языка). Автореф. дисс. ... канд. филол. наук. Л., 1974.
110. Бархударов Л.С. Очерки по морфологии современного английского языка. М., 1975.
111. Бархударов Л.С., Штелинг Д.А. Грамматика английского языка. Изд. 4-е, исправленное, М., 1973.
112. Бенвенист Э. Общая лингвистика. М., Прогресс, 1974.
113. Большой англо-русский словарь (под общей ред. проф. Гальперина), В 2-х томах. Изд. третье , М., 1979.
114. Бондарко А.В. К проблематике функционально-семантических категорий // ВЯ, 1967, № 2, с. 75-83.
115. Бондарко А.В. О функционально-семантических категориях // Actes du X^e Congrès des linguistes, I / Ed. par A.Grant et al. Bucarest: Editions de l'Académie de la République Socialiste de Roumanie, 1969. P. 30-63.
116. Бондарко А.В. О функционально-семантических микрополях и граммемах в процессе речи // Русский язык за рубежом. 1969. № 2. С. 66-69.
117. Бондарко А.В. Грамматическая категория и контекст. Л., Наука, 1971.
118. Бондарко А.В. К теории поля в грамматике - залог и залоговость (на материале русского языка) // ВЯ. 1972. № 3, с. 20-35.
119. Бондарко А.В. Теория морфологических категорий. Л., Наука, 1976.
120. Бондарко А.В. Принципы функциональной грамматики и вопросы аспектологии. Л., 1983.

121. Бондарко А.В. О грамматике функционально-семантических полей // ИАН СССР, Сер. лит. и яз., 1984, Т.43, № 6, с.492- 503.
122. Бондарко А.В. Функциональная грамматика.Л., Наука, ЛО, 1984.
123. Бондарко А.В. К истолкованию понятия "функция" // Известия АН СССР. Серия литературы и языка. 1987. Т. 46. № 3. С. 195-207.
124. Бондарко А.В. Основы функциональной грамматики: Языковая интерпретация идеи времени. СПб.: Изд-во С.-Петербург. ун-та, 1999.
125. Будагова З.И. К вопросу о категории времени глагола в современном азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках, Баку, 1968, с. 16-26.
126. Василенко О.В. Функционирование наречий времени современного английского языка в текстах различных стилей. Автореф. дисс. ... канд. филол. наук. Киев, 1998.
127. Василйев Л.М. Теория семантических полей // Вопросы языкознания, М., 1971, № 5, с. 106-111
128. Веденькова М. С. Употребление временных форм глагола по коммуникативным регистрам (На материале немецкого языка). Киев, 1981.
129. Виноградов В.В. Основные вопросы синтаксиса предложения (на материале русского языка) // Виноградов В.В. Исследования по русской грамматике. М., 1975.
130. Виноградова Т. А. Синтаксические средства выражения темпоральных отношений в современном английском языке. Автореф. дисс. ... канд. филол. наук. М., 1982.

131. Волянская И.В. Лексико-семантические особенности существительных, обозначающих единицы измерения времени в английском и русском языках. Автореф. дисс. ... канд. филол. наук. М., 1973.
132. Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968.
133. Воронцова Г.Н. Очерки по грамматике английского языка. М., 1960.
134. Всеволодова М.В. Способы выражения временных отношений в современном русском языке.М., 1975.
135. Всеволодова М.В. Категория именной темпоральности и закономерности ее речевой реализации, Автореф. дисс. ... докт. филол. наук. М., 1982.
136. Гаджиева Т.А. Система форм прошедшего времени глагола в современном азербайджанском языке . Автореф. дисс. ... канд. филол. наук. М., 1958.
137. Гаджиева Т.А. Система форм прошедшего времени глагола в современном азербайджанском языке // Известия АН Азерб. ССР. Серия общест. наук, 1958, № 3, с. 73-90.
138. Георгиева-Кириленко М.Н. Темпоральная лексика в русском языке в сопоставлении с болгарским. Автореф. дисс. ... канд. филол. наук. Одесса, 1990.
139. Гийом Г. Принципы теоретической лингвистики. М., Прогресс, 1992.
140. Головаха Е.И., Кроник А.А. Понятие психологического времени //Категории материалистической диалектики в психологии. М., Наука, 1988, стр. 199-215.
141. Гончаров Е.Б. Время грамматическое и время философское. Киевский гос. пед. ин-т. иност. языков. Киев, 1986.
142. Грамматика русского языка. Том I, М., Изд-во АН СССР, 1952.

143. Грамматика современного русского литературного языка. М., 1970.
144. Гулыга Е.В., Шендельс Е.И. Грамматико-лексические поля в современном немецком языке. М., 1969.
145. Гусейнова Л. Система длительных времен глагола (на материале английского и азербайджанского языков). Баку, Нурлан, 2006.
146. Гухман М.М. Грамматическая категория и структура парадигм // Исследования по общей теории грамматики. М., 1968.
147. Демченко И.Г. Лексические уточнители временных отношений в современном немецком языке. Автореф. дисс. ... канд. филол. наук. М., 1973.
148. Дешериева Т. И. Лингвистический аспект категории времени в его отношении к физическому и философскому аспектам // Вопросы языкознания, 1975, №2, с. 111-117.
149. Джафаров С.А. О постановке вопроса наклонения глагола в азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках. Баку, 1968, с. 71-83.
150. Джумабайев К. Сложноподчиненные предложения с придадочными времени и причины в современном немецком языке и их соответствия в киргизском языке. Автореф. дисс. ... канд. филол. наук. Фрунзе, 1978.
151. Есперсен О. Философия Грамматики (Перевод с английского В.В.Пассека и С.П.Сафроновой. Под редакцией и с предисловием проф. Б.А.Ильиша) Издательство Иностранной Литературы Москва, 1958.
152. Жалейко Р.А. Перцептуальное время и его выражение в функционально-семантическом поле

темпоральности (на материале англ. языка). Автореф. дисс. ... канд. филол. наук. М., 1980.
153. Жеребков В.А. О грамматической категории времени // Филологические науки, 1972, № 2, с. 42-53.
154. Злотников Л.М. Хронометрия и ее место в системе наук // Солнечные часы и календарные системы народов СССР. Тематич. сб. науч. трудов. Л., АН СССР, 1985, с. 5-15.
155. Иванова И.П. Вид и время в современном английском языке. Л., 1961.
156. Иванова И.П., Бурлакова В.В., Почепцов Г.Г. Теоретическая грамматика современного английского языка. М., Высш. школа, 1981.
157. Ищук Д.Г. Лексико-семантическое поле как выражение концептуальной модели времени в языке. Дисс ... канд. филол. наук. СПб, 1995.
158. Караулов Ю.Н. Языковое время и языковое пространство (о понятии хроноглоссы) // Вестник Московского Университета, 1970, № 1, с.61-73.
159. Каращук В.А. Темпоральные прилагательные в современном русском языке. Автореф. дисс. ... канд. филол. наук. Ташкент, 1978.
160. Кацнельсон С.Д. Типология языка и речовое мышление. Л. , 1972.
161. Клименко А.П. Существительные со значением времени в русском языке. Автореф. дисс. ... канд. филол. наук. Минск, 1965.
162. Коклянова А.А. Категория времени в современном узбекском языке. М., 1963.
163. Корнеева В.А. Система временных значений в русском, французском и испанском языках (контрастив. анализ). Автореф. дисс. ... канд. филол. наук. М., 1980.

164. Кравченко А.В. Язык и восприятие. Когнитивные аспекты языковой категоризации. Иркутск, изд-во Иркутского Ун-та, 1996.
165. Ломтев Т.П. Предложение и его грамматические категории. М., МГУ, 1972.
166. Маковский М. М. Понятие лингвистического времени // Иностранные языки в школе, 1976, № 6, с. 3-12.
167. Маковский М.М. «Картина мира» и миры образов (Лингвокультурологические этюды) // Вопросы языкознания, М., 1992, № 6, с.36-53.
168. Мамедалиев В.М. Сравнительно- типологический анализ временных форм глагола в современном арабском и азербайджанском литературных языках. Автореф. дисс. ... канд. филол. наук. Тбилиси, 1968.
169. Мамедова А.Ш. Понятие времени и его выражения в азербайджанском языке синтаксическими единицами. Автореф. дисс. ... канд. филол. наук. Баку, 1990.
170. Марузо Ж. Словарь лингвистических терминов. М., 1960.
171. Машадиев К.И. Номинативное предложение в современном азербайджанском языке. Автореф. дисс. ... канд. филол. наук. Баку, 1974.
172. Мещанинов И.И. Соотношение логических и грамматических категории - В сб.: Язык и мышление. М., 1967. с. 21-32.
173. Мигирин В.Н. Язык как система категорий отображения. Кищинев, 1973.
174. Милейковская Г.М. О соотношении объективного и грамматического времени // Вопросы языкознания, 1956, № 5, с. 75-79

175. Морковкин В.В. Опыт идеографического описания лексики (Анализ слов со значением времени в русском языке). М., 1977.
176. Мостепаненко А.М. Проблемы универсальности основных свойств пространства и времени, Л., Наука, 1969.
177. Мостепаненко А.М., Мостепаненко М.В. Четырехмерность пространства и времени, М., Наука, 1966.
178. Мурьянов М.Ф. Время (понятие и слово) // Вопросы языкознания, 1978, № 2, с.52-66
179. Мусаев К.М. Грамматика караимского языка. М., 1964.
180. Мусаев М.М. Придаточные предложения времени и причастные и деепричастные обороты с временном значением в тюркских языках юго-западной группы. Автореф. дисс. ... канд. филол. наук. Баку, 1980.
181. Общее языкознание (Формы существования, функции, история языка). М., Наука, 1970
182. Панкрац Ю.Г. Глагол и особенности его категориальной семантики // Теория грамматики: лексико-грамматические классы и разряды слов. М., 1990, с. 51-73.
183. Панфилов В.З. Грамматика и логика. М.-Л., 1963.
184. Панфилов В.З. Философские проблемы языкознания. М., 1977.
185. Панфилов В.З. Гносеологические аспекты философских проблем языкознания. М., 1982.
186. Петрушинина О.В. К семантической характеристике наречий времени (по материалам словарей) // Материалы 8-й конференции по преп. рус.яз. пед. ин-тов, Вып. 2, ч.1, М., 1973 с. 85-89.
187. Пешковский А.М. Русский синтаксис в научном освещении. М., 1956.

188. Покровская Л.А. Грамматика гагаузского языка. М., 1964.
189. Потаенко Н.А. Время в языке, Пятигорск: ПГЛУ, 1996.
190. Потаенко Н.А. Категория времени и его выражение в лексико-семантической системе языка. Автореф. дисс. ... канд. филол. наук. М., 1981.
191. Потаенко Н.А. К языковому освоению временной структуры действительности // Вопросы языкознания, 1984, № 6, с.43-53.
192. Потаенко Н.А. Темпоральная лексика как объект лингвистического изучения // ИАН СССР, Сер. лит. и яз. 1979, Т. 38, № 3, с. 243-248.
193. Рагимов М.Ш. К вопросу о формировании категории наклонения и ее отношение к категории времени в азербайджанском языке // Вопросы категорий времени и наклонения глагола в тюркских языках, Баку, 1968, s. 117-130.
194. Резник И.В. Функционально-семантическое поле темпоральности: логико-семантическая категория и языковые средство ее выражения. Автореф. дисс. ... канд. филол. наук. М., 1988.
195. Рейхенбах Г. Философия пространства и времени: Пер. с англ./ Общ. ред. А.А.Логунова; М., Прогресс, 1985.
196. Рудометкина М. И. Слова категории времени (на материале английского языка). Автореф. дисс. ... канд. филол. наук. Киев, 1972.
197. Селиванова Е.Е. Футурум в английском языке: понятийная категория и ее языковая репрезентация // Грамматические средства выражения когнитивно-функциональной семантики. Вестник МГЛУ, Выпуск 460, М., 2001, с. 29-49.

198. Семергей Р.А. Лексические показатели времени в современном русском языке (наречие и наречные выражения). Автореф. дисс. ... канд. филол. наук. Л., 1983.
199. Слюсарева Н.А. Проблемы функциональной морфологии современного английского языка. М., 1986.
200. Смирницкий А.И. Морфология английского языка. М., 1956.
201. Степанов Ю.С. Имена, предикаты, предложения (семиологическая грамматика). М., Наука, 1981.
202. Сучкова П. А., Петраш Н. В. Темпоральные индефинитные синтагмы // Проблема синтаксиса словосочетания и предложения в современном английском языке. Пятигорск, 1987, с. 166-179.
203. Тарасова Е.В. Языковое поле как единица дидактической типологии, Учебн. пособие. Киев, 1991.
204. Тарасова Е.В. Языковые поле темпоральности в синхронии и диахронии. Автореф. дисс... докт. филол. наук. Краснодар, 1993.
205. Теория функциональной грамматики: Ввеведение. Аспектуальность. Временная локализованность. Таксис. Л., Наука, 1987.
206. Теория функциональной грамматики. Темпоральность. Модальность. Изд. Наука, Л., 1990.
207. Теория функциональной грамматики: Персональность. Залоговость. СПб, Наука, 1991.
208. Теория функциональной грамматики: Субъектность. Объектность. Коммуникативная перспектива высказывания. Определенность / неопределенность. СПб, Наука, 1992.
209. Теория функциональной грамматики: Качественность. Количественность. СПб., Наука, 1996.

210. Теория функциональной грамматики: Локативность. Бытийность. Посессивность. Обусловленность. СПб., Наука, 1996.
211. Тураева З. Я. Категория времени. Время грамматическое и время художественное (на материале англ. языка), М.,«Высшая школа», 1979.
212. Уитроу Дж. Естественная философия времени, М., 1964.
213. Урманцев Ю.А., Трусов Ю.П. О свойствах времени // Вопросы философии, 1962, № 1, с. 58-70.
214. Уфимцева А.А. Типы словесных знаков.М., 1974.
215. Филина К.В. Исследование презенса английского глагола. (В сопоставлении с презенсом рус. глагола): Автореф. дис. ... канд. филол. наук. М., 1975.
216. Филина К.В. Теоретическая грамматика английского языка. Новосибирск. 2006.
217. Филичева Н.И. Синтаксические поля. М., Высшая Школа, 1977.
218. Философский Енциклопедический Словарь, 1983.
219. Хасанов И. А. Феномен времени. Часть 1. Объективное время - М.: 1998.
220. Хощанов Б. Пространственные и временные отношения в разносистемных языка. Нукус: Билим, 1992.
221. Хлебникова И.Б. Сослагательное наклонение в современном английском языке. Л., 1959.
222. Шадманкулова Д. Х. Способы и средства выражения временных отношений в современном узбекском языке. Автореф. дисс. ... канд. филол. наук. Ташкент, 1990.
223. Шаповалова Т.Е. Категория синтаксического времени в руском языке. М. , МПУ, 2000.
224. Шведова Н.Ю. Синтаксическое время // Филологические Науки, 1978, № 3, с. 88-97.

225. Шепин А.Г. Лексико-грамматическое поле времени в современном русском языке (Время в поэтической речи). Иркутск, 1974.
226. Щербин В.К. Общее и специфическое в лексико-семантических системах близкородсвенных языков (На материалах русской и белорусской пространственной и временной лексики). Автореф. дисс. ... канд. филол. наук. Минск, 1983.
227. Щур Г.С. Теория поля в лингвистике. М., 1974.
228. Юрченко В.С. Реальное время и структура языка // Вопросы языкознания, М., 1993, № 3, с. 36-47.
229. Яковлев В.П. Социальное время. - Ростов-на-Дону: Изд РГУ, 1980.
230. Ярцева В.Н. Историческая морфология английского языка. – М.-Л., 1960.
231. Ярцева В.Н. Контрастивная граматика. М., 1982.

**İngilis dilində**

232. Cambridge Advanced Learner's Dictionary. Cambridge University Press, 2003. Version 1.0. COPIRIGHT © Software TEXTware A / S, Copenhagen, 2003, http: // www. textware. dk
233. Close R.A. A Reference Grammar for students of English. Moscow, 1979.
234. Declerck Renaat. Tense in English. Its structure and use in discourse. London and New York, 1991.
235. Fries Ch.C. The Structure of English. London, 1958.
236. Gordon E.M., Krylova I.P. A Grammar of Present-day English (Parts of Speech), 2nd ed., M., 1980.
237. Hornby A.S. Oxford Advanced Learner's Dictionary of Current English, Vol. I-II, 1982.

238. Ilysh B.A. The Structure of Modern English. Leningrad, 1971.
239. Joos M. The English verb. The University of Wisconsin, 1964.
240. Leech G. Towards a semantic description of English – Bloomington and London: Indiana University Press, 1970.
241. Leech G. Meaning and the English verb. London: Longman, 1975.
242. Lehrer A. Semantic Fields and Lexical Structure. Amst-Ind., 1974.
243. Lyonz J. Semantics. Cambridge: Cambridge University Press, 1977, Vol. I.
244. Merriam-Webster's Collegiate Dictionary, 10-th edition, Merriam - Webster, Incorporated Springfield, Massachusetts, U.S.A., 2000.
245. Nordlander Johan. Towards a Semantics of Linguistic Time. Exploring Some Basic Time Concepts with Special Reference to English and Krio, Umea University, 1997.
246. Palmer F.R. A linguistic study of the English verb. London, 1965.
247. Palmer F.R. The English Verb. London: Longman. 1974.
248. Quirk R., Greenbaum S., Leech G., Svartvik J. A University Grammar of English (ed. and abbrev. by I.P. Verkhovskaya), Moscow, "Vysšaja škola", 1982.
249. The American Heritage Dictionary of the English Language, William Morris, Editor, Published by American Heritage Publishing Co., Inc. and Haughton Mifflin Company, Boston.
250. The morphology of the English verb: Tense, aspect and taxis. M.: Изд-во Моск. ун-та, 1975.

251. The Oxford English Dictionary, Volume X1, T-U, Oxford, At the Clarendon Press.
252. Reichenbach H. The Direction of Time. Berkeley and Los Angeles,1956.
253. The Random House Dictionary of the English Language, The Unabridged Edition, Jess Stein, Editor in Chief, Random House / New York.
254. The Study of Time I B 1972; II. Heidelberg, 1975; III. N.Y., 1978.
255. Webster's New International Dictionary of the English Language, Second Edition, Unabridged, London: G. Bell & Sons, Ltd, Springfield, Mass.: G & C. Merriam Co. (1934), Volume II, Letters M-Z, with Appendices, (pp. 1473-3210)
256. Whitrow C.J. The Natural Philosophy of Time. London and Edinburgh, 1961.

### *İnternet mənbələri*

257. Андреева Н.В. Язык и время. Лексический аспект категории времени // Русская и сопоставительная филология: состояние и перспективы: Международная научная конференция, посвященная 200-летию Казанского университета (Казань, 4-6 октября 2004 г.): Труды и материалы: / Под общ. ред. К.Р.Галиуллина.Казань: Изд-во Казан. ун-та, 2004. С.257-258. – http://www.ksu.ru/f10/publications/2004 /articles.
258. Анисов А. М. Свойства времени – // http:/ /www. i-u.ru/ biblio/archive/anisov%5 svoistva/
259. Белякова С.М. Темпоральная лексика русских говоров как этнокультурный феномен – //http://www. utmn.ru/ frgf/No13 /text05.htm

260. Ершов Ю. А. Биологическое время и его моделирование в квазихимическом пространстве – //http://www. chronos.msu.ru/RREPORTS/
261. Карнаух В.К. Современная философия времени: основные тенденции – //http://www.humanities.edu.ru/db/ msg/7107
262. Лазарев С.С. Понятие "время" и геологическая летопись земной коры – // http://www.chronos.msu.ru/ RREPORTS/
263. Михайловский Г. Е. Биологическое время, его организация, иерархия и представление с помощью комплексныхвеличин – //http://www.chronos.msu.ru/ REPORTS/
264. Симаков К.В. Методологический аспект проблемы геологического времени – //http://www.chronos .msu.ru/ RREPORTS/
265. Топорова Т.В. Семантическая структура древнегерманской модели мира. М., Радикс, 1994, 190 с. – /http:// www.auditorium.ru/p/showindex.php?ShowIndex=455
266. Хасанов И.А. Физическое время – //http://www. chronos.msu.ru/RREPORTS/
267. Lolaev T. P. Time as a function of a biological system – //http://www.chronos. msu.ru/RREPORTS/
268. Muskens Reinhard. Categorial Grammar and Lexical-Functional Grammar – //http://csli-publications. stanford. edu/

**Anar** (Otel otağı (povest); Dantenin yubileyi; Gürcü familiyası; Mütləq görüşərik; Son ilin yazıları (1993-2003); Yaxşı padşahın nağılı; Taksi və Vaxt; Mən, sən, o və telefon; Qırmızı limuzin; Vahimə), **Ə.Cəfərzadə** (Bəla (povest); Xəzərin göz yaşları (povest); Xəyalim mənim (povest)), **Elçin** (Ayaqqabı; Aydınlıq gecələr; Baladadaşın ilk məhəbbəti; Bu dünyada qatarlar gedər; Beş qəpiklik motosikl ; Bülbülün nağılı; Gümüşü, narıncı, məxməri; Hönkürtü; İki çal papağın və bir qara kepkanın nağılı; Mənim ərim dəlidir; On ildən sonra; Qatar; Qış nağılı; Sari gəlin; Sari pencək; Şuşaya duman gəlib; Talvar; Taun yaşayır; Zireh; Ürəkdə bir şövq var idi), **İ.Şıxlı** (Dəli kür (roman); Namus qaçağı (povest); Ölən dünyam (roman); Namərd gülləsi; Ölüləri qəbiristanda basdırın (povest)), **İ. Əfəndiyev** (Xan qızı Gülsənubərlə Tarzən Sadıqcanın Nağılı), **İ.Hüseynov** (Faciə; Saz), **C.Cabbarlı** (Dilara; Papaq), **Ə. Əylisli** (Ürək Yaman şeydir; Ceviz Kölgəsinin Nağılı), **M.F. Axundov** (Sərgüzəşti-mərdi-xəsis; Hekayəti-molla İbrahimxəlil kimyagər; Hekayəti-müsyö Jordan həkimi-nəbatat və dərviş Məstəli şah caduküni-məşhur; Sər-güzəşti-Vəziri-xani-Lənkəran), **R.İbrahimbəyov** (Nəğmə Dərsi), **S.Rüstəmxanlı** (Xətai Yurdu), **S.Səxavət** (Palıd toxumu), **S.Əhmədli** (Qanköçürmə stansiyası; Ömür Urası; Axirət Sevdası), **Y.Səmədoğlu** (Güllər), **K.Abdulla** (Bir, iki – bizimki), **A.Quliyev (**Köpək balıqları (povest))

**Mənbə:** http://www.azeri.org;
http://www.anar.com;
http://www.elchin.com

